# Sələfin imana dair etiqadı

## onun əməl ilə bağlılığı və müasir şübhələrin ifşası

müəllif

**Muhəmməd bin Mahmud Ali Xudeyr**

I hissə

Kitaba müqəddimə yazanlar

**Şeyx Abdullah bin Abdil-Aziz ibn Aqil**

**Şeyx Ulvi bin Abdil-Qadir əs-Səqqaf**

**Şeyx Abdul-Aziz bin Muhəmməd Ali Abdil-Lətif**

**Şeyx Abdur-Rahmən bin Saleh Ali Mahmud**

Sələfin imana dair etiqadı

# Sələfin imana dair etiqadı

## onun əməl ilə bağlılığı

## və müasir şübhələrin ifşası

**Müəllif:**

**Muhəmməd bin Mahmud Ali Xudeyr**

Kitabı gözdən keçirib ona təqdimat verən fəzilətli şeyxlər

Şeyx Abdullah bin Abdul-Aziz bin Aqil
Yüksək qazilik məclisində daimi təşkilatın sabiq başçısı

Şeyx Abdur-Rahmən bin Salih Ali Mahmud
İmam Muhamməd bin Saud universitetinin tədris şöbəsinin üzvü

Şeyx Abdul-Aziz bin Muhəmməd Ali Abdul-Lətif
İmam Muhamməd bin Saud universitetinin tədris şöbəsinin üzvü

Şeyx Ulvi bin Abdul-Qadir əs-Səqqaf
əd-Durar əs-Səniyyə saytının rəhbəri

## BİRİNCİ HİSSƏ

kitab ərəb dilindən tərcümə edilmişdir

# Müqəddimə

## Fəzilət sahibi şeyx Abdullah bin Abdul-Əziz bin Aqil

Həmd yalnız Allahadır.Onun qulu və elçisi, Peyğəmbərimiz Muhammədə, onun ailəsinə və əshabına Allahın salavatı və salamı olsun.

Artıq mən fəzilət sahibi şeyx Muhamməd bin Mahmud əl-Xudeyr qardaşın müəllifi olduğu "əl-imənu ində-s-sələf va aləqatuhu bil aməl va kəşfu şubuhati-l-muasırin" adlı kitabı ilə tanış olub orada olan məsələləri və bu böyük məsələyə dair, iman məsələsinə və onunla əlaqəli olan, habelə ona yaxud onun kamilliyinə zidd gələn şeylərə dair vurğuladığı çox dəyərli araşdırmaları nəzərdən keçirtdim. Demək istərdim ki, şeyx bu kitabda həmin bu önəmli mövzuda tələb olunan bütün məqamlara dolğun surətdə toxunmuş və kitabının müqəddiməsində bu araşdırmaya yaxud onun hissələrinə daxil olan məsələlərə gətirilən şübhələrə rəddiyə vermək sözünü vəd verdiyi kimi yerinə yetirmişdir.Bütün bunlarla bərabər həmin kitab irca və onun məsələlərinə dair çox dəqiq araşdırmaları özündə şamil edir. Həmçinin həmin kitab gözəl ifadələr, incə məqamlar, münaqişədə yer alan ədəb və hikmətli rəddiyə vermək üslubu ilə seçilir.Günümüzdə yayılan bəzi şübhələrin çoxluğunu nəzərə alsaq belə bir kitabın işıq üzü görməsiməniçox sevindirir.Bu səbəbdən,Uca Allahın bu

kitabı faydalı etməsi arzusu ilə həmin kitabın çap edilib yayılmasını tövsiyyə etdim.

Yazdı:

Allahın möhtac qulu

**Abdullah ibn Abdul-Aziz ibn Aqil**

Yüksək qazilik məclisində daimi təşkilatın sabiq başçısı

# Müqəddimə

## Abdur-Rahmən bin Salih əl-Mahmud

Aləmlərin Rəbbi olan Allaha həmd olsun! Allahın salavatı və salamı peyğəmbərlərin ən şərəflisi Peyğəmbərimiz Muhamməddin, onun ailəsinin və bütün əshabının üzərinə olsun.

Hələ də, iman məsələləri, habelə onun əsasları və onun zəruri amilləri mövzusu çəkişmə doğuran mövzulardan biri olaraq qalmaqdadır.Sələf imamlarının bu məsələni müxtəlif yerlərdə bəyan edib şərh etmələrinə rəğmən iman məsələlərində və qeyrisində baş vermiş parçalanmanın başlanğıcı əsnasında onların qarşılaşdıqları anlaşılmazlıq yenidən təkrarlanır.Bununla ən xeyirli, ədalətli və doğru olan orta yoldan ifrat və etinasızlıq kimi iki aşırıya varmış yola meyl edilməsi qəsd edilir.

Artıq mən iman məsələsi haqqında bəhs edənvə fəzilətli qardaş Muhamməd bin Mahmud Ali Xudeyr tərəfindən təlif edilən “əl-imənu ində-s-sələf va aləqatuhu bil aməl va kəşfu şubuhati-l-muasırin”kitabı ilə tanış olmuşam.Həmin kitab bir neçə fərqli xüsusiyyətlərə malikdir.Onlardan ən önəmlisi:

1-Sələfin iman anlamına dair təməlinin müəyyən edilməsi, habelə onların buna dair dedikləri sözlərinin və bu şərəfli və böyük məsələyə dair bidət əhlinin əsaslarının və onların sözlərinin vurğulanması.

2-Müəllifin, murciələrin sözlərindən təsirlənib həmin sözləri müdafiə edən bəzi müasirlərin şübhələrini ifşa etməsi. Müəllif-Allah onu müvəffəq etsin-həmin şübhələri dərin araşdırmaq, onu əmanət olaraq nəql etmək və ona elm, təhqiq və dəlillər ilə cavab vermək kimi işlərdə çox istəkli olmuşdur. Müəllif uzun illərdən bəri həmin məsələni araşdırmaqla məşqul olmuşdur.

3-Müəllif qədim və müasir vaxtlarda yaşamış sələf imamlarının sözlərini, cavablarını və fətvalarını nəql etməkdə çox istəkli görünür.Elm tələbəsinin alimlərə ehtiram etməsi, onlara sayğı göstərməsi, onların fəzilətini bilməsi tələb olunan işdir.

4-Müəllifin qarşı tərəflə və müxalif olanlarla insaf və ədalətlə davranması və hamı ilə ədəbini gözləməsi.Bu isə kitabı oxuyan hər bir şəxsə bəlli olacaq.

Bu müqəddimənin sonunda iki ismarış göndərmək istərdim:

Birinci: Bu kitabın müəllifi kitabın müqəddiməsində xəvariclərdən olan ifrat əhli və onlardan qədim və son zamanlarda təsirlənmiş şəxslər ilə münaqişə edib onların şübhələrini ifşa etməsi və onlara rəddiyə verməsi haqqında verdiyi vədini yerinə yetirməli və bizə bunu ithaf etməlidir.

İkinci: Bu mövzuya baş vurub murciələrin şübhələrindən təsirlənmiş şəxslərin Uca Allahdan qorxub, sələfdən olan imamların kitabları ilə birgə bu kimi kitabları oxumaları gərəkdir. Onlardan haqqı axtarmaq, təhqiq əhlindən olan alimlərin yolunu tutub getmək və ağır bir

dərd olan nəfsi istəklərdən uzaq durmaq tələb olunur.Uca Allahdan bizi və onları hifz etməsini diləyirəm.

Habelə Uca Allahdan bu kitabın müəllifinə bol mükafatını verməsini, bizi və onu haqqa və doğru olana müvəffəq etməsini və bizi əcr və savabdan məhrum etməməsini diləyirəm.

Allahın salavatı və salamı Peyğəmbərimiz Muhamməlin, onun ailəsinin və əshabının üzərinə olsun.

Yazdı:

**Abdur-Rahmən Salih əl-Mahmud**

İmam Muhamməd bin Saud universitetinin tədris şöbəsinin üzvü

# Müqəddimə

## Abdul-Əziz bin Muhamməd Ali Abdul-Lətif

Aləmlərin Rəbbi olan Allaha həmd olsun.Allahın salavatı və salamı peyğəmbərlərin və elçilərin sonuncusu olan Muhamməmədin, onun ailəsinin və bütün əshabının üzərinə olsun.

Artıq mən qardaşımız şeyx Muhaməd bin Mahmud Ali Xudeyrin təlif etdiyi“əl-imənu ində-s-sələf va aləqatuhu bil aməl va kəşfu şubuhati-l-muasırin” adlı kitabını oxudum və onun çox faydalı və dəyərli bir kitab olduğunu gördüm. Həmin kitab iman məsələlərini tədqiq etmək, bu mövzu ilə bağlı olan bütün məsələri əhatə etməklə seçilir.Üstəlik həmin kitab güclü dəlillər, aydın ifadələr, gözəl tərtibatla seçilir. Əlavə olaraq bu kitab rəddiyə və münaqişədə insaf və ədəb qaydalarını qoruyur.

Allah şeyx Muhaməd bin Mahmud Ali Xudeyr qardaşa təlif etdiyi bu kitaba görə xeyirli mükafatını versin, onun kitabını faydalı etsin və kitabın müəllifini harada olmasından asılı olmayaraq mübarək etsin! Vallahul mustəan.Allahın salavatı və salamı Peyğəmbərimiz Muhamməmədin, onun ailəsinin və əshabının üzərinə olsun.

Yazdı:

Abdul-Aziz bin Muhamməd Ali Abdul-Lətif

# Müqəddimə

## Şeyx Ulvi bin Abdul-Qadir əs-Səqqaf

Aləmlərin Rəbbi olan Allaha həmd olsun.Allahın salavatı və salamı elçilər və peyğəmbərlərin sonuncusu olan Muhammədin, onun ailəsinin və bütün əshabının üzərinə olsun.

Həqiqətən də, iman və küfr məsələləri sələfin böyük önəm ayırdıqları, təməlini və qaydalarını qoyduqları, habelə ona dair kitablar təlif edib müxaliflərin şübhələrini insaflı insan üçün kifayət edəcək surətdə rədd etdikləri məsələlərdən biridir. Lakin xəvaric və murciələrin bidətləri zühur etdiyi və yaşadığımız dönəmdə yenidən baş qaldırmağa başladığı zaman Əhli sunnənin aslanları həmin şübhələri rədd etməyə, ələxsus insanlar içində geniş yayılıb rəğbətlə qarşılanan irca bidətini rədd etməyə girişmişlər. Fətvalar dalınca fətvalar, kitablar dalınca kitablar çıxıb həmin məsələnin təməl qaydalarını yenidən bəyan edib onların şübhələrini rədd etməyə və əsassız olduğunu sübut etməyə yönəlmişdir.Belə ki, imam Abdul-Əziz bin Bəzin rəhbərliyi altında çalışan daimi komitə buna dair bir sıra fətvalar çıxarmışdır.Həmçinin son zamanlarda bu məsələyə dair bir sıra kitablar işıq üzü görmüşdür.Bunlardan: "məsəilu fil imən" şeyx Salih əl-Fəuzan, "cəvəb fil imən va nəvaqidih" şeyx Abdur-Rahmən əl-Bərrak, "əsilətun və əcvibətun fil imən val kufr" şeyx Adil əş-Şeyxani, "haqiqətul imən va bidəul irca fil qadim val hadis" şeyx

Sa`d əş-Şisri, "bəraətu əhlil hadis va-s-sunnə min bidətil murciə" şeyx Muhamməd əl-Kuseyri və digər kitablar.

Nəhayət qardaşımız şeyx Muhamməd bin Mahmud Ali Xudeyrin təlif etdiyi "əl-imənu ində-s-sələf va aləqatuhu bil aməl va kəşfu şubuhati-l-muasırin" kitabı həmin kitablara sanki son bir nöqtə qoymuşdur.Şeyx həmin kitabı çox gözəl və faydalı edib müasir murciələrin xüsusiyyətləri və onların sözləri haqqında geniş söz açmışdır.Habelə müəllif zahir ilə daxil arasında olan bağlılıq "tələzum" məsələsinə dair dəlillər və alimlərin sözlərini geniş qeyd edib digər kitablarda bir arada olacağını zənn etmədiyim şəkildə bədən əməllərinin İslamda olan yerini bəyan etməkdə elm əhlindən çoxlu nəqllər gətirmişdir.Müasir şübhələrə gəldikdə isə, göründüyü kimi həmin kitabın təlif edilmə səbəblərində biri də məhz budur.Belə ki, müəllif-Allah onu xeyirlə mükafatlandırsın- həmin şübhələrin araşdırılması, tədqiq edilməsi və ifşa edilməsi, habelə həmin şübhələrin rədd edilməsi yolunda böyük səylər göstərmişdir. Yazarlardan kiminsə ondan öncə bu məsələyə dair bu cür əhatəli və hərtərəfli təlif ortaya qoyduğunu görməmişəm.

Müəllif bütün bunlara dair geniş söz açıb dəlilləri qeyd etmək, məsələləri dərindən araşdırmaq, elm əhlinin sözlərini nəql edib nəqlləri sahiblərinə isbat etmək və müxaliflər ilə heç kimin adını çəkmədən ədəb və ehtiramla münaqişə etməklə seçilmişdir.

İzzət və Cəlal sahibi olan Allahdan bu kitabı faydalı etməsini, müəllifi xeyirlə mükafatlandırmasını və bizi və

bizim qardaşlarımızı gözəl şəkildə haqqa qaytarmasını diləyirəm.

Allahın salavatı və salamı Peyğəmbərimiz Muhammədin, onun ailəsinin və əshabının üzərinə olsun.

Yazdı:

**Ulvi bin Abdul-Qadir əs-Səqqaf**

əd-Durar əs-Səniyyə saytının rəhbəri

# Ön söz

Ən kamil həmd Allaha məxsusdur.Ona həmd edir, Ondan kömək istəyir, Ondan bağışlanma diləyir, nəfslərimizin şərindən və əməllərimizin pisliyindən Allaha sığınırıq.Allahın doğru yola müvəffəq etdiyi şəxsi heç kəs azdıra bilməz, Onun azdırdığını isə heç kəs doğru yola gətirə bilməz.

Şahidlik edirəm ki, Allahdan başqa haqq məbud yoxdur və O, tək və şəriksizdir və şahidlik edirəm ki, Muhamməd Onun qulu və elçisidir.

*“Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!”* (Ali İmran:102)

*“Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın (törədib yer üzünə) yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir.”* (ən-Nisa:1)

*“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar.”* (əl-Əhzab:70-71)

Daha sonra bilin ki, ən doğru söz Allahın kitabı, ən gözəl yol isə Muhammədin (salləllahu aleyhi və səlləm) yoludur.

İşlərin ən şərlisi isə (dində olan) yeniliklərdir.Hər bir yenilik isə bidət, hər bidət zəlalət, hər zəlalət isə oddadır.

Uca Allah nazil etdiyi kitabını nur, doğru yol və hər bir şeyi bəyan edən olaraq nazil etmiş Peyğəmbərini isə doğru yola bələdçilik edən, müjdələyən və qorxudan olaraq göndərmişdir.Peyğəmbər (salləllahu aleyhi və sələm) isə öz növbəsində ümmətə onların bilməyə zərurət duyduqları dinin əsasları və şaxələrini bəyan etmişdir.Onun bəyan etdiyi ən əzəmətli işlərdən biri də iman və küfrün, habelə tövhid və şirkin və ixlas və nifaqın gerçəyi olmuşdur. Quran və sunnədə varid olan ləfzlər bu məsələləri ən dolğun, dəqiq və faydalı şəkildə bəyan etmişdir.Həmin mənbələrdə varid olan açıqlamalardan sonra artıq bu məsələlərə ərəb dilində varid olan kəlmələrin quruluşunu, ərəblərin istifadə qaydalarını və digər şeyləri dəlil gətirməyə heç bir lüzum qalmır.Bu səbəbdən varid olan həmin adların həqiqi anlamına dair Allahın və Peyğəmbərin bəyanına qayıtmaq vacib olur.Şübhəsiz ki, onların bəyanı dolğun və yetərlidir."[1]

Artıq səhabələr Quranın bəyan etdiyi və sunnənin izah etdiyi yol üzərində olmuşlar.Bunun buraxdığı izlərdən biridə onların imanın söz və əməl olduğuna, habelə onun artıb azaldığına icma etmələri olmuşdur.Uca Allah da onları bidətə düşməkdən qorumuş, sunnədən kənar çıxmaqdan hifz etmişdir.

Sonralar xəvaric firqəsi peydə olub Quran və sunnənin dəlalət etdiyi mənalardan üz çevirmiş və adı çəkilən

[1]əl-İmənu-l-kəbir, məcmu`əl-fətəva:7/286.

mənbələri anlamaqda ümmətin ən xeyirli toplumunun fəhmini tərk etmişdir.Onlar təhdid nasslarının zahirini qəbul etməkdə aşırıya varıb böyük günah sahiblərini təkfir etmiş və imanın artıb azaldığını inkar etmişlər.Onlar iddia etmişlər ki, iman bir şeydir və onun bir hissəsi gedəcəyi zaman o, bütövlüklə yox olacaq.

Daha sonra onlara tam əks tərəfdə gələn murciələr gəlmişlər.Onlar müjdə məzmunlu nassları qəbul etməkdə aşırıya varıb əməli iman anlamından çıxarmışlar.Onlara görə yer üzünün ən fasiq və günahkar insanı: Mənim imanın Cəbrayıl və Mukayılın imanı kimidir,-deyə bilər.

Sələf isə öz növbəsində onlara çox sərt münasibət bildirmişlər.Belə ki, İbrahim ən-Nəxai (rahiməhullah) demişdir: "Onların, yəni murciələrin fitnəsi bu ümmət üçün Əzəriqanın fintəsindən daha qorxuludur." Habelə əz-Zuhri (rahiməhullah) demişdir: "İslamda onun əhlinə ircadan daha zərərli bidət ixtira edilməmişdir." Habelə əl-Əuzai (rahiməhullah) demişdir: "Yahyə bin Əbu Kəsir və Qatədə demişlər: "Onlara görə (yəni səhabələrə görə) bidətlərdən heç bir şey ümmətə ircadan daha qorxulu deyil." Habelə Şərik əl-Qadı murciələri qeyd edib demişdir: Onlar ən çirkin tayfadır. Çirkinlikdə rafizilər kifayət edər, lakin murciələr Allahın adından yalan danışırlar." Habelə Sufyan əs-Səuri (rahiməhullah) demişdir: "Murciələr İslamı ən nazik paltardan daha incə buraxmışlar."[2]

[2] Məcmu` əl-fətəva:7/394.

Murciələrin içində abid və zahid insanların olmasına və ilk vaxtlarda ixtilafın ləfzi ixtilafa aid edilməsinə baxmayaraq doğru olan Quran və sunnəyə uyğun gələn ləfzlərdir.Heç kim Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözünə müxalif söz demək haqqına malik deyil. Xüsusən də, qeyd etmək lazımdır ki, nəticədə bütün bunlar irca əhli və qeyrilərindən olan kəlam əhlinin bidətlərinə və günahların çoxalmasına səbəb olmuşdur.Ləfzdə olan bu xırda xəta etiqad və əməllərdə böyük yanlışlığa səbəb olmuşdur.Məhz bu səbəbdən irca fikrinin pislənməsinə böyük diqqət ayrılmışdır."[3]

O vaxtdan bəri insanlar imanın anlamı və gerçəyinə dair üç görüşə ayrılmışlar:

1-Müsəlmanları təkfir edən, onların qanı və malını halal edən xəvariclərin görüşü.Bu isə aşırı və ifratın son həddidir.

2-Əməli iman anlamından çıxaran murciə, cəhmiyyə və onlara müvafiq gələnlərin görüşü.Onların çoxu küfrün danma, təkzib etmə, inadkarlıq və təkəbbürlük etibarı ilə yalnız qəlb ilə olduğunu iddia etmişdir.Bu isə etinasızlığın son həddidir.

3-Bu iki tərəf arasında orta yol, iki batil arasında haqq və iki zəlalət arasında doğru yol olan Əhli sunnənin görüşüdür. Bunlar deyirlər: İman söz və əməldir, habelə o, artıb azalır. Habelə bir insanda iman və küfrün, sunnə və bidətin, itaət və asiliyin bir arada cəmləşməsi mümkündür.Əhli sunnə azmış xəvariclər kimi günah sahiblərini təkfir etmir, eyni

[3] Məcmu`əl-fətəva:7/394.

zamanda murciələr etdiyi kimi günahkar və asilərə mütləq (kamil) iman adını vermirlər.Habelə onlar cəhmilərin dediyi kimi küfrü təkzib etmə və danma çərçivəsinə salmırlar.Onlar demişlər: İman söz, əməl və etiqad olduğu kimi həmçinin küfr söz, əməl, etiqad və tərk etmə ilə olur.

Artıq imamlar həmin sünni, sələfi etiqadı bəyan etmək üçün bir sıra təliflər yazmışlar.Həmin yazılardan misal olaraq, ibn Əbu Şeybənin "əl-imən", Əbu Ubeyd əl-Qasim bin Səlləmin "əl-imən", ibn Mandəhin "əl-imən", əl-Mərvəzinin "tə`zımu qadri-s-saləh" kitablarını göstərmək olar.Bundan əlavə Abdullah bin Əhməd "əs-sunnə", əl-Xalləl "əs-sunnə" və digər kitablarda olduğu kimi həmin məsələ qələmə alınan təliflərin sunnə və etiqad bölümlərinə daxil edilmişdir.

Habelə Şeyxul-İslam ibn Teymiyyə bu mövzuya dair iki kitab, "əl-imən" və "əl-imənul əusat" kitablarını təlif etmişdir. Həmin iki kitab bu mövzuya dair yazılan ən yaxşı və dolğun kitablardır.

Bir sözlə həmin mövzunun əhəmiyyəti və onda baş verən ixtilafın və qarışıqlığın çoxluğu səbəbilə sələf bu böyük məsələni yazmağa xüsusi diqqət ayırmışlar.Lakin həmin məsələni oxucuya yaxın edib asanlaşdırmaq, habelə bidət məzhəblərin tərəqqisini və bir mərhələdən digər mərhələyə keçidini ayaq ba ayaq izləyən yeni şübhələri ifşa etmək məqsədilə bu mövzuya dair müasir bir təlifin ortaya gətirilməsi zərurəti yaranmışdır.

## *Bidətlərin tərəqqisi*:

Beləliklə, xəvariclər otuza yaxın firqəyə, murciələr isə on iki firqəyə ayrılmışlar.Bunu əl-Əşari və məzhəblər barədə yazan digər şəxslər qeyd etmişlər.[4] Batil üzərində olanlar və əlɘxsus qədim və son zamanlarda olan bidət əhli daimə təfriqəçilik, dəstələrə bölünmə, ixtilaf və qarışıqlıq içində olurlar. Onlar Qurana müxalif, Qurana dair ixtilaf içindədirlər.

Burada vurğulamaq istərdim ki, xəvariclərin bidəti, qədim zamanlardan bəri onların etiqadı olaraq bilinən böyük günah sahibini təkfir etmək, habelə imanın artıb azalmasını inkar etmək kimi hədd üzərində dayanmamışdır. Yuxarıda qeyd edilənə əlavə olaraq onların daha aşırıya varmış və daha zəlalətli digər bidətləri üzə çıxmışdır. Həmin bidətlərdən: Ümumilik prizmasından irəli gələrək təkfir etmək, İslamı və məzhəbə mənsubiyyəti sabit olan şəxslər istisna insanlarda əsasın küfr olduğunu hesab etmək , habelə “kafiri təkfir etməyən kafirdir” qaydasını doğru anlamamaq və nəticə etibarı ilə “silsiləvi təkfir” adlanan bəlaya düşmək.Bütün bunların nəticəsində təhlükə böyümüş, şərr artmış və məhz bundan ötrü qanlar və mallar halal edilmiş və bu əzəmətli məsələyə dair cahillər və elmdə möhkəm olmayan insanlar danışmışlar.

Təəssüf doğuran amillərdən biri də, böyük ehtiyac olduğuna rəğmən həmin yaramaz yolun hələ də, tələb

[4] Məqalətul islamiyyin: 1/174-211, 1/213-223.ət-Tənbih və-r-radd, liəbil Hüseyn əl-Məlti: 178-180,148-156-cı səh.

olunan surətdə rədd edilməməsi, habelə ifşa edilib bəyan edilməməsidir.Mən həmin bu araşdırmada onların şübhələrini araşdırıb sözlərini nəzərdən keçirtmək əzminə düşsəm belə mənə bunu gerçəkləşdirməyə iki amil mane olmuşdur:

1-Belə ki, mənə onların yeni şübhələri ilə tanış olmaq müyəssər olmadı və mən buna lazım olan vaxt ayıra bilmədim.Həmin tayfanın bütün sözlərini nəzərdən keçirib onların müasir şübhələrini tədqiq etmədən həmin mövzuya dair hər hansı bir yazı yazmağı faydasız görürəm.

2-Xəvariclərə və onların şübhələrinə dair sözləri əlavə etməyin kitabın həcmini artıracağını gördüm.Bu isə oxucuya həmin kitabdan faydalanmağa mane ola bilər.

Bu səbəbdən, bu önəmli mövzuya dair  yazını müəyyən müddətə qədər təxirə salmağı məqsədəuyğun gördüm.

Əgər xəvariclərin bidəti qeyd etdiyim dərəcəyə qədər tərəqqi etmişdirsə, murciələr heç də bu dəyişiklik və tərəqqidən geri qalmamışlar.Xüsusən də bu, görüşlərin birində Əşarinin və onun qədim əshabının Cəhmin sözünü müdafiə etməsindən və onun məzhəbi ilə Əhli sunnənin məzhəbi arasında vəhdət yaratmaq cəhdlərindən sonra baş vermişdir.Bunun nəticəsində, əməlin imandan çıxarılması, habelə küfrü təkzib etmə, danma və buna dəlalət edən amillər çərçivəsinə salınması, bununla bərabər imanın artıb azalması və imanda istisna edilməsi kimi məsələlərə dair fikir ortaya çıxmışdır.

Həmin məsləkdə yer alan böyük təzadlı fikirlər təəccüb doğurursa, bundan daha da təəccüblü, yaşadığımız dönəmdə özlərini sunnə və hədisə nisbət edən bir toplum insanın irca fikrinə tutulmasıdır.Hətta onlardan bəzisi küfrün yalnız təkzib etmə və danma ilə olacağını iddia edib sözlər və əməllərdən hər hansı bir şeyin özlüyündə küfr olduğunu inkar etmişlər. Digərləri isə əməlin imanın dayağı deyil kamilliyi olduğunu və bütövlüklə əməli tərk edənin Allahın istəyi altında olan müsəlman olduğunu iddia etmiş, habelə fərz və nafilə olaraq əməlin bədəndə üzə çıxmayacağı halda belə imanın qəlb sözü və əməli olaraq qəlbdə olacağını mümkün saymışlar.Bütün bunlara rəğmən həmin şəxslər imanın söz və əməl, habelə artıb azaldığını deyirlər.

Həmin şəxslər sunnəyə və onun əhlinə ən yaxın insanlar olduqları səbəbilə onların üzündən fitnə böyümüş, ixtilaf və çəkişmələr çoxalmış, bir qism insan həmin şəxslərin haqq üzərində olduqlarını və kimliyindən asılı olmayaraq onlara müxalif gələnlərin xəvaric və mötəzililərin yolunda olduqlarını düşünməyə başlamışlar.

Üstəlik belə insanlardan bəziləri bunu açıq söyləyib bütövlüklə əməli tərk edəni təkfir edənlər üçün belə demişdir: "Əslində bununla onlar, hiss etsələr də hiss etməsələr də xəvaric və mötəzililərin məzhəbini gerçəkləşdirmiş olurlar."[5]

---

[5] Şərhu əlfəzı-s-sələf fil imən:344-cü səh.Artıq möhtərəm şeyx Abdul-Əziz bin Bazın rəhbərliyi altında olan daimi komitə həmin müəllifin "dabtu-d-davabit fil imən va nəvaqidih" adlı kitabından çəkindirmişdir.

Bir sözlə artıq murciəlik, əməli imandan çıxartmaq, imanın artıb azalmasını inkar etmək və imanda istisna etmək kimi sələfin dönəmində olduğu surətdə deyil.Hətta sələfdən məşhur olan sözlərin birində deyilir ki, əgər biri sadalanan şeylərin əksini deyərsə murciəlikdən uzaqlaşmış olar.Ancaq bu şəxs həmin iki təzadlı sözü bir arada cəmləşdirib: İman söz və əməldir,-demiş və bunun ardından: Lakin əməl olmadan iman sabit və səhih ola bilər,-deyə söyləmişdir.

*Bu zəlalətin ortaya çıxmasına iki amil səbəb olmuşdur:*

*Birinci*: Əhli sunnənin əqidəsindən bixəbər olmaq, onu etibarlı alimlərdən almamaq və əşarilərin öz şərhləri və təliflərində yazdıqlarına aldanmaq.İş o yerə çatmışdır ki, bəzi elm tələbələri iblis və fironun Allahı təsdiq edib etmədiklərinə dair, habelə daxili imanın zahiri əməli gərəkli edib etmədiyinə dair çəkişmə aparmışlar.Məsələ Şeyxul-İslamın qeyd etdiyi kimidir: “Sonrakıların bir çoxu sələfin məzhəbi ilə murciə və cəhmilərin sözlərini ayırd edə bilmirlər.Buna səbəb, iman məsələsinə dair daxilən cəhmilər və murciələrin görüşündə olan bir çoxlarının sözlərində bir sözü digəri ilə qarışıq salmalarıdır.Həmin şəxs sələfi və hədis əhlini yüksək tutur və düşünür ki, o onların sözlərini bir yerə toplayır yaxud özü kimilərin sözləri ilə sələfin sözləri arasında cəm edir.”[6]

Habelə murciə və cəhmilərin iman və küfr mövzusuna dair əqidəsindən bilgisizlik bəzi insanları murciələrin qəlb

[6] Məcmu`əl-fətəva:7/394.

əməlini isbat etmədiklərini iddia etməyə sövq etmişdir. Həmin şəxslər düşünmüşlər ki, əgər insan imanda qəlb əməlini isbat edərsə murciəlikdən qurtulmuş olacaq. Onlardan bir qismi isə murciələrə nisbət edilən məşhur sözə, "küfr ilə birgə itaət fayda vermədiyi kimi iman ilə birgə günah zərər verməz" sözünə etimad göstərirlər.Onların hüzurunda irca qeyd edildiyi zaman onlara görə irca məhz budur.Əslində isə Şeyxul-İslamın dediyi kimi bu sözü deyən ümumiyyətlə məlum deyil.

*İkinci*: Yaramaz təəssübkeşlik, haqqa qayıtmağa təkəbbürlük və bəzi alimlərin və elm tələbələrinin xətalarından kor-koranə yapışıb həmin xətaları müdafiə etmək.Hətta sən vaxt aşırı bəzi insanların müxtəlif təliflər yazıb həmin görüşü müdafiə etdiyini və bacardığı şübhələri gətirdiyini görə bilərsən.

Şeyx Salih əl-Fəuzan (hafizahullah) həmin bu yeni firqəyə toxunub onların zəlalətinin səbəbini növbəti sözlərlə bəyan etmişdir: "Murciələr dörd firqədən ibarətdir:

***Birinci firqə***: Ğulatul murciə (aşırıya varmış murciələr). Bunlar imanın adicə bilik olduğunu deyən cəhmilərdir.

*İkinci firqə*: Bunlar, dil ilə söz olmayacağı təqdirdə belə imanın yalnız qəlb təsdiqi olduğunu deyən əşarilərdir.

***Üçüncü firqə***: Qəlb etiqadı olmayacağı təqdirdə belə imanın dil ilə söz olduğunu deyən kərramilərdir.

*Dördüncü firqə*: İmanın dil ilə söz və qəlb ilə əməl olduğunu və əməllərin imanın gerçəyinə daxil olmadığını deyən fəqih murciələrdir.

Həmçinin yaşadığımız dönəmdə peydə olmuş beşinci firqə vardır.Onlar əməllərin imanın vacib kamilliyi üçün şərt olduğunu yaxud müstəhəb kamilliyi olduğunu demişlər."[7]

Habelə şeyx murciələrin küfrə dair məzhəbini qeyd edib demişdir: "Onlara görə küfr təkzib etmədir.İnsan Allahın rübubiyyətini yaxud risaləti təkzib edəcəyi zaman kafir olur. Həmçinin onlara görə iman sadəcə təsdiq etmədir.Əməllər isə imanın gerçəyinə daxil deyil.Belə ki, əgər bir şəxs bütə səcdə edər yaxud Allahı və Peyğəmbəri (salləllahu aleyhi və sələm) söyər yaxud Quranı ayaq altına atarsa, qəlbi ilə təkzib etməyəcəyi təqdirdə kafir olmaz. Onlara görə adi söz və əməllər küfrə dəlalət etmir.Bu, aşırıya varmış murciələrin məzhəbidir.Günümüzdə bəzi saxta elm tələləbəri bu sözləri deyirlər.

Onların bu bəlaya düşmələrinə səbəb cəhalətdir.Çünki onlar əqidəni öyərnməmiş və onu alimlərdən almamışlar. Onlar bunu yalnız vərəqlərdə sətirlənmiş yazılardan mənimsəmiş və dinin və imanın əsaslarını bilməmişlər. İnsanın kitablardan yaxud cahil və saxta elm tələbələrindən elm öyrənməsi onu bu kimi təhlükəyə atır.Onların müsəlman gənclərinə təsir etmələri probleme çevrilmişdir."[8]

---

[7] ət-tə`liqul muxtəsar aləl aqidəti-n-nuniyyə:2/647.

[8] Öncəki mənbə:2/645.

Habelə fəzilətli şeyx demişdir: "İslamı pozan amilləri yalnız danma çərçivəsinə salmaq yanlışlıqdır.Günümüzdəki bəzi saxta elm əhlindən olan yazarlar, güya insanlar üçün dində genişlik yaratmaq məqsədilə həmin məzhəbi ortaya çıxarmağa cəhd göstərirlər.Belə ki, insan dindən heç bir şeyi danmayacağı sürəcə onlara görə müsəlman olacaq.Onlara görə bütə səcdə etdiyi zaman: Mən dindən heç bir şeyi danmıram, əksinə tövhidi etiraf edirəm və mənim etdiyim yalnız bir günah işdir,-deyən şəxs yaxud Allahdan qeyrisi üçün qurban kəsən yaxud Allahı, Peyğəmbəri (salləllahu aleyhi və səlləm) və dini söyən şəxs müsəlmandır.Çünki o, danmır.Bu böyük yanlışlıqdır.Bunu deyən şəxs dinini tamamilə zay edir və belə olan halda ümumiyyətlə din qalmır. Bu böyük təhlükədən həzər etmək gərəkdir."[9]

Artıq elm əhli, bu müasir bidətə qarşı biganə qalmayaraq, haqqı bəyan etmək, münkəri inkar etmək və ümmətə nəsihət etmək məqsədilə ona çağıran ən məşhur kitablardan çəkindirmişlər.Allah onlara ən xeyirli mükafat əta etsin!

## *Kitabı yazmağa səbəb:*

Bu kitabı təlif etməyə səbəb olan ən əsas amillərdən biri, iman məsələsi və onun əməl ilə bağlılığı ətrafında yer alan məqalə və rəddiyələrin çoxluğunu müşahidə etməyim olmuşdur.Habelə başlanğıc mərhələsində olan tələbələrin bir çoxu müxalifin irəli sürdüyü fikirlərin Əhli sunnə vəl cəmaatın məzhəbi olduğunu və həmin müxaliflərdən

---

[9] ət-tə`liqatul muxtəsar aləl aqidəti-t-tahaviyyə:144-cü səh.

çəkindirən elm əhlinin bu məsələlərdə haqqa müvəffəq olmadıqlarını, həmin müxaliflərin qeyd etdikləri dəlillərin onlara gizli qaldığını, onların şəxsi maraqların arxasınca düşdüklərini yaxud hizbçilərdən təsirləndiklərini və digər rüsvayçı şeyləri xəyallarına gətirmələridir.

İş o yerə çatmışdır ki, onlardan biri namazı tərk edəni təkfir etməyə dair sözü xəvaric və mötəzilənin sözü etmiş, eyni zamanda Qatədinin qədərə dair sözünə və ibn Xuzeymənin "surət" hədisinə dair sözünə üzr axtarıldığı kimi sələfdən bu sözü deyənlərə üzr axtarmağa tələsmişdir.[10]

Heç şübhə yoxdur ki bu, sələf və imamlara qarşı olan böyük cinayətdir.Dəlillərin dəlalət etdiyi, səhabələrdən böyük toplumun dediyi, bir sıra insanların onlardan icma olaraq nəql etdiyi sözün xəvaric və mötəzilənin sözü olaraq təqdim edilməsi hansı cürət tələb edir? Üstəlik bu, məzəmmət etmək və nifrət hissi oyatmaq üçün deyilir.Lakin elmdən cuzi bilgiyə sahib olan insan bu məsələyə dair ixtilafın Əhli sunnə arasında baş verdiyini bilir.

---

[10] Bu, "əs-səhatul arabiyyə" saytında, 16/4/2006-ci il tarixində az öncə qeyd edilən "dabtu-d-davabit" kitabının sahibinin məqaləsində yayılmışdır.Daha sonra həmin şəxs eyni adlı saytda 14/5/2006-ci tarixində digər bir məqalə yerləşdirib adını "Məgər Allahın qulları üzərində hüccəti yalnız Şeyxul-İslamın vasitəsilə qalxır? Düşünmək çağırışı" qoymudşur.Həmin şəxs, bu məqalədə Şeyxul-İslamın ziddiyətli sözləri olduğunu iddia etmiş və ona növbəti sözləri nisbət etmişdir: Namazı tərk edəni təkfir edənlər xəvariclərin sözünü demiş olurlar.Eyni zamanda şeyx digər bir yerdə belə deyir: Alimlərdən namazı tərk edənin öldürülməyəcəyini yaxud müsəlman olaraq öldürüləcəyini deyənlər irca şübhəsinə düşmüşlər.

Dedim: Şəriət universitetlərində təhsil alıb elm əhlinin arasında yaşamış şəxsin durumu belədirsə bundan heç bir şeyə nail olmayan cahillər barədə nə demək olar! Onun ilk olaraq Şeyxul-İslama nisbət etdiyi söz yanlış fikirdir və bu, irəlidə izah ediləcəyi kimi qüsurlu anlamdan irəli gəlir.

Bunu qeyd etməyimdə əsas məqsəd bu məsələlərə dair yazıların təlif edilməsinə,habelə kütlə arasında yayılan və gündən günə artan azdığıcı şübhələrin ifşa edilməsinə böyük ehtiyacın olduğunu oxucuya çatdırmaq olmuşdur.

Müxaliflərin bu məsələyə dair yazdıqları bütün kitabları gözdən keçirtdim və həmin kitabların dörd şeydən kənara çıxmadığını gördüm:

*Birinci*: Murciələrin ortaya atdığı, Əhli sunnənin isə puç etdiyi qədim şübhə.Misal olaraq, şəhadətin fəzilətinə və şəhadət sahiblərinin qiyamət günü xilas olacaqlarına dair varid olan ümumi dəlillərdən yapışmaq.

*İkinci*: Elm əhlindən gətirilən nəqllər yersiz istifadə edilmiş və yanlış anlaşılmışdır.Onun bir çoxu yaxud çoxu ümumiyətlə çəkişmə mövzusundan kənardır.

*Üçüncü*: Bu mövzuya dair Əhli sunnənin əqidəsindən çıxması ilə tanınan bidət əhlindən gətirilən nəqllər.

*Dördüncü*: Əqli şübhələr.Müxalif bununla imanın səhih olması üçün əməlin gərəkli olmasına dair Əhli sunnənin icmasını şübhə altına salmaq məqsədi güdmüşdür.

Beləliklə də mən, həmin şübhələrin ifşa edilməsinə və gətirilən nəqllərə aydınlıq gətirilməsinə böyük ehtiyacın olduğunu gördüm.Buna önünüzdə olan kitabın dördüncü bölümündə rast gələ bilərsiniz.Allahın müvəffəqiyyəti ilə onların gətirdikləri bütün şübhə və nəqllərə həmin bölümdə cavab vermişəm.Bununla mən onlara və onların ardıcıllarına

haqqa dönməyə, sunnəyə sarılmağa və ümmətin alimləri ətrafına toplanmağa yardımçı olmağı arzuladım.

Bunun dolğun surətdə olması üçün iki mühüm məsələyə ehtiyacın olduğunu gördüm:

*Birinci*: Əhli sunnə vəl cəmaata, habelə mübahisə və çəkişmə mövzusu olmasın deyə müxaliflərə görə iman və küfr məsələsinin təməl qaydalarını müəyyənləşdirmək.

Bu məsələlər birinci və ikinci bölümləri şamil etmişdir. Bunun ardından üçüncü bölümü, əməlin İslamda məqamına və onu tərk edənin hökmünün bəyan edilməsinə həsr etdim. Həmin bölümdə mən zahir ilə daxil arasında olan bağlılıq məsələsini, onun dəlilləri və mahiyyətini və murciələrin ona dair mövqeyini izah etdim, habelə bədən əməlləri olmadan əməlin yetərli olmayacağına dair Əhli sunnənin icmasını və səhabələrin namazı tərk edənin təkfir ediləcəyinə dair icmasını əsas tutdum.Daha sonra bunu, səhabələrin zamanından yaşadığımız zamana qədər əməlin məqamı və onu tərk edənin hökmünə dair imamların sözlərini cəm edən önəmli bir fəsillə bitirdim.

*İkinci*: Müxaliflə münaqişədə ədəbi gözləmək və onu nəinki söymək və təhqir etmək hətta ona qarşı ola biləcək sərtlik və qabalıqdan kənar durmaq.Habelə rəddiyə verildiyi zaman rəddiyə verilən şəxslərə din qardaşlığı, Əhli sunnənin və ümmətin sələfinin mənhəcinə mənsubiyyət prizmasından baxmaq və düşüncəlik, qərəzsizlik və insaf hasil olacağı zaman onların düşdükləri xəta və yanlışlıqlarından əl çəkəcəklərinə ümid etmək.

Habelə mən bu kitabda "muxalif" dediyim zaman iman məsələsində müxalif olan bütün müasir məqalə və kitab sahiblərini qəsd edirəm.Allahdan bizə və onlara hidayət diləyirəm.

*Şübhə və onun cavabı:*

Bəzi ziyalı insanlar bu məsələlərə dair yazının əhəmiyyətini kiçildib iddia edirlər ki, əməlin gərəkli olmasına və əməli edənin savab onu tərk edənin isə cəza alacağına yekdil olmaq kifayət edir və Uca Allahı və Peyğəmbəri söymək yaxud bütə səcdə etmək kimi işlər sərt haramlığı ifadə edən və həmin şəxsin küfrə düşmə qorxusunu yaradan məsələlərdir.Bu sözlərdən elə çıxır ki, biz bu məsələyə dair təliflər və rəddiyələr yazmamalı və: Bu əməllər özlüyündə küfr deyil,-deyən şəxslərə yaxud: Bütövlüklə əməli tərk etmək imanı pozmur,-deyən şəxslərə etiraz etməməli və adı çəkilən yekdilliklə kifayətlənməliyik.

*Bu şübhəyə bir neçə yöndən cavab veriləcək:*

*Birinci*: Quran və sunnəni, habelə mənafe və zərəri bizdən daha yaxşı bilən sələfimiz bu ümmətin maraqları üçün daha çox qayğılı olmuşlar.Onlar murciələrin daha kiçik bidətlərini pisləmiş və buna dair təliflər yazmışlar.

*İkinci*: Bidət inkar edilməyəcəyi zaman o, ümmət arasında rəvac tapacaq sonra isə onu insanların canından çıxartmaq çox çətin bir işə çevriləcək.Sələfin və ilk murciələrin sözlərindən qurulmuş bu müasir irca bidəti, ilk növbədə bəzi elm əhlinin ondan çəkindirmək və onun

əhlinə iradlar tutmaq kimi işlərdə bir qədər yumşaqlıq etmələri səbəbilə yayılmış və nəticədə bu fikrin daşıyıcıları təliflər yazıb bir çox insanı bu şübhəyə salmışlar.

*Üçüncü*: İman və küfrün əsaslarına dair bilgisizlik, aradan qaldırılması vacib olan cəhalətin ən böyük növlərindən biridir. Əhli sunnənin bu məsələlərə dair əqidəsini bəyan edən və xəvaric və murciələrin bidətlərindən çəkindirən çalışmaların bir səmtdə aparılması gərəkdir.İslam kitabxanası hələ də bu kimi mövzulara dair əlavə təliflərə lüzum duyur.

*Dördüncü*: Məsələ həmin əməlin küfr yaxud asilik olması həddində dayanan ixtilafdan ibarət olmamış üstəlik bu məsələ ilə əlaqəli olan onlarla nassların anlamına, habelə sələf və imamların bu mövzuya dair anlamına sirayət etmişdir.

*Beşinci*: Murciələrin iman və küfr mövzusuna dair ixtira etdiklərini bilmək, bu günlərdə baş verənləri anlamağa yardımçı olur.Artıq bəzi insanlar öz cəhaləti səbəbilə təkfirdə aşırıya varma bidətinə rəddiyələr verib murciələrin bəzi sözlərini mənimsəyirlər.Bidətlər məhz bu cür, həvəs və duyğulara qapanma və elmi qaydalardan uzaq bir şəraitdə ortaya çıxıb inkişaf edir.Bu səbəbdən murciələrin və xəvariclərin sözlərini bəyan etmək zərurəti yaranır.

*Araşdırmanın üslubu:*

Bu araşdırmanı ön söz və sonluqla bərabər dörd bölümə aşağıda göstərilən şəkildə böldüm:

**Birinci bölüm:** Əhli sunnə vəl camaata görə küfr və imanın anlamı.

Həmin bölüm iki fəsildən ibarətdir:

**Birinci fəsil:** Əhli sunnə vəl camaata görə imanın anlamı.

Yeddi araşdırmadan ibarətdir:

1-İmanın ərəb dilində mənası

2-İmanın şər`i mənası

3-İmanın gərcəyinə dair ətraflı söhbət

4-İmanın özəyi və şaxəsi

5-İmanın artıb azalması

6-İmanda istisna

7-İman ilə İslam arasında olan fərq

İkinci fəsil: Əhli sunnə vəl camaata görə küfrün anlamı

Altı araşdırmadan ibarətdir:

1-Küfrün ərəb dilində və şər`i istilahı mənası

2-Küfr dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməldə olur

3-Böyük və kiçik küfr

4-Müəyyən şəxslərin təkfir edilməsində ehtiyatlı olmaq

5-Böyük günah sahibinin hökmü

6-Müsəlman fasiqin hökmü

İkinci bölüm: Müxtəlif firqələrə görə iman və küfrün anlamı

Yeddi fəsildən ibarətdir:

Birinci fəsil: Xəvaric və mötəzili firqələrinə görə iman

İkinci fəsil: Cəhmiyyə firqəsinə dair açıqlama

Üç araşdırmadan ibarətdir:

1-Onların imana dair görüşü

2-Cəhmilərə görə küfrün anlamı

3-Cəhmin yanlışlıqları

Üçüncü fəsil: Kərramiyyə firqəsinə dair açıqlama

Dördüncü fəsil: Əşari firqəsinə dair açıqlama

Beş araşdırmadan ibarətdir:

1-Onların imana dair sözləri

2-Onların imanın artıb azalmasına dair sözləri

3-Onların imanda istisna etməyə dair sözləri

4-Əşarilərin təsdiqi ilə Cəhmin biliyi arasında fərq

5-Əşarilərə görə küfrün anlamı

Beşinci fəsil: Məturudi firqəsinə dair açıqlama

İki araşdırmadan ibarətdir:

1-Onların imana dair görüşü

2-Onların küfrə dair görüşü

Altıncı fəsil: Fəqih murciələrin məzhəbinə dair açıqlama

İki araşdırmadan ibarətdir:

1-Onların imana dair görüşü

2-Əhli sunnə ilə fəqih murciələr arasında olan ixtilaf həqiqi yaxud ləfzi ixtilafdır?

Yeddinci fəsil: Müasir irca fikrinin xüsusiyyətləri.

Üç araşdırmadan ibarətdir:

1-Murciələrə nisbət olunan sözə dair: İmanla birgə günah zərər verməz

2-Sələfdən bəzisinin dediyi sözə dair: Hər kim imanın söz və əməl olduğunu, habelə artıb azaldığını deyərsə ircadan uzaqlaşmış olar

3-Əsrimizdə deyilən irca məzmunlu sözlər

Üçüncü bölüm: Əməlin imanla bağlılığı

Üç fəsildən ibarətdir:

Birinci fəsil: Zahir ilə daxil arasında olan bağlılıq

Dörd araşdırmadan ibarətdir:

1-Tələzum anlamı

2-Murciələrin tələzumu inkar etmələri

3- Zahir ilə daxil arasında olan bağlılığa dair dəlillər

**4-Üz çevirmə küfrü**

**İkinci fəsil: Bütövlüklə zahiri əməli tərk etməyin imanı pozan amil olduğuna dair dəlillər**

İki araşdırmadan ibarətdir:

1-Çəkişmə nöqtəsinin təyin edilməsi

2-Əhli sunnənin dəlilləri

Üç mətləbdən ibarətdir:

1-Zahir ilə daxil arasında olan bağlılıq

2-İmanın yalnız əməl ilə doğru olacağına və onun imanın ayrılmaz hissəsi olmasına dair Əhli sunnənin icması

3-Səhabələrin namazı tərk edənin küfrünə dair icması

**Üçüncü fəsil: Bədən əməllərinin İslamda olan yeri və onu tərk edənin hökmünə dair elm əhlindən nəql edilən xəbərlər**

**Dördüncü bölüm: Müasir şübhələrin ifşası**

Üç fəsildən ibarətdir:

**Birinci fəsil: Müxaliflərin gətirdikləri nəqli dəlillərə cavab**

Altı araşdırmadan ibarətdir:

1-Yığcam cavab

2-Vərəq “bitaqa” hədisini əsas tutmaları və bunun cavabı

3-“Heç vaxt xeyir etməmişlər” hədisini əsas tutmaları və bunun cavabı

4-"İslamın yoxa çıxması" hədisini əsas tutmaları və bunun cavabı

5-Muazın Yəmənə göndərilməsi hədisini əsas tutmaları və bunun cavabı

İkinci fəsil:

Burada müxalifin on iki şübhəsinə cavab verilir

Üçüncü fəsil: Müxalifə müəmmalı qalan elm əhlinin sözlərinin izahı

On yeddi araşdırmadan ibarətdir:

1-İmam Sufyən bin Uyeynədən gələn xəbər.

2-İmam Şafiidən gələn xəbər.

3-İmam Abdullah bin Zubeyr əl-Humeydidən gələn xəbər

4-İmam Əhməd bin Hənbəldən gələn xəbər

5-İmam ibn Quteybəəd-Deynuridən gələn xəbər

6-İmam Muhamməd bin Nəsr əl-Mərvəzidən gələn xəbər

7-Mərvəzinin hekayət etdiyi və hədis əhlindən bir sıra insanlardan gələn xəbər

8-İmam ibn Mandəhdən gələn xəbər

9-İmam ibn Hazmdan gələn xəbər

10-İmam Beyhaqidən gələn xəbər

11-İmam Qadı İyaddan gələn xəbər

12-İmam ibn Salahdan gələn xəbər

Nəhayət bu araşdırmanı həmin kitabda varid olan mənbələrin və mövzuların mündəricatını gətirməklə bitirdim.

Uca Allahdan bu əməli, sırf Onun rizası üçün etməsini, həmin kitabı onu yazana və oxuyana faydalı etməsini, habelə bizim şeyxlərimizə, qardaşlarımıza və bu kitabın ərsəyə gəlməsinə yardımçı olan bütün insanlara xeyirli mükafat verməsini diləyirəm.Həqiqətən də O, Comərddir, Kərimdir. Allahın salavatı və salamı Peyğəmbərimiz Muhammədin, onun ailəsinin və əshabının üzərinə olsun.

# Birinci bölüm

## Əhli sunnə vəl cəmaata görə küfr və imanın anlamı

İki fəsildən ibarətdir:

***Birinci fəsil***: Əhli sunnəyə görə imanın anlamı

*İkinci fəsil*: Əhli sunnəyə görə küfrün anlamı

# BİRİNCİ FƏSİL

## Əhli sunnəyə görə imanın anlamı

Yeddi araşdırmadam ibarətdir:

1-İmanın ərəb dilində mənası

2-İmanın şər`i mənası

3-İmanın gərcəyinə dair ətraflı söhbət

4-İmanın özəyi və şaxəsi

5-İmanın artıb azalması

6-İmanda istisna

7-İman ilə İslam arasında olan fərq

# Birinci araşdırma:

## İmanın ərəb dilində olan mənası

Ərəb dilçilərinin iman sözünə“təsdiq” tərifini vermələri məşhurdur.Bəziləri hətta buna dair icma iddiasında olmuşlar.

Əl-Əzhari dedi: “Dilçi və başqalarından olan elm əhli imanın təsdiq mənasında gəldiyinə yekdil olmuşlar.”[11]

Həmçinin o, imanın əsas mənasını açıqlayaraq demişdir: “İnsanın Allahın ona verdiyi əmanətə sadiq olaraq daxil olmasıdır.İnsan dili ilə təsdiq etdiyi kimi qəlbi ilə təsdiq edəcəyi zaman artıq əmanətə vəfa etmiş mömin olacaq.Əgər biri qəlbi ilə təsdiqi etiqad etməzsə Allahın verdiyi əmanətə vəfa etməyən münafiq olar.”[12]

Bəzi dilçilər imanı təsdiq etmə mənasında məhdud etməyərək, onu qəlb əməlinə daxil olan şeylər olaraq izah etmişlər.İbn Manzur dedi: “əz-Zəccəc imana tərif verərək dedi: İman: Şəriətə və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyinə itaətçiliyi və qəbulu aşkar etmək, və onu etiqad edib qəlb ilə təsdiqləməkdir.”[13]əl-Firuzabadi dedi: “İman: İnam, habelə itaətin aşkara çıxarılması və şəriətin qəbul edilməsidir.”[14]

---

[11] Təhzibu-l-luğati:15/513.
[12] Təhzibu-l-luğati:15/513.
[13]Lisanul arab:13/23.
[14] əl-Qamusul muhit:1518.Təcul arus:”əminə maddəsinə bax”.

Şeyxul-İslam imanın təsdiq olduğunu deyən sözü bir çox yöndən rədd etmişdir:

1-Təsdiq sözü ərəb dilində təsirli sözlərdəndir.İman sözü isə fərqlidir.İman sözü yalnız "الباء : əl-bə" yaxud "الام : əl-ləm" ön qoşması ilə təsir etmə gücünə malikdir.Belə ki, bir şey haqqında xəbər verəni təsdiqlədiyin zaman "صدقه : təsdiq etdi" deyilir.Bu halda "آمنه و آمن به : iman etdi" deyilmir.[15]

2-İman sözü təsdiq sözü ilə həmməna deyil.Çünki iman sözü yalnız xəbər verən şəxsə etibar edilən işlərdə, misal üçün görünməyən işlərdə istifadə edilir.Təsdiq isə hər bir xəbərdə istifadə edilir.Belə ki, müşahidə edilən yaxud görünməyən bir şey haqqında xəbər verənə ərəb dilində "صدقت : doğru söylədin" deyilir.Bu cür cümlədə eynicə yalan söylədin deyilə bilər.Əgər biri: Səma üzərimizdədir,-deyərsə, ona: صدق : doğru söylədi,-deyiləcək.Dediyimiz kimi belə cümlələrdə eynicə: Yalan söylədin,-deyilə bilər.Lakin iman sözü yalnız görünməyən şeylər (qeybi işlər) barəsində xəbər verildiyi zaman istifadə edilir.Müşahidə nəticəsində bir şey haqqında xəbər verənə, məsələn: Günəş çıxdı və batdı,-deyənə:Təsdiq etdik,- kimi eyni cür : İman etdik,-deyilməyəcək.Belə ki, iman sözü "əmn: güvənlik" sözündən əmələ gəlmişdir.Bu üzdən həmin söz, xəbər verən şəxsə güvənilən və etibar edilən xəbərlərdə istifadə edilir.Misal üçün xəbər verənə etibar edilən qeybi bir məsələdə istifadə edilir.Həmin söz həm təsdiq mənasını həm də etibar və əmanət mənasını ifadə edir.Buna həmçinin onun istifadəsi və düzəlmə forması dəlalət edir.Bu səbəbdən demişlər: " و ما

[15] əl-İmənul kəbir, dımnə məcmu`əl-fətəva:7/290.

أنت بمؤمن لنا : *Onsuz da bizə inanan deyilsən"*[16]Yəni, biz doğru söyləsək belə sən bizim xəbərimizi etiraf etməz, etibar göstərməz və ona xətircəm olmazsan.Çünki onlar bu işdə onun yanında etibar göstəriləcək şəxslər deyildilər.Əgər onlar doğru desəydilər belə o, onlara inanmayacaqdır.[17]

3-Ərəb dilində iman sözü təsdiq etmə mənasını ifadə etmədiyi kimi habelə təkzib etmə sözünə əks mənada deyilmir.Məlumdur ki, dildə hər bir xəbər verən şəxsə: Doğru yaxud yalan söylədin,-deyilir.Həmçinin: Onu təsdiq etdik yaxud onu təkzib etdik,-deyilir.Lakin hər xəbər verən şəxsə: Ona iman etdik yaxud təkzib etdik,-deyilmir.Əksinə iman sözünə mənaca əks olan küfr sözüdür.Küfr isə təkziblə məhdudlaşmır.Üstəlik əgər insan: Mən bilirəm ki, sən doğrusan lakin mən sənə tabe olmuram və sənə düşmənçilik edirəm, sənə nifrət edirəm, sənə zidd gedirəm və sənə müvafiq gəlmirəm,-deyərsə onun küfrü daha böyük olar. İmana əks mənada olan küfrün yalnız təkziblə məhdudlaşmaması imanın təsdiq olmadığını biruzə verir.[18]

4-Təsdiq yalnız xəbər nəticəsində əmələ gəlir.Əmr isə əmr olması etibari ilə təsdiq mənasından kənardır.Belə ki, Allahın kəlamı xəbər və əmrdir.Xəbər, xəbər verənin təsdiq edilməsini vacib edir.Əmr isə ona tabeçiliyi və təslimçiliyi

---

[16] Yusuf:17

[17] Məcmu`əl-fətəva:7/291.Habelə məcmu`əl-fətəva:7/530-531-ya daxil olan "əl-imənul əusat" kitabına bax. Məlum olduğu kimi "məcmu`əl-fətəva" kulliyətinin yeddinci cildi "əl-imənul kəbir" kitabını şamil edir və 460-cı səhifədə bitir. Həmçinin "əl-imənul əusat" kitabı 461-ci səhifədən başlayaraq 622-ci səhifəyə qədər uzanır.Müxtəsər olması üçün bu kitabda əsasən "məcmu`əl-fətəva" külliyyəti mənbə olaraq göstəriləcək.

[18] Öncəki mənbə:7/292.

vacib edir.Bu isə əmrə itaət və tabeçilik vəhdətini ortaya qoyan qəlb əməlidir.[19]

*İmanın iqrar olaraq açıqlanması həqiqətə daha yaxındır:*

İmanın ərəb dilində qəlb təsdiqini və tabeçiliyi ifadə edən iqrar sözü ilə açıqlanması daha məqsədəuyğundur. Şeyxul-İslam (rahiməhullah) demişdir: Ona iman gətirdik,-sözü yalnız: Onu iqrar etdik,-sözü kimi istifadə edilir.Bu səbəbdən onun iqrar sözü ilə izahı təsdiq sözü ilə izah edilməsindən daha doğrudur.Onların arasında isə fərq mövcuddur.[20]

Həmçinin demişdir: "Məlumdur ki, iman adi təsdiq deyil, üstəlik iqrardır.İqrar isə təsdiq olan qəlb sözünə və tabeçilik olan qəlb əməlinə daxildir."[21]

Həmçinin demişdir: "Burada məqsəd, iman sözünün yalnız bəzi xəbərlərdə istifadə edilməsidir.İqrar sözü "قر : qərar tutma"sözündən alındığı kimi habelə iman "أمن: əmin-amanlıq"sözündən alınmadır. Mömin əmin-amanlıq sahibidir.Habelə iqrar edən iqrar sahibidir.Burada təsdiqin nəticəsi olaraq qəlb əməlinin olması labüddür.İnsan Muhamməddin Allahın elçisi olduğunu bilib onu sevməyəcəyi və təzim etməyəcəyi, üstəlik ona nifrət edib ona

---

19 əs-Sarimul məslul:3/967.İman ilə təsdiq arasında olan fərqin müxtəlif yönlərinə şeyx Abdur-Razzəq bin Abdul-Muhsin əl-Abbədin "ziyədətul imən va nuqsanuhu:18-ci səh" kitabına, habelə Sa`d bin Muhammədd Ali Abdul-Lətifin "ət-tə`rifətul i`tiqadiyyə:103-105-ci səh" kitabına bax.

20 Məcmu`əl-fətəva:7/291.

21 Öncəki mənbə:7/638.

həsəd aparacağı və ona tabe olmağı özünə sığışdırmayacağı zaman onun mömin deyil kafir olacağı bilinəcək.”[22]

Şeyx ibn Useymin (rahiməhullah) demişdir: “Bu səbəbdən əgər iman iqrar olaraq izah edilərsə daha yaxşı olar.Biz deyirik: İman iqrardır. Təsdiqsiz isə iqrar olmur.Biz deyirik: (أقر به)”iqrar etdi”. Habelə deyirik: (آمن به) “iman etdi. Həmçinin deyirik: (أقر له) və (آمن له). Bütün bunlar ərəb dilində belədir.”[23]

---

[22] Öncəki mənbə:10/271.

[23] Şərhu-l-aqidəti-l-vasitiyyə:2/637.

# İkinci araşdırma:

## İmanın şər`i mənası

Şəriətdə iman, söz və əməldən, qəlb və dil sözündən və qəlb və bədən əməllərindən ibarət bir gerçəyi təşkil edir.

İbnul Qayyim (rahiməhullah) demişdir: "Burada başqa bir əsas vardır: İmanın gerçəyi söz və əməldən ibarətdir.Söz iki qismdir: Etiqad olan qəlb sözü və İslam kəlməsinin dilə gətirilməsi olan dil sözüdür.Əməl həmçinin iki qismdir: Niyyət və səmimilik olan qəlb əməli və bədən əməlidir."[24]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əhli sunnə vəl cəmaatın əsaslarından din və imanın söz və əməl, qəlb və dil sözü və qəlb, dil və bədən əməli olmasıdır."[25]

Bir çoxları buna dair Əhli sunnənin icmasını nəql etmişlər.[26]

---

[24] əs-Salət va hukmu tərikihə:45-ci səh.

[25] əl-Aqidətul vasitiyyə, şərh ibn Useymin:2/636.Şeyx ibn Useymin (rahiməhullah) dil sözünü dilin hərəkəti olaraq izah edib demişdir: "Dilin sözü eşidilən bir şey olur.Dilin əməli isə onun hərəkətidir.Məlum olduğu kimi söz dilin, çənənin və dodaqların hərəkətindən ibarətdir.Həmin əzaların hərəkəti imana daxildir, çünki o, əməldir." Şeyx Muhamməd bin İbrahim vasitiyyə risaləsinin bəzi çaplarında varid olan "dilin əməli" sözü haqqında soruşulduğu zaman belə cavab vermişdir: "Bu yanlışlıqdır.Digər nüsxələrdə dilin əməli sözü keçmir.Biz ibnul-Qayyimin sözünü eşidib həmin çaplarda gələni ona aid etmək istəmişik.Lakin bunu etmək bizə müyəssər olmamışdır.Üstəlik digər ifadələrdə buna zidd gələn şeylər varid olmuşdur."(fətəva va rasəil səməhati-ş-şeyx Muhamməd bin İbrahim:1/245)

[26] Bu icma, Quran və sunnədən olan on dəlilə əsaslanır.Onlardan bir qismi imanın gerçəyinə dair söz zamanı növbəti araşdırmada qeyd ediləcək.

İmam Şafii (rahiməhullah) demişdir: “Səhabələr, tabiinlər, onlardan sonra gələnlər və yetişdiyimiz insanların icması onların belə demələrində olmuşdur: “İman söz, əməl və niyyətdir və üçündən biri digərsiz yetərli deyil”.[27]

İmam Buxari (rahiməhullah) demişdir: “Hicaz, Məkkə, Mədinə, Kufə, Bəsrə, Vasit, Bağdad, Şam və Misirdən olan elm əhlindən mindən çox kişi ilə dəfələrlə və təbəqə-təbəqə rastlaşdım. Qırx altı ildən daha çox müddətdən bəri onlar çoxlu sayda mövcud olarkən bir neçə il ərzində Şam, Misir və yarımada əhalisi ilə iki dəfə, Bəsrə əhalisi ilə isə dörd dəfə görüşdüm.Daha sonra qırx beş kişinin adlarını sadalayıb dedi: Müxtəsər olub yorucu olmasın deyə bunların adını çəkməklə kifayətləndik. Onlardan heç kimin növbəti şeylərdə ixtilaf etdiklərini görmədim: Din, söz və əməldir.Uca Allah buyurur: *“Halbuki onlara əmr edilmişdi ki, Allaha -dini yalnız Ona xas edərək, batildən haqqa (islama) dönərək -ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgün din budur!”*.[28][29]

İmam Buxari (rahiməhullah) demişdir: “Min və daha çox alimdən elm yazmışam və onu yalnız: İman söz və əməldir,-deyənlərdən yazmışam.İman sözdür,-deyənlərdən isə elm yazmamışam.”[30]

Əbu Ubeyd əl-Qasim bin Səlləm (rahiməhullah) demişdir: “Bu, iman söz və əməldir və o, artır və azalır deyənlərin adlarıdır.Daha sonra yüz otuz üç alimin adını çəkib ardınca dedi: “Bunlar hamısı deyirlər: İman söz və əməldir, artır və

---

[27] Məcmu`əl-fətəva:7/209.Sərhu usuli i`tiqadi əhlis sunnə, Lələkai:5/956. 1593-cü rəqəm.
[28] əl-Bəyyinə:5.
[29] Şərhu usuli i`tiqad əhli-s-sunnə, Lələkəi:1/194,320-cu rəqəm.
[30] Öncəki mənbə:5/959,1097-ci rəqəm.

azalır.Bu, Əhli sunnənin sözü və bizim əməlimizin əsasıdır.”[31]

İbn Abdul-Bərr (rahiməhullah) demişdir: “Fiqh və hədis əhli imanın söz və əməl olduğuna icma etmişlər.Əməl yalnız niyyət ilə olur.Onlara görə iman itaətlə artır və asiliklə azalır. Onlara görə bütün itaətlər imandır.Burada yalnız Əbu Hanifə və onun tərəfdarları istisnadır.Onların görüşünə əsasən itaətlər iman adlanmır.Onlar demişlər: İman yalnız təsdiq və iqrardır.Onlardan bəzisi əlavə edərək:.. və bilikdir,-demişdir.”[32]

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Bu səbəbdən: İman söz və əməldir,-sözü, Əhli sunnəyə görə sunnənin şuarlarından olmuşdur.Bir çoxları buna dair icma nəql etmişlər.Artıq imam Şafii buna dair “əl-Umm” kitabında icma nəql edib: Səhabələr, tabiinlər, onlardan sonra gələnlər və yetişdiyimiz insanların icması onların belə demələrində olmuşdur: “İman söz, əməl və niyyətdir və üçündən biri digərsiz yetərli deyil”,-demişdir.”[33]

Həmçinin demişdir: “Bir çoxları sunnə və hədis əhlinin imanın söz və əməl olduğuna dair icma nəql etmişlər.”[34]

Həmçinin demişdir: “Əbu Amr Talmənki (rahiməhullah) Musa bin Harun əl-Hamməldən məşhur isnadı ilə belə rəvayət etmişdir: “Əbu İshaq bin Rahuyə bizə belə yazdırmışdır: İman söz və əməldir və o, artıb azalır.Şübhəsiz ki bu, bizim vəsf etdiyimiz kimidir.Biz bunu səhih rəvayətlər, ümumi gələn açıq-aydın xəbərlər və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) ayrı-ayrı səhabələri, tabiinlər və sayirə

---

[31] İbn Batta “əl-İbənə:2/814-826, 1117-ci rəqəm.Məcmu`əl-fətəva:7/309.

[32] ət-Təmhid:9/238.

[33] Məcmu`əl-fətəva:7/308.

[34] Öncəki mənbə:7/330.

insanlar vasitəsi ilə bilmişik. Həmçinin tabiinlərdən sonra gələn elm əhli ixtilaf etmədən bir işin üzərində olmuşlar. Həmçinin insanlar Əuzainin vaxtında Şamda, Sufyan əs-Səurinin vaxtı İraqda, Malik bin Ənəsin vaxtı Hicazda, Mə`mərin vaxtı Yəməndə açıqladığımız və bəyan etdiyimiz kimi imanın söz və əməl olduğunu və artıb azaldığını etiqad etmişlər."[35]

İmanın söz və əməl olmasına və artıb azalmasına Əhli sunnə icma etmişlər.Lakin onlardan bəzisi buna niyyəti yaxud sunnəyə tabeçiliyi əlavə etmişlər.Onlardan bəzisi isə demişdir: Dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməldir.Lakin burada məna ziddiyəti yoxdur və bu, sadəcə izah və bəyanı artırmaq üçündür.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Səhabələrdən, tabiinlərdən və sələfin cumhurundan nəql edilən, həmçinin hədis əhlinin və Əhli sunnəyə mənsub olanların görüşü imanın söz və əməl olması və artıb azalmasıdır.O, itaət ilə artır və asilik ilə azalır.Həmçinin onda istisna etmək olar.Umeyr bin Habib əl-Xutami və digər səhabələrin dediyi kimi: İman artır və azalır.Ona: Onun artması və azalması nədədir?-deyildikdə o, belə dedi: Biz Allahı zikr edib, Ona həmd edib Onu təsbih etdiyimiz zaman iman artır.Qəflətə, unutqanlığa və səhlənkarlığa düşdüyümüz zaman isə azalır.Bizə çatan bu sözlər onların əksəriyyətindən nəql edilir.Ola bilsin ki, bəzisi və bir çox sonrakilər: Söz, əməl və niyyətdir,-desin.Ola bilsin bəziləri: Söz, əməl, niyyət və sunnəyə tabeçilikdir,-desin.Ola bilsin də bəzisi belə desin: Dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməldir[36].

---

[35] Məcmu`əl-fətəva:7/308.

[36] Bunu rəvayət edənlərdən biri də: Əbu Hatim ər-Razidir.Belə ki, əl-Lələkəi ondan bu sözləri nəql edir: "İmanın söz və əməl, dil ilə iqrar,qəlb ilə təsdiq, habelə namaz, mal-dövlətə sahib olan üçün zəkat, iqtidarında olan üçün həcc,

Bəziləri bunu Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) nəql edirlər.Bu isə, Əbu Salt əl-Həravinin Əli bin Musadan rəvayət etdiyi və ona nisbət olunan nüsxədə gəlmişdir.[37] Şübhəsiz ki, bu rəvayət hədis elminin yekdilliyi ilə

---

Ramazan orucu və Allahın qullarına fərz buyurduğu digər fərzlər kimi bədən əzaları ilə əməl olması bizim seçdiyimiz görüşdür.Buna əməl etmək imandandır.(Şərhu usulil i`tiqad:2/181, 323-cü rəqəm)

[37]Müxtəlif çaplarda səhv olaraq Əli bin Əbu Musa göstərilmişdir.Əbu Salt, Əli bin Musa ər-Ridanın xidmətçisi olan Abdus-Sələm bin Salih əl-Həravidir.Xatıb əl-Bağdadi demişdir: "Bərqani bizə xəbər verib dedi: İbrahim bin Yəqub əl-Cəvzəcəni bizə təhdis edib dedi: Əbu Salt əl-Həravi haqq yoldan azmış birisi idi.Mənə bəzi imamlardan təhdis edən şəxsin onun haqqında belə dediyini eşitdim: O, Dəccalın eşşəyinin peyinindən daha yalançıdır.Həmin şəxs qədim zamandan bəri murdara bulaşmış birisidir. Habelə Bərqani bizə xəbər verib dedi: Əbu Salt Abdus-Sələm bin Salih əl-Həravi Əbul Həsən əd-Dəraqutninin hüzurunda anıldığı zaman Əbul Həsən qulağımla eşitdiyim bu sözləri dedi: Murdar rafizi idi. Həmçinin Əbul Həsən dedi: Həmin şəxs Cəfər bin Muhamməddən, onun da əcdadlarından, onların da Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) belə rəvayət etdiklərini demişdir: "İman dil ilə iqrar və bədən əzaları ilə əməldir." Həmin şəxs dediyi sözləri uydurmaqda ittiham olunur.Bunu ondan isə yalnız həmin rəvayəti ondan qapan rəvayət edir.Çünki həmin hədis ondan əsas götürür. (tərixu bağdəd:11/51, təhzibul kəməl, lilmizzi:18/80)

İbn əl-Cəuzi demişdir: "Həmin şəxs, Cəfər bin Muhamməddən, onun da əcdadlarından, onların da Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) rəvayət edilən "iman dil ilə iqrar və bədən əzaları ilə əməldir" hədisini uydurmaqda ittiham edilmişdir.(əl-Muntəzam:11/243) əl-Mizzi demişdir: "Abdur-Rahmən bin Əbu Hatim dedi: Atamdan onun haqqında soruşduğum zaman belə dedi: Mənim üçün etibarlı ravi olmayıb.Zəifdir və mənə ondan təhdis edilməyib.Əbu Zur`a isə Əbu Saltdan gələn hədislərə görə vurmağı əmr edib deyirdi: Ondan hədis rəvayət etmirəm və buna razı olmuram. (təhzibul kəməl:18/80)

İmam Zəhəbi demişdir: "Saleh birisi olmasına rəğmən rəvayətləri qəbul olunmayan bir şiədir.Hicrətin 236-cı ilində vəfat edib" (əl-Kəşif:3368) İbn Hacər demişdir: "Saduq ravidir ancaq münkər rəvayətləri vardır.Şiə olmuşdur. əl-Uqeyli ifrata varıb onun yalançı olduğunu demişdir." (təqribu-t-təhzib:4070). Artıq əl-Muallimi əl-Yəməni ibn Həcərin bu sözünə təəccübünü bildirib belə demişdir: "əl-Uqeyli bunu deyən yeganə şəxs deyil.Artıq Əbu Hatim demişdir: Saduq ravi olmayıb.İbn Adiyy demişdir: Onun, əhli beytin fəzilətinə dair münkər hədisləri vardır və o, onları uydurmaqda ittiham olunur.əd-Dəraqutni demişdir: "İman, qəlb ilə iqrardır" hədisini rəvayət edəndir. O, həmin hədisi uydurmaqda ittiham olunur.Habelə Muhamməd bin Tahir demişdir: Yalançıdır.(ət-tə`liq aləl fəvaidil məcmua:293-cü səh)

qondarmadır.Bütün bu ifadələr arasında məna ziddiyyəti yoxdur.Lakin mütləq söz və mütləq əməl sələfin sözlərindədir.Bu sözlər, qəlb və dil sözlərini və qəlb və bədən əməllərini şamil edir.Qəlb etiqadı olmadan dil sözü, münafiqlərin sözüdür.Bu yalnız qeyd ilə söz adlanır.Uca Allah buyurur:*"Onlar qəlbində olmayanları dilləri ilə deyirlər"*.[38] Qəlb əməlləri olmadan bədən əməli, Allahın qəbul etmədiyi münafiqlərin əməlləridir.

Sələfin sözü daxili və zahiri söz və əməli cəm edir.Lakin bəzi insanlar niyyətin ora girdiyini anlamadığı zaman onlardan bəzisi: Həmçinin niyyət,-demişlər.Daha sonra başqaları mütləq söz, əməl və niyyətin yalnız sunnəyə uyğunluq olacağı halda qəbul ediləcəyini bəyan etmişlər. Bu, həmçinin haqqdır.Belə ki, onlar söz və əməl dediyi zaman onun mahiyyətini bəyan etmək istəmişlər.Onların məqsədi söz və əməllərin vəsflərini qeyd etmək deyildir. Həmçinin: Qəlb ilə etiqad, dil ilə söz və bədən əzaları ilə əməldir,-deyənlər, sözü və əməli üzdə olanın adı kimi istifadə etmişlər.Belə olan halda buna qəlb etiqadının birləşməsi zərurəti ortaya çıxmış və qəlb etiqadı sözünə Allaha sevgi, Allahdan qorxu, Allaha təvəkkül və buna bənzər təsdiqlə bağlı olan qəlb əməllərinin daxil olması labüdlüyü yaranmışdır.Çünki bütün firqələrin yekdilliyi ilə qəlb əməllərinin imana daxil olması bədən əməllərinin ora daxil olmasından daha öndədir."[39]

Həmçinin demişdir: "Daha sonra demişlər: "Söz və əməl yalnız niyyət ilə qəbul edilir.Bu, açıq-aydındır.Əgər söz və əməl xalis Allah üçün olmazsa Uca Allah onu qəbul etməz. Daha sonra demişlər: Söz, əməl, niyyət yalnız şəriət olan sunnəyə uyğunluq ilə, Allahın və Peyğəmbərin əmr etdikləri

---

[38] əl-Fəth:11

[39] Məcmu`əl-fətəva:7/505.

**ilə qəbul edilir.Çünki sunnə olmayan və şəriətdə təsdiqini tapmayan Allahın əmr etmədiyi söz, əməl və niyyət bidətdir.Hər bidət isə zəlalətdir və Allahın sevdiyi şeylərdən deyil.Bu səbəbdən Uca Allah onu qəbul etmir və həmin əməl müşriklərin və kitab əhlinin əməlləri kimi yararsız olur."[40]**

[40] **əl-İstiqamə:2/310.**

# Üçüncü araşdırma:

## İmanın gərcəyinə dair ətraflı söhbət

Artıq bəyan edilmişdir ki, iman dörd hissədən ibarət gerçəyi ifadə edir: Daxili söz, zahiri söz, daxili əməl və zahiri əməl.Aşağıda buna dair ətraflı söhbət açılır:

***Birinci*: Qəlb sözü:**

Qəlb sözü deyildiyi zaman onun təsdiqi və yəqinliyi qəsd edilir.Qəlb sözünün imandan olmasına dəlil[41] olaraq Uca Allahın buyurur: *"Allah onların qəlbinə iman salmış".*[42] Habelə buyurur: *"İman sizin qəlblərinizə hələ daxil olmamış-dır".*[43] Habelə buyurur: *"Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən, sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə cihad edənlərdir! (İmanlarında) sadiq olanlar da məhz onlardır."*[44] Habelə buyurur: *"Ey Elçi! Qəlbləri iman gətirmədiyi halda ağızları ilə: "İman gətirdik!"– deyən kimsələrdən küfrə can atanlar qoy səni kədərləndirməsin."*[45]

Həmçinin Peyğəmbər (salləllahu aleyhi və səlləm) iman haq-qında belə demişdir: "Sənin Allaha, Onun mələklərinə,

---

[41] Doğrusu qəlb sözünün imandan olduğuna dəlil olaraq göstərilən əksər nasslar həmçinin qəlb əməlinin imandan olmasına dəlil olaraq gətirilir.Çünki onların hər ikisi qəlb imanına daxildir.Üstəlik qəlb əməllərindən kənar olan təsdiq müsəlmanların yekdilliyi ilə iman adlanmır.

[42] əl-Mucadilə:22.

[43] əl-Hucurat:14.

[44] əl-Hucurat:15

[45] əl-Maidə:41.

kitablarına, elçilərinə, axirət gününə, habelə qədərin xeyir və şərinə iman gətirməyindir."[46]

Həmçinin şəfaət hədisində demişdir: "...Mən: Ey Rəbbim,ümmətim, ümmətim!-deyəcəm.O, isə mənə deyəcək: Get və qəlbində cuzi, cuzi, cuzi xardal dənəsi çəkisində imanı olanı atəşdən çıxart!".[47]

Əgər bu təsdiqlə bərabər daxildə və zahirdə Allahın əmrinə itaət, Allaha sevgi və Onun təzim edilməsi olmazsa bu, iman sayılmaz."[48]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əgər adicə qəlb ilə haqqa dair elm həmin biliyin nəticəsi olan, qəlbin Onu sevməsi və Ona tabe olması kimi qəlb əməli ilə birləşməzsə o, sahibinə heç bir fayda verməz.Üstəlik qiyamət günü insanlardan ən ağır əzab görən şəxs Allahın verdiyi elmdən fayda görməyən alimdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) belə deyərdi: "Allahım! Fayda verməyən elmdən, doymayan nəfsdən, qəbul edilməyən duadan və qorxmayan qəlbdən sənə pənah aparıram".[49][50]

İrəlidə bu təsdiqin qəlb əməli ilə birgə imanın özəyi olduğu və qəlb əməlinin bədən əməli üçün özəy olduğu kimi onun zahiri sözün özəyi olması qeyd ediləcək.

---

[46] Məşhur Cəbrayıl hədisinin bir parçasıdır.Muslim:7.Ömərin (r.a)hədisində gələn bu ləfz onundur.Buxari:50.Əbu Hureyra (r.a) rəvayət etmişdir.

[47] Buxari:7510.Muslim:193.Hədisi Ənəs (r.a) rəvayət etmişdir.

[48] Məcmu`əl-fətəva:7/534.

[49] Muslim:2722.

[50] Məcmu`əl-fətəva:10/271.

*İkinci*: **Dil sözü:**

Bu, qulun yalnız ona sahib olacağı təqdirdə qurtulacağı zahiri sözdür.Həmin söz, İslam kəlməsinin: "Lə iləhə illəllah Muhammədun rasulullah",-dilə gətirliməsidir.Daha sonra təsbih, təkbir, təhmid, təhlil və Allaha tariflər, Peyğəmbərinə salavat və dua və sayirə zikrlərdir."[51]

Dil sözünün imandan olmasına dəlillər bunlardır.Uca Allah buyurur: *"Deyin: "Biz Allaha, bizə nazil olana, İbrahimə, İsmailə, İshaqa, Yaquba və onun nəslinə nazil olana, Musa və İsaya verilənlərə, özlərinin Rəbbi tərəfindən peyğəmbərlərə verilənlərə iman gətirdik. Biz onların arasında fərq qoymuruq. Biz yalnız Ona təslim olanlarıq!"*.[52] Habelə buyurur:*"De: "Biz Allaha, bizə nazil edilənə, İbrahimə, İsmailə, İshaqa, Yaquba və onun nəslinə nazil edilənlərə, Musaya, İsaya və peyğəmbərlərə öz Rəbbi tərəfindən verilənlərə iman gətirdik. Biz onların heç birinin arasında fərq qoymuruq. Biz təkcə Ona təslim olanlarıq!"*.[53]

Həmçinin Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Mən insanlarla, onlar "Lə iləhə illəllah" sözünü deyənə qədər savaşmağa əmr olundum.Kim "Lə iləhə illəllah" kəlməsini deyərsə məndən canını və malını qorumuş olar. Lakin onun haqqı istisnadır və onun sorğu-sualı Allaha aiddir."[54]

---

[51] əl-İmən, Iibni Mandəh:2/362.

[52] əl-Bəqərə:136.

[53] Ali İmran:84.

[54] Buxari:2946.Muslim:21.Əbu Hureyra (r.a) rəvayət etmişdir.

Bu səbəbdən əgər biri imkanı olduğu halda şəhadəti dilə gətirməzsə zahirdə və daxildə kafir olar.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İki şəhadətə gəldikdə isə, əgər insan iqtidarında olduğu halda onu dilə gətirməzsə müsəlmanların yekdilliyi ilə kafir olar.O, ümmətin sələfi, imamlar və alimlərin cumhuruna görə həm zahirdə həm də daxildə kafirdir."[55]

Həmçinin demişdir: "Bu səbəbdən, insanın yalnız ona sahib olacağı təqdirdə qurtuluşa nail ola biləcək zahiri söz imandan olmuşdur.İlk şəxsdən sonuncuya qədər bütün sələf və sonraki nəsillərin görüşü bu olmuşdur.Bu işdə yalnız Cəhmilər, Cəhm və ona müvafiq gələnlər müstəsnadır.Əgər bir insanın lal olduğundan ötrü yaxud İslamı aşkara çıxaracağı halda işkəncələrə məruz qalacağı səbəbilə insanlardan qorxduğu üçün və bu kimi işlərdən ötrü üzürlü olması fərz edilərsə, belə olan təqdirdə həmin adamın küfr sözü deməyə məcbur edilən şəxs kimi qəlbində imana sahib olması ilə birgə onu dilə gətirməməsi mümkün olacaq.Uca Allah buyurur: *"Qəlbi imanla sabit qaldığı halda (haqqı danmağa) məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır."*[56][57]

---

[55] Məcmu`əl-fətəva:7/609.

[56] ən-Nəhl:106.

[57] Məcmu`əl-fətəva:7/219.Şeyxul-İslamın başqa yerdə bəyan etdiyi kimi məcburiyyət halında İslamı izhar etməkdən qorxan şəxsin daxilində şəhadəti dilə gətirməsi gərəkdir yaxud həmin şəxs etibar etdiyi şəxsin yanında gizlincə bunu dilə gətirməlidir.(Məcmu`əl-fətəva:14/121)

*Bildiriş*:

Şəhadət deyildiyi zaman, burada sadəcə "Lə iləhə illəllah" kəlməsinə dair daxildə elm və əminliyin olmasını xəbər vermək məqsədi durmur.Bunun həmçinin əməl etməni və tabeçiliyi ifadə edən tərzdə olması labüddür.Bu səbəbdən, yəhudilərin və başqalarının Peyğəmbərin (salləllahu aleyhi və səlləm) Allahın elçisi olması ilə bərabər "Lə iləhə illəllah" kəlməsini etiraf etmələri onlara fayda verməmişdir. Çünki bu, onun şəriətinə riayət etmə və tabeçilik hasil olmadan sadəcə xəbər vermək yolu ilə olmuşdur.

Şeyxul-İslam (rahiməhullah) buna dair demişdir: "Həmçinin yəhudilərdən bir dəstə insan Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hüzuruna gəlib: Biz şahidlik edirik ki, sən Peyğəmbərsən,-demişlər. Ancaq onlar bununla müsəlman olmamışlar.Çünki onlar öz daxilində olanı xəbər verərək bunu demişlər.Yəni: Biz bilirik və qəti əminik ki, sən Allahın Elçisisən.Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Elə isə nə üçün mənə tabe olmursunuz? Onlar: Biz yəhudilərdən qorxuruq,- deyə cavab verdilər.

Bununla da, bilinmişdir ki, insan daxilində olanı xəbər verməsilə bərabər riayət etmə və tabeçiliyi ifadə edən tərzdə imanı dilə gətirməyincə onun həmin şeyi sadəcə bilməsi və xəbər verməsi iman deyil.Munafiqlər bunu yalan sayaraq xəbər vermişlər.Onlar daxildə kafir idilər.Bunlar isə həmin sözə riayət etməyərək və tabe olmayaraq onu demiş və həm zahirdə həm də daxildə kafir olmuşlar."[58]

[58] Öncəki mənbə:7/561.

Həmçinin demişdir: “Habelə həmin yəhudilər və başqaları dediyi kimi biliyə sahib olub dandığı üçün mömin olmayan birisi: Muhamməd Allahın Elçisidir!-deyərsə bu, sırf onların elminə uyğun gələn xəbəri ifadə edəcək.Uca Allah eləlləri haqqında buyurur: *“Kitab verdiyimiz şəxslər onu öz oğullarını tanıdıqları kimi tanıyırlar. Həqiqətən də, onlardan bir dəstə haqqı bilə-bilə gizlədir.”*[59]Onlara adi elm fayda vermədiyi kimi həmçinin adi xəbər fayda verməmişdir.Daxildə olan elm ilə mütləq onun tələbatı olan sevgi, təzim, tabeçilik və buna bənzər əməllər bir arada yer almalıdır. Həmçinin zahiri xəbərlə birgə onun tələbatı olan təslimçilik, boyun əymə və itaətin özəyi bir arada gəlməlidir.”[60]

İbnul Qayyim (rahiməhullah) Nəcran nümayəndə heyətinin əhvalatına əlavə edərək demişdir:“Orada olan faydalardan: Kitab əhlindən olan kahinin Peyğəmbərin (salləllahu aleyhi və səlləm) Allahın Elçisi olduğunu iqrar etməsi, Peyğəmbərə itaət edib ona tabe olmayana qədər onu İslama daxil etməmişdir. O, iqrar etdikdən sonra onun dinindən tutunacağı təqdirdə bu, onu İslamdan çıxarmaz.Buna oxşar, iki yəhudi aliminin ona üç məsələ haqqında sual vermələrini göstərmək olar. Peyğəmbər (salləllahu aleyhi və səlləm) onların suallarına cavab verdiyi zaman onlar: Biz şahidlik edirik ki, sən Peyğəmbərsən,-dedilər.O, dedi: Elə isə sizə mənə tabe

---

[59] əl-Bəqərə:146.

[60] ət-Tis`iniyyə:2/673.Şeyxul-İslamın zahirdə “itaətin özəyi”nin vacibliyinə və izah edilmiş mürəkkəb gerçəyin hissələrinin bir arada gəlməsinin labüdlüyünə dair sözlərinə diqqət yetir! Şeyxul-İslam burada “itaətin özəyi” adlandırdığı sözü digər yerdə “əməllərin cinsi” deyə adlandırır.Buna dair geniş söhbət zahir ilə daxil arasında olan bağlılıq və əməli tərk edənin hökmü zamanı açılacaq.

olmağa nə mane olur? Onlar: Yəhudilərin bizi öldürmələrindən qorxuruq,-dedilər.[61]Lakin onlar bununla İslama girmədilər. Buna oxşar hadisə əmisi Əbu Talibin ona inanması və onun dininin bəşəriyyətin ən xeyirli dini olduğuna şahidlik etməsi olmuşdur.Lakin bu şahidlik onu İslama salmamışdır.

Tarix və sabit xəbərlərdə bir çox kitab əhlinin və müşriklərin Peyğəmbərin (salləllahu aleyhi və səlləm) risalətinə və sadiqliyinə şahidlik etmələrinə lakin bu şahidliyin onları İslama daxil etmədiyinə diqqət yetirən şəxs anlayacaq ki, İslam tamamilə fərqlidir və o, ancaq bilik yaxud bilik və iqrardan ibarət deyil.Həmçinin bilik, iqrar, boyun əymə, zahirdə və daxildə Ona itaət edib dininə riayət etməkdən ibarətdir."[62]

## *Şəhadəti dilə gətirməklə İslamın sabit olması:*

Yuxarıda qeyd edilənlərdən, kafirin şəhadəti dilə gətirdiyi zaman imtahan olunmayana və İslam ayinlərini yerinə yetirməyənə qədər müsəlman hökmündən kənar qalacağı anlaşılmamalıdır.Əksinə İslam və himayə adi tələffüzlə gerçəkləşmiş olur.Daha sonra bunu dilə gətirən şəxsdən həqiqi işlər və sözünü doğrulayan əməllər tələb

[61] Əhməd:18117.Nəsai:4078.Tirmizi:2733.Tirmizi demişdir: Həsən, səhihdir. Safvən bin Assəldən gələn hədisdir.Həmin hədisdə qeyd edilir ki, onlar açıq-aydın doqquz möcüzələr haqqında soruşmuşlar.Habelə Hakim "əl-Mustədrək:20" kitabında hədisi rəvayət edib demişdir: Hədis səhihdir və biz heç bir vəchlə orada illətin olduğunu bilmirik.Buxari və Muslim isə hədisi rəvayət etməmişlər.Zəhəbi "ət-təlxis" kitabında demişdir: "İllətli olduğunu bilmədiyimiz səhih hədisdir.Zəif Tirmizidə olduğu kimi Şeyx Albani hədisi zəif saymışdır.Habelə "əl-musnəd" kitabının təhqiqçisi Şueyb əl-Ərnaut hədis haqqında demişdir: Abdullah bin Sələmənin zəif ravi olması səbəbilə hədisin isnadı zəifdir.

[62] Zədul məad:3/558.Miftəhu-d-dəri-s-səadəti:1/93.

olunacaq.Məsələnin kökü məhz budur.Lakin bəzən iki yəhudi alimi haqqında qeyd etdiyimiz kimi şəhadəti dilə gətirməklə kafirin öz dini üzərində qalmasına və İslama riayət edib ona daxil olmaqdan imtina etməsinə dəlalət edən amillər bir arada yer alır.[63]

Kafir "Lə iləhə illəllah" kəlməsini dedikdə ona İslam hökmünü vermək müsəlmanlar arasında icma olan məsələdir.

İbnul Qayyim (rahiməhullah) demişdir: "Müsəlmanlar icma etmişlər ki, kafir "Lə iləhə illəllah Muhammədun rasulullah" kəlməsini deyəcəyi zaman İslama daxil olacaq və haqq şəhadətə şahidlik etmiş olacaq."[64]

İbn Rəcəb əl-Hənbəli (rahiməhullah) demişdir: "Zəruri elm ilə bilinir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) onun hüzuruna gəlib İslama daxil olmaq istəyən hər bir kəsdən yalnız şəhadəti qəbul edir və bununla onun qanını himayə edib onu müsəlmanların sırasına qatırdı.Artıq o, Usamə bin Zeydin "Lə iləhə illəllah" deyənin üzərinə qılınc qaldırıb onu öldürməsini pisləmiş və sərt şəkildə ona irad tutmuş-

[63] Şeyx Abdullah bin Humeyd demişdir: "Bu həmçinin, bir çox vaxtlarda bu dinin doğru olmasına dair araşdırmalar və tədqiqatlar yazan bəzi şərqşünaslar yaxud astronomik elmlərlə məşqul olan bəzi şəxslər tərəfindən deyilir.Onlar Qurani Kərimin ecazkarlığını gördükləri zaman bunu dilə gətirir, eyni zamanda öz ata-babalarının dinində qalırlar. Belə şəxslər müsəlman olaraq vəsf edilə bilməz.Çünki onlar bu dinə boyun əyməmiş və ona təslim olmamışlar.Onların araşdırmaları onlara heç bir fayda verməyəcək və onlara yalnız həsrət və axirət əzabını artıracaqdır.Bundan Allaha pənah aparırıq.(Şərhu kəşfi-ş-şubuhat:76-cı səh)

[64] Mədaricu-s-səlikin:3/452.Bu icmanı ibn Hazm kərramilərlə münaqişə zamanı iqrar edib demişdir: Bu, səhih icmadır.(əl-Fisal:3/115)

dur.O, İslama girmək üçün gələnə namaz və zəkata riayət etmək şərti qoymamışdır."

Həmçinin demişdir: "Adicə şəhadət kəlməsi onu deyəni himayə edir və bununla da o, müsəlmana çevrilir. Müsəlmanların xeyirinə və əleyhinə olanlar həmçinin ona aid olur.Əgər şəhadəti dilə gətirən şəxs, bu dayağlardan hər hansı bir şeyi pozarsa, güc-güvvətə malik camaat halında olacaqları təqdirdə savaşa məruz qalacaqlar".

Həmçinin demişdir: "Əgər insan şəhadəti iqrar edərsə hökm baxımından müsəlmana çevriləcək.Əgər o, bununla İslama daxil olarsa İslamın digər tələblərini yerinə yetirməyə vadar ediləcək."[65]

Bütün bunlar Allahın təkliyini yaxud Peyğəmbərin (salləllahu aleyhi və səlləm) risalətini yaxud hər ikisini danmaqla küfr edən hər bir kəs üçün ümumidir. Bundan başqa şeylərdə küfr edənin İslamı isə yalnız dandığı şeyi iqrar etməklə hasil olur.Əgər o, Muhammədin (salləllahu aleyhi və səlləm) risalətini iqrar edib onun bütün aləmlər üçün göndərilməsini inkar edərsə Muhammədin (salləllahu aleyhi və səlləm) bütün məxluqat üçün Allahın elçisi olduğuna şahidlik etməyincə yaxud şəhadətə sahib olduğu halda İslam dininə zidd gələn bütün dinlərdən uzaqlaşmayınca onun İslamı sabit olmaz.

Əgər o, fərzi danmaqla mürtəd olarsa dandığı şeyi iqrar edib şəhadəti təkrar dilə gətirməyincə müsəlman olmaz. Çünki o, etiqad etdiyi şeydə Allahı və Peyğəmbərini təkzib

[65] Cəmiul ulum vəl hikəm:1/228-230.

etmişdir.Habelə əgər o, Peyğəmbəri (salləllahu aleyhi və səlləm) yaxud Allahın kitabından bir ayəni yaxud kitablardan bir kitabı yaxud Allahın mələyi olaraq bilinən bir mələyi danarsa yaxud haramı halal sayarsa müsəlman olması üçün dandığı şeyi iqrar etməsi gərəkli olacaq.[66]

Bununla da, bəzi ifratçıların bir şəxsi yoxlayıb onu imtahana çəkməmiş ona müsəlman hökmünü verməkdən boyun qaçırmalarının batilliyi bəlli olur.Bu isə daha ağır və böyük bidətdən irəli gəlir: İnsanlarda əksi üzə çıxmayınca onların əsli küfrdür,-sözüdür.Heç şübhəsiz ki, bu, batil sözdür.Əgər kafirə sadəcə şəhadəti dilə gətirdiyinə görə müsəlman hökmü verilirsə, şəhadət gətirməklə yaxud namaz qılmaqla yaxud valideynlərinə və ya birinə aid edilməklə İslama bağlılığı sabit olan və imanı pozan heç bir amilə düşməyən kəs necə olsun?[67]

Bu etiqadı dönüklüyün müqabilində başqa bir dönüklük yaxud daha çirkini durmaqdadır.Bu, "Lə iləhə illəllah" kəlməsini deyənin İslamın bütün buyuruqlarını buraxacağı yaxud onu pozacaq amilləri işlədəcəyi halda belə onun qanı və malının himayə ediləcəyini iddia etməkdir.Bu səbəbdən alimlər bəyan etmişlər ki, adı çəkilən himayənin davamiyyətli olması İslamı pozan amillərin tərkinə dayanır.

Şeyx Həmd ibn Nasir bin Mə`mər (rahiməhullah) demişdir: "Alimlərimiz demişlər: Əgər kafir "Lə iləhə illəllah"

---

[66] əl-Muğni, libni Qudəmə:9/28.Raudatu-t-talibin, li-n-nəvəvi:8/282.

[67] "Təvaqquf" və "təbəyyun" bidətinə rəddiyə məzmunlu, habelə hökmü islamı sabit edən amilləri bəyan edən məsələlərə dair şeyx Adil bin Muhamməd əş-Şeyxaninin yazdığı "qavaidu fi bəyani haqiqətil imən ındə əhli-s-sunnə vəl cəmaa" kitabına bax. Çox gözəl və faydalı kitabdır.

kəlməsini deyərsə artıq qanını himayə edəcək dairəyə qədəm qoyacaq və onun rahat buraxılması vacib olacaq.Əgər bunu tamamlayarsa onun himayəsi gerçək mərhələyə qədəm qoyacaq, əks halda puça çıxacaq.Belə ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) hər hədisi ona münasib vaxtda söyləmişdir.O, demişdir: Mən insanlar ilə, onlar "Lə iləhə illəllah" kəlməsini deyənə qədər savaşmağa əmr olundum".[68] Müsəlmanlar bilməlidirlər ki, müsəlmanlarla savaşan kafir bu kəlməni deyərsə o, rahat buraxılar və onun qanı və malı himayə altında olar.Daha sonra Peyğəmbər (salləllahu aleyhi və səlləm) başqa bir hədisdə bəyan etmişdir ki, döyüş, iki şəhadətə və iki ibadətə qədər uzanır.O, demişdir: "Mən insanlar ilə onlar: Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur və Muhamməd Onun Elçisidir,-deyənə, habelə namaz qılıb zəkat verənə qədər savaşmağa əmr olundum."[69] Sadəcə iqrarın insanı davamiyyətli surətdə himayə etdiyinə dair şübhə yaranmasın deyə Peyğəmbər (salləllahu aleyhi və səlləm) himayənin dolğunluğunun və kamilliyinin yalnız bununla əldə olunacağını bəyan etmişdir.Bəzi səhabələr bu şübhəyə düşdüyü zaman Əbu Bəkr (r.a) həmin məsələni izah etmiş və nəticədə səhabələr bunu qəbul etmişlər."[70]

Şeyx Abdur-Rəhman bin Həsən (rahiməhullah) demişdir: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm): "Allahdan savayı ibadət olunanları inkar etməlidir"[71],-sözü, böyük şərtdir və "Lə

---

[68] Yuxarıda qeyd edilib.
[69] Buxari:25.Muslim:22.İbn Ömər rəvayət etmişdir.
[70] əd-Duraru-s-səniyyə:10/309-310.
[71] Muslim:23.Hədisi Tariq əl-Əşcai rəvayət etmişdir.Onun ləfzu belədir: Hər kim "lə iləhə illəllah" deyib Allahdan qeyri ibadət olunanı inkar edərsə onun malı və qanı haram olar.Onun sorğu-sualı isə Allaha aiddir.

iləhə illəllah" kəlməsi yalnız onun (həmin şərtin) olacağı təqdirdə doğru olacaq.Əgər bu şərt olmazsa "Lə iləhə illəllah" kəlməsini deyənin qanı və malı himayə altında olmaz.Çünki "Lə iləhə illəllah" kəlməsinin mənası budur.İnsan həmin sözə dəlalət edən mənanı, şirki buraxmağı, ondan və onu edəndən uzaq durmağı həyata keçirtməsə o, ona fayda verməz.Əgər o, Allahdan savayı hər bir ibadət olunanı inkar edər, ondan uzaqlaşar və bunu edənlərə qarşı düşmən kəsilərsə qanı və malı himayə edilən musəlmana çevrilər.Uca Allahın kəlamı məhz bunu ifadə edir:*"Hər kəs tağutu inkar edib Allaha iman gətirərsə, heç vaxt qırılmayan ən möhkəm dəstəkdən yapışmış olar. Allah Eşidəndir, Biləndir."*[72]Artıq səhih hədislərdə "Lə iləhə illəllah" kəlməsi ağır şərtlər ilə şərtlənmişdir. Onların hər birini, söz, etiqad və əməldə gerçəkləşdirmək gərəkdir."[73]

***Üçüncü*: Qəlb əməli:**

**O, niyyət və iradədir."Həmçinin Allaha və onun əmrinə boyun əymək, Onu Uca tutmaq, Ona rəğbət duymaq, Ondan qorxmaq, Ona ümid bəsləmək, Onu və Ondan gələnləri sevmək, Ondan ötrü nifrət etmək, təvəkkül,** səbr, razılıq, rəhm, həya, Allaha, Peyğəmbərinə, kitabına nəsihət etmək, bütün əməllərdə ixlaslı olmaq və başqa qəlb əməlləri."[74]

Şeyx ibn Useymin (rahiməhullah) demişdir: "Əməldə ixlas olduğu kimi qəlb əməli, onun hərəkətə gəlməsini və istəyini ifadə edir.Qəlb əməli budur.Həmçinin təvəkkül, ümid və

[72] əl-Bəqərə::256.

[73] əd-Duraru-s-səniyyə:2/243.

[74] əl-İmən, libni Mandəh:2/362.

qorxu.Əməl sadəcə qəlbdə olan sabitlik deyil həmçinin qəlbdə yer alan hərəkətdir."[75]

Bunun imana girməsinə dəlil aşağıdaki ayələrdir.Uca Allah buyurur: *"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar, yalnız öz Rəbbinə təvəkkül edər, namaz qılar və Bizim onlara verdiyimiz ruzidən (Allah yolunda) xərcləyərlər. Onlar həqiqi möminlərdir. Onlar üçün Rəbbi yanında dərəcələr, bağışlanma və bolluca ruzi vardır."*[76] Habelə buyurur: *"Möminsinizsə, onlardan qorxmayın, Məndən qorxun!"*[77] Habelə Uca Allah buyurur: *"Əgər möminsinizsə, Allaha təvəkkül edin!"*[78]

Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İman yetmiş və bir neçə yaxud altmış və bir neçə şöbədən ibarətdir.Onun ən fəzilətlisi "Lə iləhə illəllah" kəlməsi, ən aşağı olanı isə yoldan əziyyət verən şeyləri yığışdırmaqdır.Həya həmçinin imandan bir şöbədir."[79]

Həya qəlb əməllərindəndir.Bu hədis, həmçinin dil sözünün və bədən əməllərinin imandan olmasına dəlalət edir.

Cəhm və onun ardıcıllarından savayı ümmətin bütün firqələri qəlb əməllərini imana daxil edirlər.

---

[75] Şərhul vasitiyyə:2/637.
[76] əl-Ənfəl:2-4.
[77] Ali İmran:175.
[78] əl-Maidə:23.
[79] Buxari:9.Muslim:35.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Burada məqsəd ümmətin bütün firqələrinin qəlb əməllərindən olan şeyləri (imana) daxil etmələridir.Üstəlik murciələrin bütün firqələri bunu deyir.O ki qaldı mötəzilə, xəvariclər və hədis əhli olan Əhli sunnəyə, onların buna dair sözləri məlumdur.Bu məsələdə çəkişənlər yalnız Cəhm bin Safvana tabe olan murciələrdir.Bu söz, kərramilərin: İman sadəcə dil sözüdür,- dediyi kimi misli görünməyən sözlərdəndir.Buna həmçinin böyük diqqət ayırmaq gərəkdir. İman məsələsinə dair danışanların bir çoxu əməlləri imana daxil edirlərmi? O, söz və əməldirmi? Düşünürlər ki, çəkişmə sadəcə bədən əməllərindədir və söz dedikdə yalnız dil sözü qəsd edilir.Bu, yanlış fikirdir.Çünki imanı etiqad etmədən adicə sözün olması müsəlmanların yekdilliyi ilə iman deyil."

Nəhayət demişdir: "Həmçinin Allahı sevməyən və Onu təzim etməyən, üstəlik Allaha və elçilərinə nifrət edən qəlbin təsdiqi müsəlmanların yekdilliyi ilə iman deyil."[80]

Həmçinin demişdir: "Çünki qəlbin, biliklə birgə tabeçiliyi vacibdir və bu, Quran, sunnə və ümmətin icmasının dəlilləri ilə aşkardır, sabitdir.Üstəlik bu, İslam dinində zəruri olaraq bilinən məsələdir.Cəhmilərdən qəlb tabeçiliyinin imandan olmasına dair çəkişənlər kərramilərdən qəlb biliyinin imandan olmasına dair çəkişənlər mislindədirlər."[81]

---

[80] Məcmu`əl-fətəva:7/550.İrəlidə fəqih murciələrin məzhəbinə və onların qəlb əməlini isbat etməkdə mövqeyinə dair açıqlama gələcək.

[81] Öncəki mənbə:7/398.

Həmçinin demişdir: "Ümumilikdə qəlbdə olan imanda Allahın və Elçisinin təsdiqi və sevgisi olmalıdır.Çünki Allahı və Elçisini bəyənməməklə və Allaha və Elçisinə düşmənçilik bəsləməklə birgə adi təsdiq müsəlmanların yekdilliyi ilə iman deyil.Adi təsdiq və bilik yalnız qəlbin həsəd və təkəbbürlük kimi əngəllərindən azad olacağı təqdirdə sevgini gərəkli edəcək."[82]

Əgər qəlbdə sevgi, istək, qorxu və ümid yer alarsa bunun nəticəsi olaraq bədənin hərəkətə gəlməsi qaçılmaz olacaq. Şeyxul-İslam (rahiməhullah) buna dair buyurur: "Daha sonra qeyd edildiyi kimi qüdrət ilə birgə tam sevgi, bədənin zahiri söz və zahiri əməl ilə zəruri olaraq hərəkətə gəlməsini vacib edir.Əgər biri Allahı və Elçisini təsdiq edib Onu və Elçisini sevməzsə, Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) sevməyənə qədər mömin olmaz.Qəlbdə təsdiq və sevgi yer alacağı zaman bunun nəticəsi olaraq zəruri surətdə bədənin zahiri sözlər və zahiri əməllər ilə hərəkətə gəlməsi labüd olacaq.Bədəndə aşkara çıxan söz və əməllər qəlbdə olanın gərəkli ünsürü, zəruri amili, dəlili və nəticəsidir."[83]

Bu mövzuya dair ətraflı məlumatlar zahir ilə daxil arasında olan bağlılıq bölümündə gələcək.

***Dördüncü*: Bədən əməlləri:**

Əhli sunnə ilə murciələr arasında olan mübahisə mövzusu məhz budur.Belə ki, bütün murciələr, qəlb əməllərini imana daxil etsələr belə, bədən əməllərini imana

---

[82] Məcmu`əl-fətəva:7/537.

[83] Öncəki mənbə:7/541.

daxil etmirlər.Bu onların yanlışlığıdir.Çünki bədən əməlləri qəlb əməllərindən ayrılmazdır.Qəlbdə Allaha sevgi, qorxu və ümidin yer alması sonra bunun təsirinin bədən əzalarında üzə çıxmaması qeyri-mümkündür.Bu səbəbdən Şeyxul-İslam demişdir: "Murciələr zahiri əməli imandan çıxartmışlar.Qəlb əməllərini həmçinin ondan çıxartmaq istəyən və onu yalnız təsdiq edənlər, açıq-aydın zəlalətdədirlər. Zahiri əməli çıxartmaq istəyənlərə deyiləcək: Zahiri əməl daxili əmələ sıx bağlıdır və ondan ayrılmazdır.Zahirin yoxluğu daxilin yoxluğuna dəlalət edir.Yerdə qalan çəkişmə zahiri əməlin "tədammun" yolu ilə (bir hissəsi olması etibarı ilə) iman anlamından bir hissəyə dəlalət etməsi yoxsa iman anlamının zəruri amili olması ətrafındadır.Habelə onların əməli çıxartmaları qəlb əməllərini həmçinin çıxartıqları təəssüratını yaradır.Bu isə qəti şəkildə batildir.Çünki hər kim Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təsdiq etdiyi halda ona qəlb və bədən ilə nifrət və düşmənçilik edərsə zəruri olaraq kafir olar.Əgər onlar qəlb əməllərini imana daxil etsələr yenə də xəta edəcəklər.Çünki bədən hərəkəti olmadan qəlbdə imanın yer alması qeyri-mümkündür."[84]

Bədən əməllərinin imandan olmasına dəlil.Uca Allah buyurur:*"Halbuki onlara, dini məhz Allaha məxsus edərək, hənriflər kimi ibadət etmək, namaz qılmaq və zəkat vermək əmr olunmuşdu. Doğru din də elə budur."*[85] Habelə buyurur: *"Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən, sonra*

[84] Məcmu`əl-fətəva:7/554-556.
[85] əl-Bəyyinə:5.

*heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə cihad edənlərdir! (İmanlarında) sadiq olanlar da məhz onlardır."*[86]

Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) Abdul-Qeys nümayəndə heyətinə demişdir: "Sizə Allaha iman gətirməyi əmr edirəm.Allaha imanın nə olduğunu bilirsinizmi? Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına şahidlik etmək, namaz qılmaq, zəkat vermək və qənimətin beşdə birini verməkdir."[87] Həmçinin buna dair bir çox başqa dəlillər var.

əl-Əcurri (rahiməhullah) demişdir: "Bilin ki,-Allah sizə və bizə rəhm etsin- mən Quranı nəzərdən keçirib orada qeyd etdiklərimə əlli altı yerdə rast gəlmişəm və Allahın möminləri bir tək iman ilə cənnətə daxil etmədiyini, əksinə onları Öz rəhməti və müvəffəq etdiyi iman və saleh əməl ilə cənnətə saldığını görmüşəm.Burada: İman bilgidir,- deyənlərə, həmçinin: Əməl olmasa belə iman, bilgi və sözdür,- deyənlərə cavab vardır.Bunu deyəndən Allaha sığınırıq."[88] Daha sonra buna dair bir çox mövzular nəql etdi.

Buradan məlum olur ki, murciələrin bu mövzuda zəlalətə düşmələrinə səbəb Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) kəlamına dair bilikdən üz çevirib ixtira etdikləri yollara və müddəalara etimad göstərmələri olmuşdur.Quran və sunnədə isə imanın həqiqəti bəyan edilir.Belə olan halda insanın ərəb dili qaydalarını dəlil

---

[86] əl-Hucurat:15.

[87] Buxari:7556.Muslim:17.Hədisi ibn Abbas (r.a) rəvayət etmişdir.

[88] əş-Şəria, lil-əcurri:2/619.

gətirməsi, istifadə formalarına əsaslanması və buna bənzər işlərə baş vurması gərəksizdir.

Şeyxul-İslamın bu məsələyə dair önəmli və bənzərsiz sözü mövcuddur.Onun buna dair dediyi sözlərin bir hissəsini burada qeyd etmək yerinə düşərdi.Belə ki, o demişdir: "Bilinməlidir ki, Quran və hədisdə mövcud olan sözlərin təfsiri və Peyğəmbər (salləllahu aleyhi və səlləm) tərəfindən qəsd edilənlər bilinərsə bu işdə dilçilərin və başqalarının sözlərini dəlil gətirməyə ehtiyac qalmaz.Bu səbəbdən fəqihlər demişlər: Adlar üç növdür: Namaz və zəkat kimi tərifi şəriətlə bilinən növ, günəş və ay kimi tərifi dildə bilinən növ, əli sıxma və yaxşılıq sözləri kimi adətən bilinən növ.

Artıq Peyğəmbər (salləllahu aleyhi və səlləm) namaz, zəkat, oruc, həcc və digər sözləri bəyan etmiş və bu sözlərdə Allahın və Peyğəmbərin qəsdini açıqlamışdır. Həmçinin şərab və başqa sözlər bura daxildir.Bu yol ilə onların mənası bilinir.Əgər biri həmin sözləri Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bəyan etmədiyi tərzdə açıqlamaq istəyərsə bu ondan qəbul edilməz.Həmin sözlərin əmələ gəlməsi və dəlalət etdiyi məna haqqında söz açmaq, "bəyan elmi"qəbilindən bir işdir.Əhkamların səbəbini qeyd etmək elmdə əlavə fayda və Quran ləfzlərində olan hikmətin bəyan olmasıdır.Lakin onda olan məqsədi bilmək bu məsələyə dayanmır.

İman, islam, nifaq və küfr adları bütün bunlardan daha böyükdür.Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bu sözlərdə olan məramı bəyan etməsi sözlərin əmələ gəlmə qaydalarını

və ərəblərin istifadə formalarını və sayira işləri əsas tutmağı ehtiyacsız etmişdir.Bu səbəbdən həmin adların tərifinə dair Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bəyan etdikləri sözə qayıtmaq gərəkdir.Heç şübhəsiz ki, bu, dolğun və yetərlidir."[89]

Daha sonra bidət əhlinin üslubunu və onların düşdüyü zəlalətin səbəbini bəyan edib demişdir: "Bidət əhlinin bu hala düşməsinə səbəb onların həmin yoldan üz çevirib İslam dinini, doğru hesab etdikləri və ləfzlərdən çıxan anlam yaxud ağıldan doğan mənalar daşıyan müddəalar (müqəddimələr) üzərində qurmaları olmuşdur.Onlar Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bəyanı haqqında düşünmürlər.Allahın və Elçisinin bəyanına müxalif olan bütün müqəddimələr zəlalət olur.

Misal üçün murciələr Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) kəlamı haqqında bilgidən boyun qaçırdıqları zaman imanın, islamın və qeyrisinin məfhumları haqqında özlərinin ixtira etdikləri tərzdə danışmağa başlamışlar.Misal üçün onlar demişlər: Ərəb dilində iman təsdiq deməkdir. Peyğəmbər (salləllahu aleyhi və səlləm) isə insanlara yalnız ərəblərin dilində müraciət etmiş və ona heç bir dəyişiklik gətirməmişdir.Bu səbəbdən onun iman sözündə məqsədi təsdiqdir.Daha sonra demişlər: Təsdiq isə yalnız qəlb və dil ilə olur yaxud qəlb ilə olur.Bu səbəbdən əməllər imandan deyil.İmanın təsdiq olmasında onların əsas olaraq tutduqları

---

[89] Məcmu`əl-fətəva:7/286.

dəlil Uca Allahın bu ayəsidir: “و ما أنت بمؤمن لنا : *Onsuzda sən bizə inanan deyilsən*”[90]yəni, bizi təsdiq edən deyilsən.

Onlara deyiləcək: İman adı Quranda və hədislərdə digər sözlərdən daha çox təkrarlanmışdır.O, dinin özəyidir. İnsanların zülmətdən nura çıxması, xoşbəxtlə bədbəxt,dost ilə düşmən arasında fərqin qoyulması onunla müəyyənləşir. Bütün din ondan əsas götürür.Hər bir müsəlman onu bilməyə möhtacdır.Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bütün bunları diggətsiz qoyub bəyan etməməsi və həmin məsələni qeyd edilən iki müddəaya (müqəddiməyə) buraxması inandırıcı və doğru ola bilərmi?

Məlumdur ki, onların imanın təsdiq olmasına dair gətirdikləri əsaslar Qurandan alınmışdır. Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) iman sözünün mənasına dair mütəvatir nəql edilənlər digər kəlmələrə dair gələn nəqllərdən daha böyük olmuşdur.Çünki bütün ümmət imanı bilməyə ehtiyac duyur və bu səbəbdən onu nəql edirlər.Hər hansı bir surədə gələn kəlmə isə tam fərqlidir.Çünki möminlərin çoxu həmin surəni əzbər bilməzdilər.Bu səbəbdən dinin özəyinin bəyan edilməsini bu kimi müddəalara qurmaq olmaz.Bundan ötrü çəkişmələr və Allahın düz yolundan çıxıb başqa yollar tutanların qarışığlığı çoxalmış bunun nəticəsində onlar dinlərini parça-parça edib firqələrə bölünmüş və açıq-aydın öyüdlər gəldikdən sonra parçalanıb ixtilafa düşmüş insanlara çevrilmişlər.Bu ümumi və mütləq bir sözdür.

---

[90] Yusuf:17.

Daha sonra belə deyiləcək: Həmin müddəaların hər ikisi yasaqdır.İman sözünün təsdiq sözü ilə həmmənа olduğunu kim demişdir? Fərz et ki, həmin söz bu yerdə istifadə ediləcəyi təqdirdə məna baxımından doğru olacaq.Lakin sənin: O söz həmmənalıq anlamını gərəkli edir,-sözünü deməyinə nə əsas verir?”[91]

Daha sonra Şeyxul-İslam imanın təsdiq ilə həmmənа olmadığını bəyan etmək üçün bir neçə əsas qeyd edib demişdir: “İkinci müddəaya gəldikdə isə deyilməlidir ki, əgər onun təsdiq sözünə həmmənalığı fərz edilərsə belə olan halda onların: Təsdiq yalnız qəlbdə yaxud dildə olur, sözlərinə iki cavab veriləcək:

*Birinci cavab*: Bu, qəbuledilməzdir.Çünki əməllər həmçinin təsdiq adlanır.Səhih (Muslimdə) Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə deməsi rəvayət edilir: “Gözlər zina edir, onların zinası isə baxışdır.Qulaq zina edir, onun zinası isə dinləməkdir.Əl zina edir, onun zinası isə toxunuşdur.Ayaq zina edir, onun zinası isə (zinaya) getmə-sidir.Qəlb arzulayır və istəyir zəkər (cinsiyyət üzvü) isə bunu ya təsdiq edir ya da ki, təkzib edir.”[92]

Həmçinin dilçilər, sələf və sonraki nəsillərdən bir çox insanlar bunu demişlər.

---

[91] Məcmu`əl-fətəva:7/288-290.

[92] Muslim:2657.Hədisi Əbu Hureyra rəvayət etmişdir.Həmin hədisin ləfzi belədir: “Adəm övladına zinadan payı təqdir edilmişdir. Həmin şəxs mütləq öz nəsibinə yetişəcəkdir. Gözlər zina edir və onların zinası baxışdır.Qulaq zina edir və onun zinası dinləməkdir.Əl zina edir və onun zinası toxunuşdur.Ayaq zina edir və onun zinası (zinaya) getməsidir.Qəlb arzulayır və istəyir zəkər isə bunu ya təsdiq edir ya da ki, təkzib edir.(Buxari:6245.Bir qədər müxtəsər şəkildə rəvayət etmişdir.)

*İkinci cavab*: Əgər onun özəyi təsdiq olarsa bu, xüsusi təsdiq olacaq.Buna misal namazın xüsusi dua olması, həccin xüsusi qəsd olması, orucun xüsusi tərk etmə olmasıdır.Bu təsdiqin, istifadə zamanı anlamına daxil olan özünə məxsus zəruri amilləri vardır.Həmin zəruri amilin yoxluğu daxili özəyin yoxluğunu qaçılmaz edir.Belə olan təqdirdə çəkişmə ləfzi çəkişmə olaraq: İman əmələ "tədəmmün" yolu ilə (yəni, əməlin imanın bir hissəsi olması etibarı ilə) yoxsa "lüzum"yolu ilə (yəni, zəruri amil olması etibarı ilə) dəlalət edir?-məsələsinə çevrilir."[93]

Həmçinin demişdir: "Artıq murciələr bu özəydə Quran, sunnə, səhabələr və onlara gözəl şəkildə tabe olanların bəyanından kənar çıxmış və öz görüşlərinə və ərəb dilindən anladıqları yozumlara etimad göstərmişlər.Bu, bidət əhlinin üslubudur.Bu səbəbdən imam Əhməd (rahiməhullah) belə deyərdi: İnsanların etdikləri xətaların çoxu yozum və qiyas yönündən olur.

Bu səbəbdən mötəzilə, murciə, rafizi və digər bidət əhlinin Quranı öz görüşlərinə, əqli nəticələrinə və dildən yozduqlarına əsasən təfsir etdiklərini görə bilərsən.Sən onların Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hədislərinə, səhabələrin, tabiinlərin və müsəlmanların imamlarının sözlərinə etimad etmədiklərini görə bilərsən.Onlar nə sunnəyə nə də ki, sələfin icmasına və onlardan gələn əsərlərə etimad göstərmir və yalnız ağıla və dilə etimad göstərirlər. Habelə onların təfsir kitablarına, hədisə və sələfdən gələn xəbərlərə etimad göstərmədiklərini görə bilərsən.Onlar

[93] Məcmu`əl-fətəva:7/293-297.

ancaq ədəbiyyat və başçılarının qoyduqları kəlam kitablarına etimad göstərirlər.Bu, həmçinin dinsizlərin üslubudur.Onlar yalnız fəlsəfə kitablarında, ədəbiyyat və dil kitablarında olanları qəbul edirlər.Quran, hədis və əsər kitabları isə onların diqqətindən kənardır. Bunlar peyğəmbərlərin xəbərlərindən üz çevirirlər.Çünki onlara görə həmin xəbərlər elmi ifadə etmir. Onlar Peyğəmbərdən,(salləllahu aleyhi və səlləm) habelə səhabələrdən gələn əsərləri tərk edib Quranı öz görüşlərinə əsasən yozurlar.Artıq Əhmədin və digər şəxslərin bunu pisləmələrini və bunu bidət əhlinin üslubu etmələrini qeyd etmişik.Əgər sən onların tutunduqları əsaslara fikir versən görərsən ki, onların gətirdikləri, dəlilsiz iddialardan başqa bir şey deyil."[94]

[94] Öncəki mənbə:7/118.

## Dördüncü araşdırma:

## İmanın özəyi və şaxəsi

İman zahiri və daxili söz və əməldən ibarət bir gerçəkdir. Bununla belə onun özəyi və şaxəsi mövcuddur.Onun özəyi qəlbdə, şaxəsi isə bədən əzalarında öz əksini tapır.Belə ki,qəlbdə söz və əməl olaraq iman yer alacağı təqdirdə zəruri surətdə bədənin mümkün olan zahiri söz və əməl ilə hərəkətə gəlməsi labüd olacaq.

Həmçinin Əhli sunnədən bəziləri imanın özəyinin qəlb sözünü, qəlb əməlini və dil sözünü şamil etdiyini demişlər. Onlardan bəziləri isə özəyin qəlb çərçivəsindən kənar çıxmadığını demişlər.

Dil sözünün şaxə adlandırılması onun yoxluğunun zərər verməyəcəyini və onsuz imanın doğru olacağını ifadə etmir. Əksinə o, zəruri şaxədir.Onun yoxluğu isə daxili özəyin yoxluğuna dəlalət edir.Habelə zahiri əməl daxili imanın zəruri amili və onun ayrılmaz hissəsidir.Onun yoxluğu isə qəlbdə imanın qalmayacağına dəlalət edəcək.Məlum olur ki, şaxə özəyin zəruri amili, ona dəlalət edən və onu səhih edən ünsürdür.

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) Əhli sunnənin məzhəbini və onların imanı özəy və şaxəyə böldüklərini bəyan edib demişdir: "Bütün səhabələr, habelə tabiinlər, Əhli sunnənin imamları, hədis əhli, habelə Malik, Səuri, Əuzai, Hamməd bin Zeyd, Şafii, Əhməd bin Hənbəl və

başqaları kimi fəqih və sufilərin cumhurundan olan Əhli sunnə val cəmaat, habelə kəlam əhlindən olan təhqiqçilər hamılıqla iman və dinin söz və əməl olduğuna yekdil olmuşlar.

Məzhəblərinə açıqlama gətirənlər demişlər: İmanın özəyi və şaxəsi vardır.İman həcc, namaz və digər adlı ibadətlərdə olan müstəhəblər və dayaqlar mislində olmayan dayaq və vaciblərdən ibarətdir."[95]

İbn Mandəh (rahiməhullah) özəy və şaxəni bəyan edərək demişdir: "Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) möminlərə və imana dair çəkdiyi məsəlin qeyd edilməsi.Uca Allah buyurur: *"Allahın necə bir məsəl çəkdiyini görmürsənmi? Xoş bir söz kökü yerdə möhkəm olub budaqları göyə ucalan gözəl bir ağac kimidir."*[96] Uca Allah burada iman kəlməsini misal çəkib onu özəyə və hər bir vaxt bəhrəsini gətirən şaxəyə bölmüşdür.

Daha sonra Peyğəmbər (salləllahu aleyhi və səlləm) sunnədə imanı açıqlamışdır.O, Allahın kəlamını məhz bu cür anlamış və imanın şöbələrdən ibarət olduğunu xəbər vermişdir.Bu şöbələrin ən üstünü, "Lə iləhə illəllah" kəlməsinə şahidlik etməkdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) qəlb və dil ilə iqrar etməyi imanın özəyi əməlləri isə onun şöbələri etmişdir."[97]

Dedim: İbn Mahdəh burada dil sözünü imanın özəyinə daxil etmişdir.

---

[95] Məcmu` əl-fətava:12/471.

[96] İbrahim:24.

[97] Əl-iman, libni Mandəh:2/350.

Şeyxul-İslam isə bir çox yerlərdə qəlbdə olanı imanın özəyi bədəndə aşkar olanı isə onun şaxəsi edir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İmanın özəyi qəlbdə olan imandır.Onda iki şeyin olması labüddür: Qəlbin təsdiqi, habelə iqrar və biliyi.Buna habelə qəlbin sözü deyilir.Cuneyd bin Muhamməd demişdir: Tövhid qəlbin sözü, təvəkkül isə qəlbin əməlidir.

Beləliklə aydın olur ki, qəlb sözü və əməlinin onda olması labüddür.Daha sonra bədənin sözü və əməli gəlir. Habelə onda Uca Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) sevmək, Allahdan qorxmaq, Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sevdiklərini sevmək, Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bəyənmədikləri şeylərə nifrət etmək, əməlləri xalis Allaha aid etmək, qəlbin yalnız Allaha təvəkkül etməsi və Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) vacib buyurduğu və onları imandan etdiyi başqa əməllər kimi qəlb əməllərinin olması labüddür.Daha sonra bilinməlidir ki, qəlb özəydir.Orada bilik və istək olacağı zaman bu, zəruri şəkildə bədənə sirayət edəcək.Bədənin qəlbdə olan istəklərdən kənar qalması qeyri-mümkündür."[98]

Həmçinin demişdir: "Qəlbdə Onun təsdiqi və Ona olan sevgi yer alacağı zaman bunun nəticəsi olaraq bədənin zahiri sözlər və əməllər ilə hərəkətə gəlməsi zəruri surətdə gərəkli olacaq.Bədəndə üzə çıxan söz və əməllər qəlbdə olanın gərəkli ünsürü, zəruri amili, dəlili və nəticəsidir.Həmçinin

[98] Məcmu`əl-fətava:7/186.Ondan sonra gələnə dair "cəmiul məsəil" kitabına bax:5/247.

bədəndə öz əksini tapan söz və əməllərin qəlbdə olana birbaşa təsiri vardır.Onlardan hər biri digərinə öz təsirini göstərir.Lakin qəlb özəy bədən isə şaxədir.Şübhəsiz ki, şaxə özəydən əsas götürür.Özəy isə şaxə ilə möhkəmlənir və güclənir."[99]

Həmçinin demişdir: "Peyğəmbərlərin Allahdan gətirdikləri dini, onu təsdiq edərək və ona boyun əyərək iqrar etmək imanın özəyidir.İnsan bu özəyi gerçəkləşdirməsə mömin olmaz."[100]

Şeyxul-İslam (rahiməhullah) qəlb sözünün dil sözünün özəyi olduğunu, habelə qəlb əməlinin bədən əzaları ilə edilən əməlin özəyi olduğunu bildirmişdir.

İbn Teymiyyə (rahiməhullah) demişdir: "Belə ki, qəlbin etiqadı dil sözünün özəyidir.Qəlb əməli isə bədən əzaları ilə edilən əməlin özəyidir."[101]

Həmçinin demişdir: "İmanın bu iki özəydən ibarət olması gərəkdir: Haqqın təsdiq edilməsi və ona sevginin olması.Biri sözün özəyi digəri isə əməlin özəyidir."[102]

Həmçinin demişdir: "Etiqadın ardınca dil sözü gəlir. Qəlb əməlinin ardınca isə namaz, zəkat, oruc, həcc və digər bədən əməlləri gəlir."[103]

---

[99] Məcmu`əl-fətava:7/541.
[100] Məcmu`əl-fətava:12/474.
[101] Məcmu`əl-fətava:13/234.
[102] Məcmu`əl-fətava:7/540.Təsdiq dilin özəyi olsa belə, qəlbin sevgisi həmçinin onu və əməli tələb edir.Şeyx bunu "məcmu` əl-fətava:7/541" kitabında bu cür ifadə etmişdir: "Sonra, qüdrət ilə bərabər olan dolğun sevgi zəruri olaraq zahiri söz və zahiri əməl ilə bədənin hərəkətə gəlməsini tələb edir".

Dedim: Şeyxul-İslam yuxarıda qeyd edilən yerlərdə dil sözünü imanın şaxəsi etmişdir.

Lakin Şeyxul-İslam bəzən dil sözünün şaxə olduğuna qəti əminlik ifadə etmir və məsələni ehtimallara buraxır. Şeyx sanki onun imanın özəyi olduğunu deyənlərə uyğun söz söyləyir: "Mömin, qəlbi və bədən əzaları ilə Allaha iman gətirən şəxsdir.Onun imanı, qəlbinin elmi ilə qəlbinin halı arasında, qəlbinin təsdiqi ilə qəlbinin itaəti arasında cəm edir.Habelə imanın özəyi qəlbdə yaxud qəlb və dildə olduğu halda belə dil sözünü və bədən əməllərini cəm edir.İnsanın qəlbində Allahı təsdiq etmənin və Ona təslimçiliyin olması labüddür.Biri qəlbinin sözü digəri isə Allahı iqrar etmə olan qəlb əməlidir."

Nəhayət demişdir: "Əgər bura həmçinin dil sözü və bədən əməli daxil olarsa, belə olan halda səhih şaxələrin varlığı özəylərin varlığını gərəkli edəcək.Bu bəlli məsələdir və burada onun haqqında geniş danışmaq məqsədi güdülmür."[104]

## *Qəlbin sözü ilə əməli arasında olan bağlılıq:*

Nəfsi istək, lovğalıq və həsəd kimi üstün gələn əngəllərin olmayacağı təqdirdə tam (səhih) təsdiqin qəlb əməlini vacib və gərəkli etməsi əsasdır.

---

[103] Məcmu`əl-fətava::7/672.

[104] Məcmu`əl-fətava:2/382.Dedim: İrca şübhəsinə düşən bəzi şəxslər iddia etmişlər ki, zahiri əməlin bütövlüklə tərk edilməsi imanın səhihliyinə qəti təsir etmir.Çünki əməl özəy deyil şaxədir.Onların diqqətindən dil sözünün həmçinin şaxə olması yayınmışdır.İrəlidə bu şübhəyə ətraflı cavab veriləcək.

Şeyxul-İslam (rahiməhullah) artıq bu məsələni ətraflı izah edərək demişdir: "Həmin bu təsdiqin ardınca qəlb əməli gəlir.Bu isə Allahı və Peğəmbəri sevmək, Allahı və Peyğəmbəri təzim etmək, Peyğəmbərə yardım edib sayğı göstərmək, Allahdan qorxmaq, Ona tövbə etmək, Ona qarşı səmimi olmaq və Ona təvəkkül etmək və digər şeylərdir.Bütün bu qəlb əməlləri imandandır.Nəticəni gərəkli edən səbəb tək həmin əməlləri gərəkli edən təsdiq və etiqad vardır."[105]

Həmçinin demişdir: "İmanın özəyi qəlb təsdiqi olsa belə həmin təsdiqin qəlbdə müəyyən əhvallar və onun üçün əməllər gərəkdirməsi labüddür.Bu isə Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təzim etmək, ona sayğı göstərmək və onu sevməkdir.Bu, ağrı və həzz verici hissiyyat zamanı ağrı və həzz kimi, həmçinin xoş və xoşagəlməz hissiyyat zamanı ikrah və istək kimi gərəkli olan bir işdir.Qəlbdə həmin hal və əməl hasil olmayacağı təqdirdə həmin təsdiq ona heç bir fayda verməyəcək və heç bir şeydə onun dadına çatmayacaq. Bunun hasil olmasına isə ancaq Peyğəmbərə (salləllahu aleyhi və səlləm) qarşı olan həsəd yaxud təkəbbürlük yaxud ona qarşı olan laqeydsizlik və qəlbin ona qarşı soyuması kimi əngəllər mane olur.Çünki xoş və xoşagəlməz şeyin idrak edilməsi həzz və ağrını gərəkli edir və buna yalnız müəyyən amillər əngəl olur.Bu səbəbdən hər hansı bir əngəl hasil olacağı zaman bu təsdiqin varlığı yoxluğu kimi olacaq.Üstəlik həmin əngəl qəlbin əhvalı olan"mə`lul"un (illət nəticəsində ortaya gələnin) yoxluğunu gərəkli edəcək.Onun yoxluğu

[105] Məcmu`əl-fətava:7/672.

səbəbilə isə illət (səbəb) olan təsdiq yoxa çıxacaq və nəticədə iman bütövlüklə qəlbdən ayrılacaq."[106]

Həmçinin demişdir: "Elm əməlin, habelə iradənin, sevginin və digər şeylərin özəyidir.O, isə öz növbəsində hər hansı bir əngəl olmayacağı təqdirdə onu gərəkdirəcək.Haqqı bilmək ona tabe olmağı vacib edir və buna yalnız nəfsi istəklərə uyma, lovğalıq və digər şeylər kimi mümkün əngəllər mane ola bilər.Uca Allah belə şəxslərin halı haqqında belə demişdir: *"Haqsız olaraq yer üzündə təkəbbürlük göstərənləri ayələrimdən uzaqlaşdıracağam. Onlar bütün möcüzələri görsələr də onlara inanmazlar. Onlar doğru yolu görsələr, ora yönəlməz, azğınlıq yolunu görsələr, onu özlərinə yol seçərlər."*[107] Habelə buyurur: *"Buna qəti inandıqları halda, haqsızcasına və təşəxxüslə onları dandılar."* Habelə buyurur: *"Əslində onlar səni yalançı hesab etmirlər. Lakin zalımlar Allahın ayələrini inadla danırlar."*[108] Habelə Uca Allah buyurur: *"Ey Davud! Biz səni yer üzündə xəlifə təyin etdik. Elə isə insanlar arasında ədalətlə hökm ver, nəfsin istəyinə uyma, yoxsa o səni Allahın yolundan azdırar."*[109] Habelə digər ayələr.Uca Allah insanları fitrət üzərə yaratmışdır.İnsan həmin fitrət üzərə olacağı zaman fəsaddan salamat qalar haqqı gördükdə isə ona tabe olub onu sevər."[110]

---

[106] əs-Sarimul məslul:3/966.

[107] əl-Əraf:146.

[108] əl-Ənam:33

[109] Sad:26.

[110] Məcmu`əl-fətava:15/240.Bax: məcmu`əl-fətava:2/382,7/537.

### *Qəlb əməlinin yoxluğu zamanı təsdiqin yoxa çıxması ətrafında*:

Əgər sual qoyulub: Bir şəxsdə lovğalıq, həsəd və bu kimi əngəllər olacağı zaman qəlb əməli və ona tabe olan zahiri söz və əməl olmazsa həmin şəxsin təsdiqi yox olacaqmı?- deyilərsə,

Cavab olaraq deyiləcək: Təsdiq qalacağı təqdirdə belə həmin təsdiqin heç bir dəyəri olmayacaq.Şeyxul-İslamın bəzən qəlb əməlinin yoxluğu ilə təsdiqin yox olacağına yaxud mövcud olmayacağına dair varid olan ifadələrində məqsədi, iman olan faydalı təsdiqin yoxa çıxmasıdır.Artıq qeyd edilmişdir ki, müsəlmanların yekdil görüşünə görə qəlb əməlini gərəkli etməyən təsdiq iman ola bilməz.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Təsdiqlə bərabər müəyyən qədər Allah sevgisinin və Allah qorxusunun olması labüddür.Bundan heç bir şey olmayacağı təqdirdə mövcud olan təsdiq ümumiyyətlə iman olmayacaq.Üstəlik bu, firon, yəhudilər və iblisin təsdiqi mislində olacaq."[111]

Həmçinin demişdir: "İblis, firon, yəhudilər və onlara bənzər olanların küfrünün əsası təsdiq və elm yoxluğu cəhətindən olmamışdır.Belə ki, iblis xəbəri digər bir şəxsdən almamışdır. Onun Adəmə səcdə etməsini Uca Allah Özü əmr etmişdir.O, isə boyun qaçırıb lovğalıq etdi və kafirlərdən oldu.Onun küfrü təkzib səbəbilə deyil, boyun qaçırma və təkəbbürlük və bundan irəli gələn amillər səbəbilə olmuşdur.Həmçinin firon və onun tayfası daxilən yəqin

[111] Məcmu`əl-fətava:7/307.

olduqları halda dikbaşlıq və zalımlıq üzündən onu rədd etdilər. Musa onlara dedi: *“Sən artıq bilirsən ki, bunları yalnız göylərinvə yerin Rəbbi, açıq-aşkar möcüzə olaraq endirdi.”*[112] Burada iki məsələdən biri deyilə bilər:

Deyilə bilər ki, boyun qaçırma, lovğalıq, həsəd və digər şeylər iman olan elm və təsdiqin yoxluğunu gərəkli edən küfrdür.Çünki əgər bir şəxsin elmi və təsdiqi tam olarsa bu, imkan daxilində təslimçiliyi və itaəti vacib edər.Eynilə qəti iradə,imkan olan yerdə məqsədin varlığını gərəkli edir.Bəlli olur ki, imkan olan yerdə müəyyən məqsədin yoxluğu qəlbdə istək və iradənin yoxluğuna dəlalət edər.Həmçinin təsdiq və elmin qəlb sevgisi və tabeçiliyi kimi amillərdən kənar olacağı zaman qəlbdə hasil olanın təsdiq və elm olmadığına bir göstərici olacaq.Ancaq burada bir şübhə və şəkk vardır.Bunu bəzi insanlar dilə gətirirlər.Bu, Cəhm, Salihi və məşhur olan görüşdə Əş`arinin, habelə Qadı Əbu Bəkr və ona tabe olanlar tək əksər əshabının sözlərinin əsasıdır.Onlar daxili və zahiri əməlləri imanın özü deyil onun gərəkli ünsürü edir və imanı aparan şeyləri təsdiqin zəruri amillərindən edirlər.Belə olan halda küfrlə bərabər daxili təsdiqin olması heç bir vəchlə təsəvvür edilmir.[113]

---

[112] əl-İsra:102.

[113] Cəhm və ona müvafiq gələnlər iddia etmişlər ki, nass və icmada hər hansı bir şəxsin küfrünə dair gələn xəbərlər onların qəlbində təsdiqin yoxa çıxması səbəbilə olmuşdur.Bununla da, onlar iddia etmişlər ki, iblis, firon, Əbu Cəhl və onların tayları elm, bilik və təsdiq sahibləri olmamışlar.Şübhəsiz ki, bu söz, inadkarlıq və həmin şəxslərin təsdiq və elmə sahib olmalarına dəlalət edən açıq-aydın nasslara müxalif olmaqdır.Bununla beləsahib olduqları təsdiq həmin şəxslərə fayda vermədi. Çünki onun ardınca tabeçilik, təslimçilik və sevgi kimi onu tələb edən amillər öz təsdiqini tapmadı. Aşağıda cəhmiyyənin iman və küfr anlamına dair gətirlilən açıqlamaya bax.

Yaxud da deyilə bilər ki, bəzən qəlbdə haqqa dair olan elm və təsdiq hasil olur lakin qəlbdə olan həsəd, lovğalıq və sayira amillər qəlbin təslimçiliyinə, tabeçiliyinə və sevgisinə əngəl olur.Ancaq bu, əməl ilə olan iradə kimi deyil.Çünki imkan olan yerdə iradə, məqsədi gərəkli edir.Ancaq əməl etməyə imkanın olması ilə birgə haqqın bilinməsi və onun təsdiq edilməsi heç də həmin əməlin edilməsini vacib etmir.Çünki mütləq bununla bərabər haqqı istəmək və sevmək labüddür."

Nəhayət demişdir: "Qəlbin həsəd və lovğalıq kimi əngəllərdən xilas olması istisna adicə təsdiq və elm, sevgini gərəkli etmir.Nəfs haqqa rəğbətli olaraq yaradılmışdır.Məhz o da, ona münasibdir.Sağlam qəlblər üçün isə Allahdan daha sevimli heç bir şey yoxdur.Məhz bu, Allahın xəlil seçdiyi İbrahimin hənif dinidir.Uca Allah buyurur:*"O gün ki, nə var-dövlət, nə də oğul-uşaq bir fayda verməyəcək.Ancaq sağlam bir qəlblə Allahın hüzuruna gələnlərdən başqa!"*.[114]

Adicə elm, heç də bilinənə qarşı sevginin hasil olmasını gərəkdirmir.Sevgi ancaq nəfsdə bilinənə uyğun digər bir qüvvənin yer alacağı zaman hasil olacaq.Həmin qüvvə isə nəfsdə mövcud olur."

Daha sonra demişdir: "Əgər biri Allaha və Peyğəmbərə (salləlahu aleyhi və səlləm) düşmən kəsilərsə, habelə Allaha və Peyğəmbərə (salləlahu aleyhi və səlləm) zidd gələrsə bu, onun Allahı və Peyğəmbəri (salləlahu aleyhi və səlləm) xeyirlə anmasından və sevgini gərəkli edən anmadan üz cevirdiyini

[114] əş-Şuara:88-89.

tələb edəcək və həmin şəxsin Ona dair elmi zəifləyəcək və hətta bəzən olduğu kimi Onu unutması ilə nəticələnəcək. Uca Allah buyurur: *“Allahı unudan, buna görə də (Allahın) onları özlərinə unutdurduğu kəslər kimi olmayın!”*.[115] Habelə buyurur: *“Qəlbini Bizi anmaqdan xəbərsiz etdiyimiz, nəfsinin istəklərinə uyan və işləri səmərəsiz olan bir kimsəyə itaət etmə!”.*[116] Bəzən nifrət və ədavətlə bərabər təsdiq və elm hasil olur.Lakin həmin təsdiq və elm zəif olur.Əgər nifrət və ədavət olmasa idi bu (təsdiq və elm) Allahın və Peyğəmbərin sevgisini gərəkli edər və insanı möminə çevirərdi.İmanın şərtlərindən tam elmin mövcudluğudur.”[117]

Həmçinin demişdir: “İblis, firon, yəhudilər və onlar mislində olanların canında qərar tutan küfr, habelə təşəxxüs və həsəd arzusu onlara Allahı sevməyə və imanın yalnız

---

[115] əl-Haşr:19.

[116] əl-Kəhf:28.

[117] Məcmu`əl-fətava:7/534-538.Şeyxul-İslam demişdir: “İmanın şərtlərindən dolğun elmin mövcudluğudur”.Burada elm yaxud təsdiqə şərt sözü, yəni səhihlik şərti şamil olunur.Həmçinin orada “dolğun” sözü səhih və yetərli olana şamil olunur.Bu cür üslub Şeyxul-İslamın əksər sözlərində öz əksini tapır.Bunun isbatı “əl-imanu ət-təmm” sözünə verilən izah zamanı qeyd ediləcək.Həmçinin şeyx (rahiməhullah)digər bir yerdə dil sözünün imanın səhihliyi üçün şərt olduğunu ifadə etmişdir.Şeyx dedi: İkinci: Camaatın etiqadına görə üzürsüz yerə imanı dilə gətirməyən şəxsə qəlbində olan bilik fayda verməz və buna qadir olanın həmin sözü deməsi imanın səhihliyi üçün şərtdir.(əs-Sarimul məslul:3/974).Gizli deyil ki, qəlbin elmi və dilin sözü imandan olan və Şeyxul-İslam və digərlərinə görə onun mahiyyətinə daxil iki hissədir.Bu isə, bir şeyin mahiyyətindən olana şərtlik təbirini şamil etməyin keçərli olduğunu ifadə edir.Belə ki, bəzi fəqihlər niyyəti namazın səhihlik şərtlərindən saymışlar, digərləri isə onun ərkanlarından.(əl-İnsaf:2/19,bax).Həmçinin hənəfilər və hənbəlilər orucluq niyyətini orucun səhihlik şərti, maliki və şafiilər isə ərkanı saymışlar.(əl-məusuatul fiqhiyyə əl-kuveytiyyə:23/113,bax). Bu üzdən burada rükn yaxud şərt deyildiyi zaman; bir şeyin səhihliyinin onun mövcudluğuna dayandığını ifadə edir.Onun mahiyyətinin xaricində yaxud daxilində olması məsələsinə gəldikdə isə qeyd etmək lazımdır ki bu, keçərli bir termindir.

onunla tamamlanacağı[118] qəlbin Allaha ibadət etməsinə mane olmuşdur.Bunun nəticəsi olaraq qəlbdə küfr olan Allahın rızasına nifrət və Onu qəzəbləndirən işlərə tabeçilik əmələ gəlmişdir.Bununla birgə isə elm heç bir fayda vermir."[119]

Zahir, daxil üçün söz və əməl olaraq gərəkli olduğu və təsdiqin yalnız əngəllər aradan qalxacağı və seviləni sevimli edəcək mənanın olacağı təqdirdə sevgini gərəkli edəcəyi məlum olduğu zaman bu cür demək yanlış olar: Təsdiq iman anlamına daxil olan bütün şeyləri vacib edir.Şeyxul-İslam bu məsələyə diqqət çəkərək demişdir: "İmanda bu iki əsasın olması labüddür: Haqqı təsdiq etmək və onu sevmək.Biri sözün digəri isə əməlin əsasıdır.Habelə imkan olan halda tam sevgi, qeyd edildiyi kimi bədənin zahiri söz və əməl ilə zəruri şəkildə hərəkətə gəlməsini gərəkdirir.Əgər bir şəxs, adicə elmi və təsdiqi iman anlamına daxil olan bütün şeylərin və iman adlanan hər bir şeyin gərəkli ünsürü edərsə yanlış fikir yürütmüş olar. Çünki elm ilə bərabər sevginin olması labüddür. Həyat elm üçün şərt olduğu kimi həmçinin elm sevilənə qarşı olan sevgi üçün şərtdir.Lakin bilgiyə sahib olan ilə bildiyi arasında sevilməyə əsas olacaq məna olmayacağı təqdirdə bir şeyi bilmək və onun sabit olduğunu təsdiq etmək sevgini gərəkdirməyəcək.Bu səbəbdən insanlar bir çox şeylərin sabit olduğunu təsdiqləyir və bilir bununla bərabər ona nifrət bəsləyirlər.Bir şeyin varlığını təsdiq etmək onu sevməyi tələb etmir.Lakin Uca Allah sevilib

[118] Burada qeyd edilən "tamamlıq" həmçinin səhihliyi ifadə edir.
[119] Məcmu`əl-fətava:7/562.

ibadət edilməyə, habelə Ondan ötrü Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sevilməsinə layiqdir.Qəlblərdə elmi və təsdiqi tələb edən məna olduğu kimi habelə onda Onun sevgisini və itaətini tələb edən məna vardır.Əgər bir şəxs Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təsdiq edib Allahı və Peyğəmbəri sevməzsə, Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) sevməyənə qədər mömin olmaz.Nəhayət qəlbdə Onun təsdiq edilməsi və Ona olan sevgi yerləşəcəyi zaman bunun nəticəsi olaraq bədənin zəruri şəkildə zahiri söz və əməllər ilə hərəkətə gəlməsi gərəkli olacaq."[120]

---

[120] Məcmu` əl-fətəva:7/541.Zahir ilə daxil arasında olan bağlılığa, onun tərifinə, dəlillərinə və murciələrin ona olan mövqeyinə dair irəlidə müstəqil araşdırma yer alacaq.

# Beşinci araşdırma:

## İmanın artması və azalması

Əhli sunnə imanın artıb azalmasına, itaətlə artıb asiliklə azalmasına dair icma etmişlər.Onlar buna bir çox dəlillər gətirmişlər.Həmin dəlillər bunlardır: Qurani Kərimin altı yerində imanın artması açıq bildirilir.

Uca Allah buyurur: *"O kəslər ki, xalq onlara: "Camaat sizə qarşı (qüvvə) toplamışdır, onlardan qorxun!" -dedikdə, (bu söz) onların imanını daha da artırdı və onlar: "Allah bizə bəs edər. O nə gözəl vəkildir!" -deyə cavab verdilər."*[121]

Habelə buyurur: *"Möminlər yalnız o kəslərdir ki, Allah adı çəkiləndə ürəkləri qorxudan titrəyər, Allahın ayələri oxunduğu zaman həmin ayələr onların imanlarını daha da artırar, onlar ancaq öz Rəbbinə təvəkkül edərlər."*[122]

Habelə buyurur:*"Bir surə nazil edildiyi zaman onlardan: "Bu sizin hansınızın imanını artırdı?"- deyənlər də var. Möminlərə gəlincə, o, onların imanını artırar və onlar sevinərlər."*[123]

Habelə buyurur:*"Möminlər ordu hissələrini gördükdə dedilər: "Bu, Allahın və Peyğəmbərinin bizə olan vədidir.*

[121] Ali İmran:173.
[122] əl-Ənfəl:2.
[123] ət-Təubə:124.

*Allah və Peyğəmbəri düz buyurmuşlar!" Bu (vəziyyət) onların yalnız imanını və təslimçiliyini artırdı."*[124]

Habelə buyurur: *"Möminlərin imanı üstünə iman artırmaq üçün onların ürəklərinə arxayınlıq göndərən Odur. Göylərdəki və yerdəki ordular Allahın ixtiyarındadır. Allah biləndir, hikmətlidir!"*[125]

Habelə buyurur:*"Kitab verilənlərin yəqinlik hasil etməsi, iman gətirənlərin imanının daha da artması..."*[126]

"Beləliklə, Uca Allah Quranın altı yerində imanın artmasını açıq bildirir.Bu isə imanın artmasına dəlalət edən ən aydın və aşkar dəlillər, üstəlik, ən böyük dəlillərdir."[127]

Sufyan bin Uyeynə (rahiməhullah) imanın artıb azalması haqqında soruşulduğu zaman belə demişdir: "Məgər siz bir neçə yerdə "*onların imanını artırar*", "*onların doğru yolunu artırarıq*" ayələrini oxumursunuz? Ona deyildi: Bəs azalması? O, dedi: Artmayan elə bir şey yoxdur ki, azalmasın".[128]

Qeyd olunmalıdır ki, Qurani Kərim imanın artmasına açıq-aydın, onun azalmasına isə dolayı yolla dəlalət edir. Çünki artan elə bir şey yoxdur ki, azalmaya məruz qalmasın.

Sunnədə isə imanın azalması açıq bildirilir.Buxari və Muslim Əbu Səid əl-Xudrinin (r.a) belə dediyini rəvayət

---

[124] əl-Əhzəb:22.
[125] əl-Fəth:4.
[126] əl-Muddəssir:31.
[127] Ziyədətul imən və nuqsanuhu:39-cu səh.
[128] əş-Şəria, lil-əcurri:2/605,240-cı rəqəm.əl-İbənə, libni Batta:2/850,1142-ci rəqəm.

edirlər: "Peyğəmbər (salləllahu aleyhi və salləm) qurban yaxud fitr bayramı zamanı namazgaha çıxıb qadınların yanından keçdiyi zaman dedi: "Ey qadınlar toplumu, sədəqə verin! Həqiqətən, mən sizi cəhənnəm əhlinin çoxu olduğunuzu gördüm.Qadınlar dedilər: Nəyə görə belədir ey Allahın elçisi! Peyğəmbər (salləllahu aleyhi və salləm) dedi: Çünki siz çoxlu lənət edir ərlərə qarşı nankorluq edirsiniz.Kamallı kişinin ağlını siz tək daha çox aparacaq ağlı və dini naqis birisini görmədim.Qadınlar: Bizim dinimizin və ağlımızın naqisliyi nədədir, ey Allahın elçisi?-deyə soruşdular. Peyğəmbər (salləllahu aleyhi və salləm) dedi: Qadının şahidliyi kişinin şahidliyinin yarısı mislində deyilmi? Qadınlar: Elədir!-deyə cavab verdilər.Peyğəmbər (salləllahu aleyhi və salləm) dedi: Bu, onların ağıl naqısliyindəndir.Sonra dedi: Qadın heyzli olduğu zaman namazı və orucu tərk etmirmi? Qadınlar: Tərk edir!-deyə cavab verdilər.Peyğəmbər (salləllahu aleyhi və salləm) dedi: Bu, onların dininin naqisliyindəndir."[129]

Habelə Peyğəmbər (salləllahu aleyhi və salləm) şəfaət hədisində demişdir: Cəhənnəmdən qəlbində arpa dənəsi çəkisində xeyir olub"lə iləhə illəllah" kəlməsini deyən çıxarılacaq. Habelə cəhənnəmdən qəlbində buğda dənəsi çəkisində xeyir olub "lə iləhə illəllah" kəlməsini deyən çıxarılacaq.Habelə cəhənnəmdən qəlbində zərrə qədər xeyir olub "lə iləhə illəllah" kəlməsini deyən şəxs çıxarılacaq."[130] Bu hədis, insanların imanda bir-birindən fərqli və üstün olduqlarını açıq-aydın isbat edir.

---

[129] Buxari:304.Muslim:80.Hədisi Əbu Səid əl-Xudri (r.a) rəvayət etmişdir.Muslim həmin hədisi ibn Ömərdən (r.a) rəvayət etmişdir.
[130] Buxari:44.Muslim:193.Hədisi Ənəs (r.a) rəvayət etmişdir.

Habelə imanın artıb azalmasına dair icma etdikləri məsələdə Əhli sunnənin etimad göstərdiyi digər dəlillər vardır.

İbn Batta (rahiməhullah) demişdir: "Bilin ki,-Allah sizə rəhm etsin- Uca Allah kitabında rəhm edəcək şəxsləri qeyd etdiyi və xoşbəxt olmasını istədiyi şəxslərə iman əta etmiş ardından möminləri imanda bir-birindən üstün etmişdir.Uca Allah onlardan bir qismini digərlərindən daha üstün etmiş daha sonra onlarda olan imanın bilik və itaət ilə artıb güclənəcəyinə, habelə qəflət və asiliklə azalıb kiçiləcəyinə yol açmışdır.Allahın endirdiyi Quranda, varid olan sunnədə və ümmətin imamlarından olan ağıl sahiblərinin icmasında məhz belə gəlmişdir.Buna isə yalnız qəlbi xəstə, gözü kor və şeytanların oyuncağına çevrilmiş murdar murciə etiraz edə bilər.Uca Allah belə şəxslər haqqında buyurmuşdur: "*(Şeytanlar) öz qardaşlarında azğınlığı artırarlar. Sonra da onlardan əl çəkməzlər.*"[131][132]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Səhabələrdən imanın artıb azalması sabit olmuşdur.Bu, sunnə imamlarının sözüdür.İbn Mubarək (rahiməhullah) belə deyərdi: O, (iman) fərqlənir və artır.Lakin o, azalır sözünü deməkdən çəkinərdi. Habelə imam Malikdən onun azalmasına dair iki rəvayət varid olmuşdur.Qurani Kərimdə imanın artması bir çox yerdə varid olmuş, onun azalmasına isə bir sıra nasslar dəlalət etmişdir.Peyğəmbər (salləllahu aleyhi və salləm) demişdir:

[131] əl-Əraf:202.

[132] əl-İbənə, Iibni Batta:2/832.

“Zinakar zina etdiyi zaman mömin olaraq zina etməz”.[133] Habelə digər dəlillər.Lakin “azalma, nöqsan” ləfzi yalnız Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qadınlar haqqında dediyi sözdə öz əksini tapmışdır: “ağlı və dini naqis”.Peyğəmbər (salləllahu aleyhi və səlləm) qadının din naqisliyini onun heyz zamanı orucu və namazı buraxmasında etmişdir.Bir çoxları da, imanın azalmasına dair məhz bu dəlilə istinad etmişlər. Belə ki, Əhli sunnənin təməlinə əsasən iman iki cəhətdən təfavüt qəbul edir: Uca Rəbbin əmri cəhətindən və qulun etdiyi feli cəhətindən.”[134]

Habelə demişdir: Tabiinlərdən sonra gələn bəzi fəqihlər imanın azalmasına dair deyilən sözlə razılaşmırdılar.Çünki onlar Quranda imanın artmasının qeyd olunub azalmasının isə qeyd olunmadığına rast gəlmişdilər.Bu, imam Malikdən gələn iki rəvayətdən biridir.Ondan gələn və onun əshabından məşhur olan digər rəvayətdə başqa alimlərin dediyi kimi imanın artıb azalması qeyd edilir.Bəzi alimlər isə artıb azalma sözündə üstünlük sözünə meyl etmişlər. Onlardan biri demişdir: Mən imanın üstün və fərqli gəldiyini deyirəm.Bu, ibn Mubarəkdən rəvayət edilir.Onun bu məsələdə məqsədi, çəkişmə baş vermiş ləfzdən, mənasının sabit olmasında şübhə olmayana yönəlmək olmuşdur.[135]

Dedim: Lakin ibn Mubarəkin artma və azalma sözlərini dilə gətirməsi varid olmuşdur.Belə ki, Nəccəd Əli bin Həsən

---

[133] Buxari:2475.Muslim:57.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.
[134] Məcmu`əl-fətəva:13/51.
[135] Öncəki mənbə:7/506.

bin Şəqiqdən rəvayət edib deyir: Abdullah bin Mubarəkin belə dediyini eşitdim: İman söz və əməldir və o, artıb azalır.[136]

Bir sözlə səhabələr, tabiinlər və imamlardan olan sələfin imanın artıb azalması sözünə dair yekdilliyi olmuşdur.

*Onların buna dair bəzi dedikləri:*

1-Muaz bin Cəbəl (r.a) demişdir: "Haydı, oturub bir saat iman edək, yəni Allahı zikr edək."[137]

2-İbn Məsud (r.a) demişdir: "Allahım bizim imanımızı, yəqinimizi və biliyimizi artır!".[138]

3-Cundəb bin Abdullah əl-Bəcəli (r.a) demişdir: "Biz uşaq ikən Peyğəmbərlə (salləllahu aleyhi və səlləm) birgə idik.Biz Quranı öyrənməmişdən öncə imanı öyrəndik.Daha sonra Quranı öyrəndik və onunla imanımız daha da artdı."[139]

4-Umeyr bin Habib (r.a) demişdir: "İman artır və azalır.Ona deyildi: Onun artması və azalması nədədir? O,

---

136 İshaq bin Rahuyənin "əl-musnəd" kitabı:2/670."ziyədətul imən və nuqsanuhu:125-ci səh" kitabından nəql edilir.

137 "əl-İmən", ibn Əbu Şeybə:105,107."əl-İmən",Əbu Ubeyd:20. "əs-sunnə", Abdullah bin Əhməd:1/368,796-cı rəqəm.Buxari həmin hədisi öz səhih kitabında, "buniyəl isləmu alə xams" bölümündə "muallәq" olaraq rəvayət etmişdir."şərhu usuli i`tiqad əhli-s-sunnə:5/1014,1707-ci rəqəm.Hafiz "fəthul bəri" kitabında, habelə Albani "əl-imən libni əbi Şeybə" kitabının təhqiqində həmin hədisi səhih saymışlar.

138 İmam Əhməd iman kitabında Abdullah bin Ukeym vasitəsilə ibn Məsuddan onun belə dediyini rəvayət edir: Allahım bizə...artır.Hafiz "əl-fəth"də demişdir: "İsnadı səhihdir."əs-Sunnə",Abdullah bin Əhməd:1/368,797-cu rəqəm."əş-Şəria", əl-Əcurri:2/585,218-ci rəqəm."əl-İbənə",ibn Batta:2/846,1132-ci rəqəm.

139 İbn Macə:61.əl-Ləlәkai:5/1017,1715-ci rəqəm.Buseyri "misbəhu-z-zucəcə" kitabında demişdir: Bu, səhih isnaddır.Hədisin raviləri isə etibarlı kişilərdir. Şeyx Albani həmin hədisi "sahih ibn Macə"də səhih saymışdır.

dedi: Biz Allahı zikr etdiyimiz və Ona tariflər söylədiyimiz zaman iman artır.Qəflətə düşüb etinasızlıq etdiyimiz zaman isə azalır." Bu, imanın çoxalıb azalmasının isbat edilməsi üçün açıq-aydın sözdür.Bu səbəbdən, ibnul Qayyim (rahiməhullah) belə demişdir: "Səhabələrdən imanın artıb azalmasına dair ən qədim rəvayət edilən söz Umeyr bin Habib əl-Xatminin sözüdür." Daha sonra imam Əhməddən rəvayət edilən əsəri gətirdi.[140]

5-Abdur-Razzəq əs-San`ani (rahiməhullah) demişdir: "Mən Mə`mər, Sufyan əs-Səuri, Malik bin Ənəs, ibn Cureyc, Sufyən bin Uyeynə kimi adamların belə dediklərini eşitdim: İman söz və əməldir və o, artıb azalır."[141]

6-Sufyan bin Uyeynə (rahiməhullah) demişdir: "İman söz və əməldir və o, artır və azalır.Onun qardaşı İbrahim bin Uyeynə ona dedi: Ey Əbu Muhamməd! Sən azalır deyirsən? Sufyan dedi: Sus ey uşaq! Bəli, ondan bir şey qalmayana qədər belə azalır."[142]

---

[140] Bu əsəri imam Əhməd "əl-imən" kitabında, ibn Əbu Şeybə "əl-imən:14" kitabında, Abdullah bin Əhməd "əs-sunnə:1/315" kitabında, əl-Əcurri "əş-şəria:2/583" kitabında rəvayət etmişlər.əş-Şəria kitabının təhqiqçisi demişdir: Əbu Cəfərin babasından eşitməsi sabit olarsa həmin hədisin isnadı həsən olar.Növbəti hədisdə isə onun atasından, onun da babasından rəvayət edildiyi göstərilir.əl-Mizzi və ibn Həcər onun babasından rəvayət etdiyini qeyd etməmişlər. Təhqiqçinin sözü bitir.Onun atası isə: Yezid bin Umeyr adlı şəxsdir.Albani demişdir: Onun tərcümeyi halını tapa bilmədim.Həmin əsəri rəvayət edənlərdən: İbn Batta "əl-ibənə:2/845,1131-ci rəqəm.əl-Ləlakəi: 5/1019,1720-ci rəqəm.İbnul Qayyimin sözlərinə "sunən əbu davud" kitabında gələn izahda bax.

[141] "əs-Sunnə:1/342_726-cı rəqəm, Abdullah bin Əhməd"."əş-şəria:2/606_243-cü rəqəm, əl-Əcurri".Sonuncu kitabın təhqiqçisi demişdir: İsnadı səhihdir.

[142] "Usulu-s-sunnə:41-ci səh, əl-Humeydi." "əl-imən:38, ibn Əbu Ömər əl-Adiyy"."aqidətu-s-sələf əshabil hadis:270-ci səh,əs-Sabuni"."əş-şəria:2/607_244-

7-İmam Əhməd (rahiməhullah) demişdir: İman söz və əməldir və o, artıb azalır."[143]

## *İmanın artma cəhətləri:*

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) bu cəhətləri "əl-imənul kəbir" və "əl-imənul əusət" kitablarında bəyan etmiş, bu məsələyə böyük diqqət ayırmış və həmin cəhətlərdən səkkizini birinci kitabda yeddisini isə ikinci kitabda qeyd etmişdir.İbn Teymiyyənin qeyd etdiyi həmin cəhətlərdən ən önəmlisini qeyd etməklə kifayətlənirəm:

*Birinci cəhət*: Qəlbdə olan təsdiq və elm yığcamlıq və təsilat etibarı ilə fərqli üstünlüyə malik olur. Peyğəmbərin (salləllahu aleyhi və səlləm) xəbərlərini təfsilatı ilə bilmədən Peyğəmbəri yığcam şəkildə təsdiq edənin təsdiqi, Peyğəmbərin xəbər verdiyi Allahın ad və sifətləri, habelə cənnət və cəhənnəm və keçmiş ümmətlər haqqında bilən və onu bütün bu işlərdə təsdiq edən şəxsin təsdiqi kimi deyil. Habelə yığcam şəkildə onun itaətində durub onun əmr etdiklərinin təfsilatını bilmədən ölmüş şəxs bütün bunları ətraflı şəkildə bilib bu işdə ona itaət edənə qədər ömür sürmüş şəxs kimi deyil.

*İkinci cəhət*: Elm və təsdiq mahiyyət etibarı ilə, qüdrət, iradə, eşitmə, görmə, kəlam kimi diriyə məxsus olan digər sifətlərin üstün cəhətlərə malik olması tək üstün və fərqli

---

cü rəqəm, əl-Əcurri".Sonuncu kitabın təhqiqçisi demişdir: İsnadı səhihdir. "əl-ibənə:2/854_1155-ci rəqəm, ibn Batta".

[143] "Məsəilul imam Əhməd:272-ci səh, Əbu Davud"."əş-şəria:3/608_246-cı rəqəm, əl-Əcurri.Sələfin digər sözləri ilə tanış olmaq üçün Lələkəinin "şərhu i`tiqad əhli-s-sunnə:5/1013-1036" kitabına bax.

olur.Məlumdur ki, insanlar hilal ayını (ayparanı) görməkdə fərqlənirlər.Habelə insanlar eşidilən bir səsin idrakında fərqlənirlər.Elə bir diri varlıq yoxdur ki, onun sifətləri, habelə idrak və hərəkət növləri fərqlilik qəbul etməsin, üstəlik bu diri olmayan şeylərin sifətlərində də rast gəlinir. İnsan eşidilən bir şeydə eşitmə, görülən bir şeydə görmə, sevilən bir şeydə sevmə, nifrət bəslənən bir şeydə nifrət qabiliyyətinin hal etibarı ilə fərqli olduğunu daxilində hiss etdiyi kimi bir şeyə dair sahib olduğu elmin hal etibarı ilə fərqli olduğunu daxilində hiss edir.Bu həqiqətlərdə fərqliliyin olduğunu inkar edən şəxs isə boşboğazlıq etmiş olar.

*Üçüncü cəhət*: Qəlb əməllərinin artması və azalması.Hər bir mömin keçirtdiyi duyğu ilə bilir ki, insanlar Allahı və Peyğəmbəri sevmək, Allahdan qorxub ona boyun əymək, Ona təvəkkül etmək, Ona ixlaslı olmaq, riya, lovğalıq, ucb və digər şeylərdən qəlbin xilas olması, varlıqlara qarşı mərhəmətli olmaq, onlara nəsihət etmək və imanla bağlı olan digər əxlaqi davranışlarda bir-birindən fərqlənirlər. Səhih hədisdə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İnsan üç xislətə yiyələnəcəyi zaman imanın şirinliyini dadacaq: Bir şəxsin, Allahı və Peyğəmbəri onlardan savayı olanlardan daha çox sevməsi, bir kəsi sevdiyi zaman onu yalnız Allah üçün sevməsi və atəşə atılmaqdan xoşlanmadığı kimi Allahın onu xilas etməsinin ardından küfrə qayıtmaqdan xoşlanmaması."[144]

---

[144] Buxari:21.Muslim:43.Hədisi Ənəs rəvayət etmişdir.

Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Allaha and olsun ki, mən sizin içinizdə Allahdan ən çox qorxan və Onun qoyduğu sərhədləri ən çox bilənəm.”[145] Habelə demişdir: “Mən sizə övladınız, ata-ananız və bütün insanlardan daha sevimli olmayınca iman gətirmiş olmazsınız.”[146] Ömər (r.a) Peyğəmbərə (salləllahu aleyhi və səlləm) dedi: Ey Allahın elçisi! Sən mənə özümdən savayı hər bir şeydən daha sevimlisən.Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Xeyir, ey Ömər! Mən sənə özündən daha sevimli olmayınca.Ömər dedi: Sən mənə özümdən daha sevimlisən. Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Bax indi ey Ömər!”.[147]

Bu, insanın daxilində hiss etdiyi bir duyğudur.Bəzən insan bir şeyi digər vaxtlarda ona olan sevgisindən daha çox sevir, bəzən bir şeydən digər vaxtlarda qorxduğundan daha çox qorxur.Bu səbəbdən bilik sahibləri, daxildə hiss etdikləri duyğulara əsasən imana artma və azalmanın daxil olduğunu söyləyən ən öndə gedən insanlar olmuşlar.

*Dördüncü cəhət*: Həmin işlərdən hasil olan fərqlilik onu tələb edən səbəblər yönündən irəli gəlir.Əgər birinin təsdiq və sevgi isnadı, yəqinliyi gərəkdirən dəlillər nəticəsində olarsa o, digər səbəblərə görə təsdiqə sahib olan şəxs mislində olmaz.

*Beşinci cəhət*: Zahiri əməllər. İnsanlar bu məsələdə və onun artıb azalması məsələsində fərqli olurlar.İnsanlar ona artma və azalmanın daxil olmasına yekdil olmuşlar.Onların

[145] Buxari:5063.
[146] Buxari:15.Muslim:44.Hədisi Ənəs (r.a) rəvayət etmişdir.
[147] Buxari:6632.Hədisi Abdullah bin Hişam (r.a) rəvayət etmişdir.

çəkişməsi isə yalnız bunun iman anlamına daxil olması ətrafında olmuşdur.Bunu inkar etmiş şəxslər onun imanın səmərəsi və tələbi olduğunu demişlər.Bu etibarla o, imana məcazi surətdə daxil edilmişdir.Bu isə ona görə imanın artıb azalması yəni, səmərəsinin artıb azalması anlamını daşıyır.

*Altıncı cəhət*: Bu işlərdə hasil olan fərqlilik, bunun davamiyyəti və sabitliyi, habelə anılması və göz önünə gətirilməsi cəhətindən gəlir. Habelə naqislik qəflət və üz çevirmə cəhətində hasil olur. Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əshabından olan Umeyr bin Habib əl-Xatmi (r.a) demişdir: "İman artıb azalır.Ona dedilər: Onun artması və azalması nədədir? O, dedi: Biz Allahı zikr etdiyimiz və Ona tariflər söylədiyimiz zaman iman artır.Qəflətə düşüb, unutduğumuz və etinasızlıq etdiyimiz zaman isə azalır."[148]

*Yeddinci cəhət*: Bəzən insan Peyğəmbərin (salləllahu aleyhi və səlləm) xəbər verib əmr etdiyi şeyləri bilmədiyi səbəbilə müəyyən məsələləri təkzib və inkar edir.Lakin əgər həmin insan bunu bilsəydi nə təkzib edər nə də ki, inkar etməzdi. Daha sonra həmin şəxs bir ayə yaxud hədis eşidir yaxud bu haqda düşünür yaxud mənasının açıqlamasını eşidir və nəticədə təkzib etdiyi şeyi təsdiq edir və inkar etdiyi şeyi anlayır.Bu, yeni təsdiq və imanın üzərinə artan yeni imandır. Həmin şəxs bundan öncə kafir deyil cahil olmuşdur."[149]

Həmin bu aşkar cəhətlər artma və azalmanın qəlbin təsdiqi və əməlinə, habelə bədən əməllərinə daxil olduğunu göstərir.

---

[148] Yuxarıda qeyd edilib.

[149] Məcmu`əl-fətəva:7/562-574, 7/232,237.

Dil sözünə gəldikdə isə, əgər onunla imanın dayağı olan şəhadət qəsd edilərsə buna artma və azalma daxil olmaz.Əgər bununla zikr, təsbih, yaxşılığı əmr etmə və pislikdən çəkindirmə və bu kimi dilin digər funksiyaları qəsd edilərsə onun artıb azalması heç də gizli olmayan aydın bir məsələ olacaq.

Şəhadət kəlməsi məsələsi haqqında isə Şeyxul-İslam deyir: "İstisna edilməyən İslam, yalnız dil ilə şəhadətdir.O artmır, azalmır və onda istisna edilmir."[150]

---

[150] Məcmu`əl-fətəva:7/259.

# Altıncı araşdırma:

## İmanda istisna etmək

Mütləq iman, Allahın insana bütün əmr etdiyini etməyi və bütün qadağan etdiyini tərk etməyi şamil etmişdir.Əgər bir şəxs “mən möminəm” sözünü bu baxımdan deyərsə əmr edilən şeyləri edən və qadağan edilən şeyləri tərk edən təqvalı möminlərdən olduğuna dair özü üçün şahidlik etmiş olar.Bu isə insanın özünü təmizə çıxartması və bilmədiyi şeyi özü üçün şahidlik etməsi anlamına gələcək. Əgər onun şahidliyi doğru olsa idi, bu hal üzərə ölməsi ilə cənnətlik olacağına dair özünə şahidlik etməsi gərəkli olardı.Ancaq heç kəs özünün cənnətlik olduğuna şahildik edə bilməz. Onun imanlı olmasına şahidlik etməsi özünün cənnətlik olmasına şahidlik etməsi kimidir.Bu üzdən sələfin məzhəbi bu etibarla imanda istisna etmək olmuşdur.[151]

Şeyxul-İslam (rahiməhullah) demişdir: “İbn Məsud və onun əshabı, əs-Səuri, ibn Uyeynə və Kufə əhlinin çoxu, habelə Bəsrə əhlindən rəvayət etdiyinə əsasən Yəhyə bin Səid əl-Qattan, Əhməd bin Hənbəl və digər sunnə imamları kimi hədis əhlindən olan sələfin məzhəbi imanda istisna etməkdir.Bu, onlardan mütavatir olaraq nəql edilir.Ancaq onların arasında heç kim belə deməmişdir: Mən “الموافاة : muvafət” (insanın öləcəyi halı etibarı ilə) istisna edirəm.Habelə iman yalnız qulun Rəbbi ilə qarşılacağı

[151] Məcmu`əl-fətəva:7/446.

zaman sahib olacağı şeyə verilən addır.Lakin bunların imamları, istisnanın yalnız imanın vaciblərini yerinə yetirməyi şamil etdiyi səbəbilə olduğunu açıq bildirmişlər. Onlar isə özləri üçün xeyirxahlıq və təqva şahidliyi etmədikləri kimi özlərinə bunu şahidlik etmirlər.Çünki bu onların, bilmədiyi işlərdən, elmsiz surətdə özlərini təmizə çıxartmaları sayılır."[152]

Bu məsələyə güc qatan amillərdən imam Əhməddən gələn rəvayətdir.İmam demişdir: Mən imanda istisna etmə məsələsinə dair ibn Məsudun hədisini seçirəm.Çünki iman söz və əməldir.Əməl isə feldir.Artıq biz sözü dilə gətirdik. Lakin biz əməldə səhlənkarlıq etməkdən qorxuruq.Bu səbəbdən mən imanda istisna etməyi bəyənirəm.Biz deyirik: İnşallah mən möminəm."[153]

İbn Məsudun (r.a) hədisindən çıxan anlam: Özünün mömin olduğuna şahidlik edən şəxs özünün cənnətlik olduğuna şahidlik etsin!".[154]

əl-Xalləl, Əbu Davud Süleyman əl-Əş`asın belə dediyini rəvayət edir: Bir kişinin Əbu Abdullaha belə dediyini eşitdim: Mənə: Sən möminsənmi?-deyə sual verdilər, mən isə: Bəli!-deyə cavab verdim.Bu sözdə bir qəbahət varmı? Məgər insanlar ya mömin ya kafir deyillərmi? İmam Əhməd qəzəblənərək belə dedi: Bu, irca məzmunlu sözdür.Uca Allah buyurur: "*Bir qisminin də işi Allaha qalıb*".[155] Bunlar

---

[152] Məcmu`əl-fətəva:7/439.

[153] Məsəil ibn Həni:2/162."əs-sunnə", lil-Xalləl:3/600_1065-ci rəqəm.

[154] "əs-Sunnə", Abdullah bin Əhməd:1/338,341_711,721-ci rəqəm.Lələkəi:5/1048_1779-cu rəqəm.

[155] ət-Təubə:106.

kimlərdir? Daha sonra Əhməd dedi: İman söz və əməl deyilmi? Kişi: Bəli!-dedi. Əhməd dedi: Sözü yerinə yetirdikmi? Kişi: Yerinə yetirdik,-dedi.Əhməd dedi: Əməli yerinə yetirdikmi? Kişi: Xeyir!-dedi.Əhməd dedi: Elə isə bir insanın istisna edib: İnşallah mən mömünəm,-sözünə nə üçün irad tutursan?

Əbu Davud (rahiməhullah) demişdir: Əhməd bin Əbu Sureyc mənə xəbər verdi ki, imam Əhməd bin Hənbəl bu məsələyə dair mənə bir yazı yazıb söyləmişdir: İman söz və əməldir.Biz söz deyib əməli etmədiyimiz zaman əməli istisna etmiş oluruq.Fədl əlavə edib dedi: Əbu Abdullahın belə dediyini eşitdim: Süleyman bin Harb bunu əməlin qəbulu məsələsinə aid etmişdir.O, belə deyərdi: Biz əməllər edirik lakin onun bizdən qəbul ediləcəyini yaxud edilməyəcəyini bilmirik."[156]

İmam Əhmədin sonuncu sözündə istisnanın digər bir formasına işarə vardır.Yəni, insan əməlinin qəbul edilib edilməyəcəyini bilmir.

Habelə imam Əmədin diqqət çəkdiyi digər bir yanaşma vardır.Əl-Xalləl rəvayət edib demişdir: Əbu Abdullah dedi: Peyğəmbər (salləllahu aleyhi və səlləm) qəbirlərin yanında durduğu zaman belə demişdir: "İnşallah biz də sizə qoşulacağıq."[157]Artıq o, özünün ölümə doğru getdiyi xəbər vermişdir.[158] Qəbir sahibinin əhvalatında gəlmişdir: İnşallah bunun üzərə yaşadım, bunun üzərə öləcəm və bunun üzərə qaldırıla-

[156] "əs-Sunnə",əl-Xalləl:3/597_1056-cı rəqəm.
[157] Muslim:249.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.
[158] Yəni, öləcəyini yəqin bildiyi halda istisna etdi.

cam."[159] Habelə Peyğəmbər (salləllahu aleyhi və sælləm) demişdir: "Mən duamı məxfi saxlamışam.İnşallah o, Allaha heç bir şeyi şərik qoşmayana yetişəcəkdir."[160] Habelə bir kişi Peyğəmbərə (salləllahu aleyhi və səlləm) sual verib demişdir: Bizdən biri səhər cunublu oyanır və oruc tutur? Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Həqiqətən, məndə bunu edir daha sonra oruc tuturam.Onlardan biri dedi: Sən bizim kimi deyilsən.Artıq Allah sənin gələcək günahlarını bağışlamışdır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Vallahi, sizin içinizdə Allahdan ən çox qorxan olmağıma ümid edirəm."[161] Bu cür və buna bənzər rəvayətlər çoxdur."[162]

İmam Əhməd (rahiməhullah) rəvayətin tamamında bu ayəni dəlil göstərmişdir:*"Allah qoysa (İnşallah) siz əmin-amanlıqla, başlarınız qırxdırılmış, qısaltmış halda və qorxmadan Məscidul-Harama daxil olacaqsınız."*[163]Dedi: Artıq Uca Allah onların Məscidul-Hərama girəcəklərini bilmişdir.

---

[159] İbn Macə:4267.Hədisi Əbu Hureyra rəvayət etmişdir.Hədisin ləfzi belədir: İnsan öldükdə qəbirə qoyulur.Daha sonra ölən adam qəbirin içində heç bir qorxu keçirtmədən otuzdurulur.Ona deyilir: Yəqinlik üzərə oldun, onun üzərə öldün və inşallah onun üzərə diriləcəksən." İmam Əhməd Aişə və Əsmanın hədisindən rəvayət etmişdir.Buseyri "misbahu-z-zucəcə" kitabında hədisi səhih saymışdır.Habelə Albani "sahih sunən ibn Macə"də onu səhih saymışdır.

[160] Muslim:199.Hədisi Əbu Hureyra rəvayət etmişdir.Onun ləfzi: "Hər bir peyğəmbərin müstəcəb duası vardır və hər bir peyğəmbər duasını artıq etmişlər.Mən isə duamı qiyamət günü şəfaət olaraq məxfi saxlamışam.Heç şübhəsiz ki, o, ümmətimdən Allaha heç bir şeyi şərik qoşmayana yetişəcək." Buxari:7474.

[161] Muslim:1110.Hədisi Aişə (r.a) rəvayət etmişdir.

[162] "əs-Sunnə", əl-Xalləl:3/595_1054-cü rəqəm.

[163] əl-Fəth:27.

Şeyxul-İslam (rahiməhullah) istisnaya dair olan yanaşmaları bəyan edərək demişdir: Səhabə, tabiin və qeyrilərindən olan sələfin çoxu imanda istisna etmişlər.

Bir qismi isə istisnanı rədd edərək: Bu, şübhədir,- demişlər.

İmanda istisna edənlərdən bir qismi onu vacib etmişlər.Bir qismi isə onu vacib etməyərək sadəcə iki hal etibarı ilə onun tərk edilməsini caiz görmüşlər.Bu, ən səhih görüşdür.Bu iki görüş imam Əhmədin və digərlərinin məzhəbində mövcuddur.Lakin əgər biri Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əmr etdiyi kimi vacibləri yerinə yetirmədiyinə dair bilgisiz olduğu səbəbilə istisna edərsə gözəl etmiş olar.Habelə sonucu bilmədiyi səbəbilə istisna edənlər. Habelə şübhə nəticəsində deyil sadəcə bir işi Uca Allahın istəyinə bağlayaraq istisna edənlər.

Əgər biri bu halda daxilində olana əmin olarsa, məsələn daxilən Allahdan başqa haqq məbudun olmadığına və Muhammədin Onun elçisi olduğuna şahidlik etdiyini bilər və daxilində hasil olana yəqinliklə əmin olarsa bu məsələdə gözəl etmiş olar."[164]

*Yuxarıda qeyd edilənlərdən məlum olur ki, sələfə görə istisna beş şeydən birinə qayıdır:*

---

[164] Məcmu`əl-fətəva:18/278.Muhamməd bin Nəsr əl-Mərvəzi demişdir: "İmam Əhməddən belə deyən şəxs haqqında soruşdum: "Mən əhkamlar və nəsəb baxımından özümə görə mömünəm ancaq Allah qatında kim olduğumu bilmirəm". O, cavab olaraq belə dedi: Bu, murciə deyil." Əbu Əyyub demişdir: İstisna etmək caizdir.Həmin şəxs: Mən mömünəm deyib özünün Allah yanında mömin olduğunu demədi və istisna etmədi.Mənə görə bu, caizdir və bunu deyən murciə deyil.Habelə Əbu Xeysəmə və ibn Əbu Şeybə bu sözü demişlər.

*Birinci*: Mütləq iman, bütün əmrlərin edilməsi və qadağaların tərk edilməsini şamil edir.Heç bir şəxs isə bunu etdiyini iddia edə bilməz. Bu baxımdan istisna etmək caizdir.(Bu, istisna etmiş bütün sələfin üslubu olmuşdur).[165]

*İkinci*: Əməllərin qəbul edilməsinə nəzər yetirmək.İnsan əməllər edir lakin əməllərin əmr edilən surətdə edilməməsindən qorxduğu səbəbilə onun qəbul edilib edilməyəcəyini bilmir.[166]

*Üçüncü*: İnsanın özünü təmizə çıxartmağı tərk etməsi.İnsanın imanlı olduğuna dair özünü təmizə çıxartmasından daha böyük təmizə çıxartma ola bilərmi?[167]

*Dördüncü*: İstisna heç bir şübhə doğurmayan yəqinliklə bilinən işlərdə olur.əl-Fəth surəsi və qəbir əhvalatında bu məsələ qeyd edilmişdir.[168]

*Beşinci*: Son aqibətə dair bilgisizlik və gələcəkdə hal dəyişkənliyindən qorxu.Buna dair ibn Batta (rahiməhullah) deyir: "Habelə digər yöndən istisnanın gələcək əməllərə, təzələnən əməllərə, sonluğa və yerdə qalan əməllərə aid edilməsidə səhihdir.İnsan bunu deməklə aşağıdaki şeyləri qəsd edir: Əgər Allah mənə sonda möminlərin əməllərini nəsib edərsə, əgər Uca Allah məni iman əhlinin sırasına qatarsa, əgər möminlərin əməllərindən olan tutduğum bu yol Allahla qarşılaşacağım günə qədər mütamadi və baqe

---

165 Məcmu`əl-fətəva:7/446.Habelə:7/417.

166 Öncəki mənbə:7/496.Şeyxul-İslam dedi: "Bu, onlardan istisna edənlərin ən üstün istisna formasıdır.

167 Öncəki mənbə:7/446."əl-İbənə",ibn Batta:2/865.

168 Öncəki mənbə:7/450,452.Habelə:3/289, 13/42.

olarsa mən möminəm.Axı mən səhərə yaxud axşama imanlı yaxud imansız daxil olacağımı bilmirəm. Uca Allah Peyğəmbəri (salləllahu aleyhi və səlləm) və möminləri məhz bu cür tərbiyyələndirərək buyurmuşdur:*“Heç bir şey barəsində: “Mən onu sabah edəcəyəm!”– demə! Ancaq: “Əgər Allah istəsə!”.*[169] (*“inşallah”*- de!)[170]

Bir sözlə Əhli sunnə bu hallarda istisna etməyi caiz sayır. Habelə burada imanın mütləq kamilliyi deyil imanın özəyi qəsd edildiyi zaman onu (istisnanı) tərk etməyi caiz sayır.Lakin istisnanın şübhə səbəbilə edilməsi alimlərin yekdilliyi ilə yasaqdır.Habelə insan istisna etməyəcəyi zaman onun öz sözünü mütləq, kamil imanı qəsd etmədiyini bəyan edən sözə birləşdirməsi gərəkdir.Misal üçün: Allaha, mələklərinə, peyğəmbərlərinə iman etdim və s.

Şeyxul-İslam (rahiməhullah) demişdir: Bu səbəbdən insan bunu qəsd edəcəyi zaman belə demək doğru olacaq: Mən istisnasız möminəm! Lakin həmin insan bu sözə onun mütləq, kamil imanı qəsd etmədiyini bəyan edən bir şey əlavə etməlidir.[171]

İbn Əbul İzz (rahiməhullah) istisnaya dair olan yanaşmaları xülasə edərək demişdir: İstisnanı caiz görüb onu tərk edənlər iki tayfanın dəlil baxımından ən doğru olanını və işlərin ən xeyirli və orta olanını seçənlərdir.[172] Lakin əgər istisna edən şəxs imanının özəyində şübhə edərsə ona istisna

---

[169] əl-Kəhf:23-24.
[170] əl-İbənə:2/865.
[171] Məcmu`əl-fətəva:7/448.
[172] Yəni, onu vacib edənlər və onu haram edənlər.Buna dair imanın firqələrə görə anlamı mövzusu əsnasında açıqlama gələcək.

etmək qadağan edilər.Bu, ixlilafsız məsələdir.Habelə insan Uca Allahın vəsf etdiyi möminlərdən biri olduğunu qəsd etdiyi zaman: *"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar, yalnız öz Rəbbinə təvəkkül edər, namaz qılar və Bizim onlara verdiyimiz ruzidən (Allah yolunda) xərcləyərlər. Onlar həqiqi möminlərdir. Onlar üçün Rəbbi yanında dərəcələr, bağışlanma və bolluca ruzi vardır."*[173] Habelə buyurur: *"Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən, sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə cihad edənlərdir! (İmanlarında) sadiq olanlar da məhz onlardır."*[174] Belə olan halda istisna etmək caiz olur.Habelə imanında şübhə səbəbilə deyil istisna edib işin sonluğunu bilmədiyini qəsd edən, həmçinin istisna edib işi Allahın istəyinə bağlayan şəxs.Gördüyün kimi bu çox güclü sözdür.[175]

## *Sələfin, bir insanın qardaşına: Sən möminsənmi?-sualını verməsindən xoşlanmaması.*

Sələf, bir insanın qardaşına: Sən möminsənmi?-sualını verməsindən xoşlanmaz, üstəlik bunu murciələrin ixtira etdiyi bidətlərdən sayardılar.

İbrahim ən-Nəxai (rahiməhullah) demişdir: Bir insanın digərindən: Sən möminsənmi?-soruşması bidətdir.[176]

---

[173] əl-Ənfəl:2-4.
[174] əl-Hucurat:15.
[175] Şərhul aqidəti-t-tahaviyyə:353-cü səh.
[176] "əş-Şəria", əl-Əcurri:2/670_291."əl-İbənə:2/880_1212.

Sufyan bin Uyeynə (rahiməhullah) demişdir: Əgər birinə: Sən möminsənmi?-deyə sual verilərsə, həmin şəxs istəsə cavab verməyə bilər yaxud belə deyər: Sənin mənə verdiyin sual bidətdir. Mən imanımda şübhə etmirəm.[177]

İmam əl-Əcurri (rahiməhullah) demişdir: Əgər bir kişi sənə: Sən möminsənmi?-deyərsə, ona de: Allaha, mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə, ölümə, ölümdən sonraki dirilişə, cənnətə və cəhənnəmə iman gətirdim! Əgər ona cavab vermək istəməsən belə deyə bilərsən: Sənin mənə verdiyin sual bidətdir. Buna görə də mən ona cavab verməyəcəm. Əgər ona: İnşallah mən möminəm,-deyə qeyd etdiyimiz surətdə cavab versən, bu işdə heç bir qəbahət olmaz. Belə şeylərdə mübahisə etməkdən çəkin! Çünki bu, alimlərə görə pislənən haldır. Gəlib getmiş müsəlman imamlarının yoluna tabe olsan, inşallah salamat qalarsan.[178]

Murcilələr bu sualı imanın əməlsiz söz və təsdiq olduğunu isbatlamaq üçün gətirirlər. Bunun mənası: Əgər cavab verən: Mən möminəm!-deyərsə, ona deyiləcək: Əməl etmisənmi? Sən əməlinə əmin olmadığın bir halda imana sahib olduğuna necə əmin oldun? Bu isə imanın əməlsiz olduğuna dair sənin etirafındır.

177 “əs-Sunnə, Abdullah bin Əhməd:1/338_712 rəqəm.”əş-Şəria”, əl-Əcurri: 2/667_288 rəqəm.”əl-İbənə”,ibn Batta:2/881_1213 rəqəm. Ləlƙai:5/1054_1706 rəqəm.

178 “əş-Şəria”,əl-Əcurri:2/667.

Sələf alimləri onların qəsdini bildikləri zaman buna dair sualı və cavabı bəyənməmişlər.[179]

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Əhməd və digər sələf alimləri bir kişinin digərindən: Sən möminsənmi?-deyə soruşmasını və buna cavab verməsini bəyənməzdilər. Çünki bu, öz görüşlərini əsaslandırmaq üçün murciələrin ixtira etdiyi bidətdir.Bir insan daxilən kafir olmadığını bilir və qəlbi ilə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyini təsdiq etdiyini duyur.Həmin insan: Mən mömin̄əm!-dediyi zaman imanın təsdiq etmə olduğunu isbatlamağa çalışır. Çünki sən mömin olduğuna əminlik ifadə edir lakin əmr olunan bütün buyuruğları yerinə yetirdiyinə əmin olmursan.Sələf onların məqsədini bildikləri zaman buna cavab verməkdən yaxud cavaba ətraflı izahat verməkdən xoşlanmadılar.Buna səbəb isə iman sözünün mütləq və muqayyəd məna daşımasıdır.Onlar buna, özlərinin kamil imana sahib olduqlarına şahidliyi vacib etməyən müəyyən qeydə bağlı olan imanla cavab verdilər.Bu səbəbə görə əgər insan bunu qəsd etmiş olarsa onun: Mən istisnasız mömin̄əm,-deməsi caiz olacaq.Lakin onun mütləq, kamil imanın qəsd edilmədiyi bəlli olsun deyə sözünə digər bir şey əlavə etməsi gərəkdir.Bu səbəbdən Əhməd istisnasız

[179] Bəzi şəxslər buna bənzər sözü dilə gətirib deyirlər: İmanın səhihliyi üçün tələb olunan əməlin çərçivəsi və gerçəyi nədir? Habelə onu tərk edən insan nə vaxt kafir olur, bir gündən sonra yoxsa iki gündən sonra yoxsa bir saatdan və ya bir andan sonra? Bu məsələ, imanın əməlsiz yetərli olmayacağına dair sələfn icmasını şübhə altına salmağa çalışan şəxslərin əqli şübhələrinə cavablarda qeyd ediləcək.Qəsdimiz murciələrin Quran, sunnə və icmanın dəlalət etdiyi mənaları buraxıb bu cür dəyərsiz şübhələrə və zəir hüccətlərə əl atdıqlarını bəyan etməkdir.Sırf Uca Allahın dediyi kimidir: *“Allahın nur vermədiyi şəxsin ümumiyyətlə heç bir nuru yoxdur.”*

mütləq şəkildə cavab verməyi bəyənməzdi.Mərvəzi demişdir: Əbu Abdullaha deyilmişdir ki, biz belə deyirik: Biz möminik! Əhməd dedi: Siz: Biz müsəlmanıq!-deyin. Həmçinin demişdir: Mən Əbu Abdullaha belə dedim: Biz deyirik: Həqiqətən, biz möminik! Əhməd dedi: Belə deyin: Həqiqətən, biz müsəlmanıq.Bununla yanaşı Əhməd, bu sözü deyənin imanın adicə söz olduğunu deyən murciələrin dediyini qəsd etməyəcəyi təqdirdə istisnanı tərk etməsinə irad tutmadı.Üstəlik imanın kamil olduğuna əmin olmasa belə qəlbində imana sahib olduğunu bilən şəxsin bunu tərk etməli olduğu görüşündə idi.əl-Xalləl demişdir: Əhməd bin Əsram əl-Muzəni xəbər vermişdir ki, Əbu Abdullaha belə deyilmişdir: Əgər bir adam mənə sual verib: Sən möminsənmi?-deyərsə.Əhməd dedi: Mənə verdiyin sual bidətdir. O, imanında şübhə etməməlidir.Yaxud dedi: Biz imanımızda şübhə etmirik.Muzəni dedi: Əbu Abdullahın belə dediyini hifz etdim: Mən Tavusun dediyi kimi deyirəm: Allaha, mələklərinə, kitablarına və peyğəmbərlərinə iman etdim.Məlum oldu ki, Əhməd və digər sələf alimləri imanlarında əmin olub bu halda qəlbdə imanın olmasına şübhə etmirdilər və istisnanı buyuruğların yerinə yetirilməsini şamil edən mütləq imana qaytarırdılar.[180]

[180] Məcmu`əl-fətəva:7/448.

## Yeddinci araşdırma:

## İmanla İslam arasında olan təfavüt

Əhli sunnə alimlərinin arasında iman və islam məsələsinə dair məşhur fikirayrılığı mövcuddur.Onların fikirayrılığı, bu iki sözün həmmənə yaxud fərqli olmasındadır. Onların çoxu bu iki sözün fərqli olduğunu isbat edir və imanın islamdan daha yüksək dərəcəyə malik olduğunu və onların arasında bağlılığın olduğunu və imansız islamın, islamsız izə imanın olmayacağını deyirlər.

İmanla islamın fərqli şeylər olduğunu deyənlər bu iki şeyin gerçək fərqliliyinə dair ixtilaf etmişlər.Onlardan bir qismi demişlər: İslam kəlmə, iman isə əməldir.Digərləri isə demişlər: İslam zahiri əməllər, iman isə daxili etiqadlardır.Tədqiqatçı alimlər isə bunun tək yaxud birləşik halda gəlməsi etibarı ilə fərqli olacağını demişlər.

Murciələr isə islamın imandan daha fəzilətli olduğunu hesab edirlər.Çünki onlara görə iman islamın xislətlərindən biridir.

Şeyxul-İslam (rahiməhullah) insanların bu məsələyə dair sözlərini xülasə edərək demişdir: Bu səbəbdən, insanlar iman və islam məsələsində üç görüşə ayrılmışlar.Murciələr deyirlər: İslam daha fəzilətlidir.Çünki iman ona daxildir. Digərləri demişlər: İman və islam eynidir.Bunu deyənlər, mötəzilələr, xəvariclər və hədis və sunnə əhlindən olan bir

tayfadır. Muhamməd bin Nəsr bunu onların çoxunun görüşü olduğunu hekayət etmişdir.Əslində isə belə deyil.

Üçüncü görüş: İman daha mükəmməl və fəzilətlidir. Quran və sunnənin bir sıra yeində varid olan dəlillər məhz buna dəlalət edir. Habelə bu, səhabə və onlara gözəl şəkildə tabe olanların sözlərinə uyğundur.Habelə bunlardan bir qismi belə deyirlər: İslam adicə sözdür, əməllər isə islamdan deyil.Səhih görüş isə islamın bütün zahiri əməllər olmasıdır.[181]

İslamın söz yaxud kəlmə olduğunu deyənlərdən: əz-Zuhri və Hamməd bin Zeyddir.Onlar bunu deməklə islamın kəlmə ilə sabit olduğunu qəsd etmişlər.

Şeyxul-İslam (rahiməhullah) onların sözlərini izah edərək demişdir:  Belə ki, şəhadət kəlməsini deyən hər bir şəxsin müsəlman olub yəhudi və nəsranilərdən seçilməsi və müsəlmanlara aid olan İslam əhkamlarının ona aid edilməsi, istisnasız əminlik ifadə edən məsələdir.Bu səbəbdən əz-Zuhri demişdir: İslam kəlmədir.Əhməd və digərləri ona bu məsələdə müvafiq olmuşlar.Lakin ona müvafiq gəldikləri zaman vacib islamın tək kəlmə olduğunu qəsd etməmişdir. Çünki əz-Zuhri kimi şəxsiyyətə bu məsələnin gizli qalması inandırıcı deyil.Buna görə də imam Əhməd islamın yalnız kəlmə olduğuna dair yanlış düşüncənin yaranmasından qorxaraq ikinci cavabında fərqli cavab vermişdir.[182]

---

[181] Məcmu`əl-fətəva:7/414.Habelə:7/259.
[182] Öncəki mənbə:7/415.

## *İki sözün həmmәna sözlər olduğunu deyənlərin dəlilləri:*

Bu söz, Sufyan əs-Səuridən rəvayət edilir.[183] Habelə Buxaridən hekayət edilir.[184] Əbu Avənə əl-İsfərayini bunu əl-Muzənidən nəql etmişdir.[185] Muhamməd bin Nəsr və ibn Abdul-Bərr bunu Əhli sunnənin cumhuruna nisbət etmişlər.[186]

Əslində isə Şeyxul-İslamın dediyi kimi məsələ heç də belə deyil. Əksinə cumhur bunun tam əksini demişlər.

İbn Abdul-Bərr (rahiməhullah) demişdir: İmam Malikin əksər ardıcılları islam və imanın bir şey olduğunu demişlər. Bunu ibn Bəkir əhkamlarda qeyd etmişdir. O, buna aşağıdaki ayəni dəlil gətirmişdir: *"Nəhayət, orada olan möminləri çıxartdıq. Lakin orada bir evdən başqa müsəlman (tövhid dinində olan) tapmadıq."*[187] Yəni, onların evindən savayı.

Habelə demişdir: Bununla belə fəqihlər və araşdırıcılardan olan bir sıra insanlar iman və islamın eyni olması görüşünü seçmiş və buna dəlil olaraq Allahın kitabından qeyd etdiyimiz ayəni göstərmişlər: *"Nəhayət, orada olan möminləri çıxartdıq. Lakin orada bir evdən başqa müsəlman*

---

[183] Lakin bu, Əyyub bin Suveyd ər-Ramlidən rəvayət edilir. Əyyub isə zəifdir. İbn Rəcəbin "Cəmiul ulum vəl hikəm:1/107" kitabına bax.

[184] İbn Həcər "Fəthul bəri:1/71" kitabının bir sıra yerində bunu Buxariyə aid etmişdir. "bəbun: əyyul islərmi əfdal:1/100". "bəbun: izə ləm yəkunil isləm aləl haqiqa:1/88". "bəbun:minə-d-dini əl-firar minəl fitən:1/125". bəbun:sualu cibril:1/140."

[185] "Fəthul-bəri:1/140" kitabında hekayət etmişdir.

[186] Tə`zımu qadri-s-salət:2/529"."ət-Təmhid, ibn Abdul-Bərr:9/250".

[187] əz-Zəriyat:35-36.

*(tövhid dinində olan) tapmadıq."* İmanın islam olmasını deyənlərdən bizim əshabımız və şafii və malikilərdən olan digərləridir.Habelə bu, Davud, onun ardıcılları və sələf və əsərlərə tabe olan sunnə əhlinin və tədqiqçilərin sözüdür.[188]

Habelə imam Muhamməd bin Nəsr əl-Mərvəzi bu məsələyə dair "tə`zımu qadri-s-saləh" kitabında geniş söz açmışdır.Şeyxul-İslam isə bunu "əl-imənul kəbir" kitabında nəql edib bu məsələ ətrafında münaqişə aparmışdır.

***Bu sözü deyən tayfanın ən məşhur dəlilləri*:**

1-Uca Allah buyurur: *"Nəhayət, orada olan möminləri çıxartdıq. Lakin orada bir evdən başqa müsəlman (tövhid dinində olan) tapmadıq."* Qeyd edildiyi kimi ibn Abdul-Bərr bu ayəni dəlil olaraq gətirmişdir.

2-Uca Allah imanı təriflədiyi kimi islamı tərifləmiş və imana verdiyi adı islama vermişdir.Habelə onun (islamın) razı qaldığı din olduğunu xəbər vermişdir.Uca Allah buyurur:*"Halbuki onlara əmr edilmişdi ki, Allaha -dini yalnız Ona xas edərək, batildən haqqa (islama) dönərək - ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgün din budur!"* Habelə buyurur: *"Allah yanında (haqq olan) din, əlbəttə, islamdır."*[189] Uca Allah namaz qılıb zəkat verməyi doğru din adlandırmışdır.Beləliklə də dini, islam adlandırmışdır.Habelə iman söz və əməldir.

3-Əgər islam ilə iman arasında fərq qoyulub böyük günah sahibindən iman adı çıxarılsaydı onun möminlərə

---

[188] ət-Təmhid:9/247-250".

[189] əl-Beyyinə:5.Ali İmran:19.

ünvanlanan müraciətə daxil olmaması və onun bütün fərzlər, əhkamlar və şər`i cəzalardan azad olması gərəkli olardı.

4-Mömin adının iki cəhətli istifadəsi vardır:Küfr millətindən çıxıb islama girməyi ifadə edən ad.Məhz bununla Uca Allahın möminlərə vacib buyurduğu fərzlər vacib olur və möminlər arasında təyin edilmiş şər`i cəzalar və əhkamlar həmin şəxsdə öz əksini tapır.Habelə imanın kamilliyini gərəkdirən ad.Bu isə, tərif və saflığı ifadə edən addır.Məhz bu adla səciyyələnən şəxsin cənnətə girib cəhənnəmdən xilas olması vacib olur.

*Bu dəlillərə aşağıda göstərilən cavablar veriləcək:*

1-Uca Allah buyurur: *"Nəhayət, orada olan möminləri çıxartdıq. Lakin orada bir evdən başqa müsəlman (tövhid dinində olan) tapmadıq."*Bu ayələrə iki yöndən cavab veriləcək:

*Birinci yön*: Burada möminlər deyildiyi zaman Lutun qadını istisna olmaqla onun tayfası və ailəsi qəsd edilir. Bunlar mömin və müsəlman olmuşlar.Burada durumun xüsusiliyi səbəbilə iki ad bir məna ətrafında birləşmişdir.

İbn Kəsir (rahiməhullah) demişdir: İman ilə islam anlamı arasında fərq qoymayıb bu məsələdə mötəzilənin görüşünü seçmiş şəxslər bu ayəni dəlil olaraq qeyd etmişlər.Çünki Uca Allah onları mömin və müsəlman adlandırmışdır.Lakin bu zəif əsaslandırmadır.Çünki bunlar mömin tayfa olmuşlar. Bizə görə isə hər mömin müsəlmandır əksi isə belə deyil. Burada durum xüsusiliyi səbəbilə iki ad bir məna ətrafında

birləşmişdir.Lakin bunun hər bir vəziyyətdə belə olması gərəkli deyil.[190]

*İkinci yön*: Bu ayə iman ilə islam arasında fərqin olmasına dəlalət edir.Belə ki, Uca Allah iman adını, onları oradan çıxardığını xəbər verdiyi zaman qeyd etmişdir.Onlar deyildikdə Lut peyğəmbər və onun mömin ailəsi qəsd edilir.Ancaq islam adını mövcud durum haqqında xəbər verdiyi zaman qeyd etmişdir.Bu səbəbdən Lutun qadını həmçinin ora daxil olmuşdur.Çünki o, zahirdə yoldaşının daxildə isə tayfasının dini üzərə olmuşdur.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İnsanlardan bir tayfa bu ayədə gələn iman və islam adının bir mənanı tələb etdiyini zənn etmiş və iki ayədə varid olanlar arasında ziddiyət görmüşlər.Əslində isə məsələ heç də belə deyil və bu ayə birinci ayəyə tamamilə uyğun gəlir.Çünki Uca Allah orada mömin olanları çıxardığını və müsəlmanlardan olan ev əhlindən savayı heç kəsi tapmadığını xəbər vermişdir. Buna səbəb isə Lutun qadınının mövcud ev əhli içində olması və oradan cıxarılaraq xilas olub qurtulmuş insanların arasında olmamasıdır.Üstəlik həmin qadın məhv olub daimi əzaba düçar olanlar sırasında olmuşdur.Bununla belə həmin qadın üzdə ərinin dinində, daxilən isə tayfasının dinində olub bu işdə ərinə xəyanət etmişdir.Həmin qadın Lutun yanına gələn qonaqlar haqqında tayfasına xəbərçilik edərmiş."

---

[190] Təfsir ibn Kəsir:4/237.

Nəhayət demişdir: “Demək istədiyim, Lutun qadınının mömin olmaması və xilas olub çıxarılan insanlar içində olmamasıdır.Bu səbəbə görə o, bu ayəyə daxil edilməmişdir: *“Nəhayət, orada olan möminləri çıxartdıq.”* Həmin qadın müsəlman ailəsindən və orada mövcud olan insanlardan olmuşdur.Buna görə Uca Allah buyurur: *“Lakin orada bir evdən başqa müsəlman (tövhid dinində olan) tapmadıq.”* Bununla da, Qurani Kərimin hikməti üzə çıxır.Çünki Uca Allah imanı onların çıxarılmasını xəbər verdiyi zaman qeyd etmiş, islamı isə mövcud olan durum haqqında xəbər verdiyi zaman qeyd etmişdir.”[191]

2-4 Onların digər dəlillərinə Şeyxul-İslamın dediyi kimi cavab veriləcək:

“Muhamməd bin Nəsr əl-Mərvəzinin məqsədi, tərifəlayiq müsəlmanın tərifəlayiq mömin olması, pislənən şəxsin isə nöqsanlı islama və imana sahib olması, habelə hər bir möminin müsəlman, hər bir müsəlmanın imana sahib olmasıdır.Bu, səhih və yekdillik olan bir görüşdür.Habelə onun demək istədiyi sözlərdən: Əgər bir şəxsə islam adı şamil edilərsə mütləq ona iman adı şamil ediləcək. Bu məsələyə dair isə ləfzi ixtilaf mövcuddur.O demək istəmişdir ki, onlardan biri digərinin anlamını daşıyır. Sələfdən hər hansı birinin bunu deməsi bilinmir.

Əgər deyilərsə ki: Bu ikisi bir-birinə sıx bağlıdır.Bir-birinə sıx bağlı olanlardan hər birinin digərinin anlamını daşıması isə heç də gərəkli deyil.Nəsrin dediyinə əks olaraq

---

[191] Məcmu`əl-fətəva:7/473-474.

heç bir səhabə, onlara gözəl şəkildə tabe olanlar və İslamın məşhur imamlarından: İslamın anlamı məhz imanın anlamıdır,-deməsi nəql edilməmişdir.Üstəlik sələfdən bunu deyən heç bir şəxs tanımıram.Ancaq sələf və xələfdən bir tolum insandan gələn məşhur görüşə əsasən: Allahın vədinə layiq görülmüş möminin Allahın vədinə layiq görülmüş müsəlman olmasıdır.Hər bir müsəlman mömin, hər bir mömin isə müsəlmandır.Bunun mənasına dair sələf və xələf arasında, üstəlik ümmətin firqələri arasında yekdillik vardır.Onların hamısı deyirlər: Cənnət vədinə layiq görülən hər bir möminin müsəlman olması labüddür. Habelə cənnət vədinə layiq görülən müsəlmanın mömin olması labüddür. Öncəki və sonrakilərdən cənnətə əzabsız daxil olacaq hər bir şəxs mömin və müsəlmandır.Buna əlavə olaraq Əhli sunnə deyir: Cəhənnəmdən çıxıb cənnətə girəcək insanlar bunun bir hissəsinə sahibdirlər.Çəkişmə yalnız adın şamil olunması məsələsindədir.Sələfdən nəql edilən mütavatir xəbərlər imanın söz və əməl olduğunu göstərir.Lakin onlardan islam haqqında buna dair hər hansı bir şey nəql edilməmişdir.Müsəlman alimlərinin böyük çoxluğunun: İslam bütün dindir və sadəcə kəlmə deyil,-demələri əz-Zuhridən nəql edilən rəvayət ilə açıq-aydın ziddiyət təşkil edir.Onlar belə deyərdilər: Həqiqətən, namaz, zəkat, oruc, həcc və digər əmr olunan əməllər imandan olduğu kimi habelə islamdan sayılır.O isə, onların iman və islamı bir şey etdiklərini düşünmüşdür.Əslində isə məsələ heç də belə deyil.Onların yekdilliyi ilə iman islamı gərəkdirir.Ancaq islamın ona daxil olması, onun islamın özü olduğunu vacib etmir.İslam sözü ayrılıqda istifadə ediləcəyi zaman isə onun

imanı gərəkdirməsi heç bir dəlilə söykənmir.Əgər islamın vacib imanı gərəkdirməsi fərz edilərsə ən yaxşı halda bunlar deyilə bilər:Bu ikisi bir-birinə sıx bağlıdır və hər bir müsəlman mömin, hər bir mömin isə müsəlmandır.Bu, vacib imana sahib olan hər bir müsəlman qəsd ediləcəyi zaman səhih olacaq.Belə ki, əgər etdiyi ibadətə görə savab alan hər bir müsəlman qəsd edilərsə onun imanın özəyinə sahib olması labüd olacaq və bu, yekdil bir görüşdür.Elə bir müsəlman yoxdur ki, o, mömin olmasın.Peyğəmbərdən gələn hədisdə olduğu kimi (salləllahu aleyhi və səlləm) özü üçün sevəni qardaşı üçün sevməyən şəxsdən, böyük günahlar işlədən şəxsdən, habelə çöl ərəblərindən və digər şəxslərdən inkar edilən iman olmayacağı halda belə, elə bir müsəlman yoxdur ki, mömin olmasın.

Əgər deyilərsə ki: Tam[192] islam və iman bir-birinə sıx bağlıdır, belə olan halda onların ruh və bədən kimi birinin məhz digəri olması gərəkli olmayacaq.Belə ki, bizim ruhumuz yalnız bədən ilə mövcud olur. Diri bədən isə yalnız ruh ilə mövcud olur.Lakin onlardan biri digəri deyil.[193]

Habelə demişdir: Demişdir: Uca Allah namazı və zəkatı dindən etmişdir.Onun qatında din islamdır.Bu, gözəl,

[192] Şeyxul-İslamın bir neçə sətir öncə açıqladığı kimi tam iman deyildiyi zaman "imanın özəyi" qəsd edilir. Bu, irəlidə qeyd ediləcəyi kimi Şeyxul-İslamın əsasən istifadə etdiyi mənadır.

[193] Məcmu`əl-fətəva:7/365.

habelə Cəbrayılın hədisinə uyğun sözdür.Onun əməli islamdan cıxarana verdiyi cavab habelə gözəl sözdür.[194]

O, demişdir: Uca Allah imana verdiyi adı islama, habelə islama verdiyi adı imana vermişdir.Əslində isə belə deyil. Çünki Uca Allah yalnız belə buyurmuşdur: *"Allah yanında (haqq olan) din, əlbəttə, islamdır."*Uca Allah burada: Həqiqətən, Allah yanında din imandır,-deməmişdir. Lakin həmin din imandandır.İmanın ondan olması onun özü olmasını ifadə etmir.Belə ki, imanın özəyi qəlbin biliyi, təsdiqi və sözüdür.Əməl isə bu elmə, təsdiqə tabedir və sıx bağlıdır. İnsan yalnız onların hər ikisinə yiyələndiyi zaman mömin olur.İslam isə sözlə bərabər xalis əməldir.Elm və təsdiq isə onun anlamına daxil olan hissələr deyil.Lakin onda təsdiqin cinsi mütləq olmalıdır.Belə ki, elmsiz əməl olmur.Ancaq o, Allahın və Peyğəmbərin (salləllahu aleyhi və salləm) bəyan etdiyi müfəssəl imanı gərəkdirmir.Uca Allah buyurur: *"Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən, sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə cihad edənlərdir! (İmanlarında) sadiq olanlar da məhz onlardır."*[195] Habelə buyurur: *"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar, yalnız öz Rəbbinə təvəkkül edər".*[196] Habelə qeyd edilən

---

[194] Burada Muhamməd bin Nəsrın növbəti sözlərinə işarə edir: "Əgər biri islamın iqrar olduğunu və əməlin ondan olmadığını iddia edərsə Quran və sunnəyə müxalif olacaq.Habelə onunla murciələr arasında heç bir fərq olmayacaq. Çünki murciələr həmçinin imanın əməlsiz iqrar olduğunu iddia etmişlər.(tə`zımu qadri-s-salət:2/532)

[195] əl-Hucurat:15.

[196] əl-Ənfəl:2.

sifətlərə malik olmayan şəxsdən imanı inkar edən digər nasslar. Müsəlmanların bir çoxu həm daxilən həm də zahirən müsəlman olub yığcam təsdiqə malik olurlar. Bununla belə həmin şəxslər qeyd edilən imanla səciyyələnmirlər. Uca Allah buyurur: *"İslamdan başqa bir din axtaran şəxsdən, o (din) heç vaxt qəbul olunmaz".*[197] Habelə buyurur: *"Bir din olaraq sizin üçün İslamı bəyənib seçdim."*[198] Uca Allah: Kim İslamdan başqa elm, bilik, təsdiq və iman istəyərsə,- dəməmişdir. Habelə: Sizə təsdiq və elm olaraq islamı razı qaldım,-dəməmişdir. İslam din, əməl, itaət, tabeçilik və boyun əymə növünə daxildir. İslamdan başqa din istəyən şəxsdən isə bu, heç vaxt qəbul olunmaz. İman isə xətircəmlik və yəqinlikdir. Onun özəyi təsdiq və bilikdir. Din isə ona tabedir. Belə deyilir: Allaha iman etdim və Allah təslim oldum. Musa peyğəmbər (aleyhi-s-sələm) demişdir: *"Musa dedi: "Ey qövmüm! Əgər Allaha iman gətirmişsinizsə və müsəlman olmuşsunuzsa, Ona təvəkkül edin!"*[199] Əgər bu ikisieyni anlam daşımış olsaydı ayədə keçən sözlər təkrar olardı.[200]

Qısası, bu söz heç bir səhih dəlilə istinad etmir. Üstəlik o, Cəbrayılın hədisinə və məsələ ilə əlaqəli olan digər dəlillərə müxalifdir.

Şeyxul-İslam (rahiməhullah) buna dair deyir: "Burada məqsəd iki ifrata varmış sözü qeyd etməkdir: İslamın adicə söz olub zahiri əməllərin İslam anlamına daxil olmadığını deyən söz və islam və iman anlamının bir olduğunu deyən söz. Bu

---

[197] Ali İmran:85.

[198] əl-Maidə:3.

[199] Yunus:84.

[200] Məcmu`əl-fətəva:7/377.

sözlərin hər ikisi zəif və Cəbrayıl hədisinə və Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) gələn digər hədislərə müxalifdir. Bu səbəbdən Muhamməd bin Nəsr əl-Mərvəzi ikinci görüşü müdafiə etdiyi zaman onun səhih olmasına dair heç bir hüccətə sahib olmamışdır.O, sadəcə birinci sözü puç edən dəlilləri hüccət olaraq gətirmişdir."[201]

## *İslam ilə iman arasında fərqin olduğunu deyənlər:*

Bunlar elm əhlindən olan cumhur alimləridir.Üstəlik deyərdim ki, Əhli sunnənin çoxu bu görüş üzərindədirlər. Şeyxul-İslam (rahiməhullah) demişdir: "Xattabinin seçdiyi görüş Əbu Cəfər, Hamməd bin Zeyd, Abdur-Rahmən bin Mehdinin dediyi kimi onların ikisi arasında fərqin mövcud olmasıdır.Habelə bu, Əhməd bin Hənbəl və digərlərinin görüşüdür.Qədim alimlərdən kiminsə bunlara müxalif çıxıb islamın məhz imanın özü olduğunu deyənlərin olduğunu bilmirəm.Bu səbəbə görə Əhli sunnənin çoxluğu Xattabinin qeyd etdiyi kimi bunların dediyi görüş üzərində olmalarıdır. Habelə Əbul Qasim ət-Teymi əl-Əsbahani və onun oğlu, səhih Muslimin şərhçisi Muhamməd və digərləri qeyd etmişlər ki, Əhli sunnənin seçdiyi görüşə əsasən oğru və zinakara mömin adı şamil edilməyəcək.Nasslar məhz buna dəlalət edir."[202]

İbn Rəcəb əl-Hənbəli (rahiməhullah) demişdir: "İslam ilə iman arasında fərqin olmasına dair gələn görüş Həsən, ibn Sirin, Şureyk, Abdur-Rahmən bin Mehdi, Yəhyə bin Məin,

---

[201] Məcmu`əl-fətəva:7/375.

[202] Öncəki mənbə:7/359.

Muəmməl bin İhəbdən rəvayət edilir.Habelə bu görüş Malikdən hekayət edilir.Bunun Qatədə, Dəvud bin Əbu Hind, Zuhri, ibn Əbu Zi`b, Hamməd bin Zeyd, Əhməddən hekayət edilməsi artıq qeyd edilmişdir.Habelə Əbu Bəkr Səm`ani bunu bütün Əhli sunnədən hekayət etmişdir."

Daha sonra dedi: "İbn Nəsr və Abdul-Bərrin iman ilə islamın bərabər olmasını çoxlarından hekayət etmələri yaxşı deyil.Qeyd edildiyi kimi artıq sələfdən bunların arasında fərqin qoyulması rəvayət edilmişdir."[203]

***Cumhur alimlərinin iman ilə islam arasında fərqin mövcudluğuna dair gətirdikləri bəzi dəlillər:***

1-Uca Allah buyurur: *"Bədəvilər: "Biz iman gətirdik!"– dedilər. De: "Siz (qəlbən) iman gətirmədiniz! Ancaq: "Biz müsəlman olduq!"– deyin. İman sizin qəlblərinizə hələ daxil olmamışdır. Əgər Allaha və Onun Elçisinə itaət etsəniz, O sizin əməllərinizdən heç bir şey əskiltməz. Şübhəsiz ki, Allah Bağışlayandır, Rəhmlidir!".*[204]

Cumhur alimlərinə görə həmin çöl ərəbləri münafiq olmamışlar.Onlar savaba nail olacaq surətdə islam və imana sahib olmuşlar.Lakin imanın həqiqətləri onların qəlblərinə daxil olmamışdır.Bu səbəbə görə zinakar, oğru, özü üçün sevdiyini qardaşı üçün istəməyən, qonşusunu işkəncələrdən

---

203 "Fəthul bəri", ibn Rəcəb:1/130. Habelə "Cəmiul ulum vəl hikəm:1/107" kitabına bax.

204 əl-Hucurat:14.

rahat buraxmayan və digər şəxslərdən inkar edilən iman həmçinin onlardan inkar edilmişdir.[205]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Çoxları belə deyir: Bu adamlarda nifaqdan bir şöbə mövcud olsa belə bunlar əməllərindən heç bir şeyin qəbul edilməycəyi münafiqlərdən olmamışlar.Çünki həmin şəxslərin, Allah üçün edəcəkləri əməllərin qəbul olunacağına zəmin yaradan təsdiqi olmuşdur.Bu isə onları müsəlman etmişdir.Uca Allah buyurur:*"Əgər doğru danışanlarsınızsa, (bilin ki,) əslində Allah sizi imana gətirməklə sizə mərhəmət göstərmişdir!"*[206] Habelə onlar bunu zinakar və oğru kimi təsdiqə sahib olmasına rəğmən imanı inkar edilən digər şəxslər haqqında demişlər.Bu, onlara dair deyilən üç görüşdən ən doğru olanıdır."[207]

Habelə demişdir: "Allahın, qəlblərinə imanın daxil olduğunu inkar etdiyi şəxslərin bu islamı onların savab qazanmasına şərait yaradırmı? Yoxsa bu, münafiqlərin islamı qəbilindən olan bir şeydir? Buna dair sələf və xələfdən iki məşhur görüş mövcuddur:

*Birinci görüş*: O, onların savab almalarına şərait yaradan və onları küfr və nifaqdan çıxaran islamdır.Bu görüş, Həsən, ibn Sirin, İbrahim Nəxai, Əbu Cəfər Bəqirdən rəvayət

---

[205] Məcmu\`əl-fətəva:7/305.

[206] əl-Hucurat:17.

[207] Məcmu\`əl-fətəva:7/344.Birinci görüş, onların münafiq olduqlarını deyənlərin görüşüdür.İkinci görüş isə bəzən müstəhəb kamilliyin tərk ediləcəyi üçün, üstəlik Əbu Talib əl-Məkki və digərlərin dediyi kimi ondan daha fəzilətli şəxsin mövcud olması səbəbilə bir şəxsdən imanın inkar ediləcəyini deyənlərin görüşüdür.Şeyxul-İslamın bəyan etdiyi kimi bu cür söz şəriət sahibinin kəlamında bilinmir.

edilir.Habelə bu, Hamməd bin Zeyd, Əhməd bin Hənbəl, Səhl bin Abdullah ət-Təstəri, Əbu Talib əl-Məkki və bir çox hədis və sunnə alimlərinin görüşüdür.

*İkinci görüş*: Adı çəkilən islam: Əsarət və ölüm qorxusu səbəbilə təslimçilikdir.Bu, münafiqlərin islamına bənzəyir. Bu görüş sahibləri demişlər: Bunlar kafirdirlər.Çünki iman onların qəlblərinə daxil olmamışdır.Qəlbinə iman daxil olmayan şəxs isə kafirdir.Bu, Buxari və Muhamməd bin Nəsr əl-Mərvəzinin seçdiyi görüşdür.Ümumiyyətlə isə sələf bu məsələyə dair ixtilaf etmişlər."[208]

İbn Kəsir (rahiməhullah) demişdir: "Artıq bu ayədən, Əhli sunnə vəl cəmaatın məzhəbində gəldiyi kimi imanın islamdan daha xüsusi olması faydası çıxmışdır.Buna həmçinin islam daha sonra iman daha sonra ihsan haqqında soruşub ümumidən xüsusiyə daha sonra ən xüsusiyə doğru yüksələn Cəbrayılın hədisi dəlalət edir."

Həmçinin demişdir: "Bu, həmin ayədə qeyd edilən çöl ərəblərinin münafiq olmadıqlarına dəlalət edir.Onlar yalnız qəlblərində imanları möhkəmləməmiş müsəlmanlar olmuşlar. Onlar sahib olduqları məqamdan daha yüksək məqama sahib olduqlarını iddia etmiş və bu səbəbdən tənbeh olunmuşlar.Bu, ibn Abbasın, İbrahim ən-Nəxainin və Qatədənin dedikləri sözün mənasıdır.İbn Cərir həmçinin bu görüşü seçmişdir.Bizim bu sözü deməyimizə səbəb yalnız

[208] Məcmu`əl-fətəva:7/238.

Buxarinin həmin şəxslərin üzdə imanı aşkar edən münafiq olduqlarını deməsi olmuşdur.Əslində isə belə deyil."[209]

Şeyxul-İslam həmin çöl ərəblərinin müsəlman olduqlarına, islamda olduqlarına görə savab alacaqlarına və onların münafiq olmadıqlarına dair ayələrdən dəlillər qeyd etmişdir.[210]

2-Uca Allah buyurur:*"Həqiqətən, müsəlman kişilər və müsəlman qadınlar, mömin kişilər və mömin qadınlar, müti kişilər və müti qadınlar".*[211] Uca Allah burada islam ilə iman arasında fərq qoymuşdur.

3-Buxari və Muslim Sa`d bin Əbu Vaqqasdan (r.a) rəvayət edirlər ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) bir toplum insanlara əta edərkən Sa`d həmin yerdə əyləşmişdi.O, dedi: Peyğəmbər (salləllahu aleyhi və səlləm) mənə daha sevimli adama əta etmədiyi zaman mən ona dedim: Ey Allahın elçisi! Nə üçün filankəsə əta etmirsən.And olsun Allaha ki, mən onun mömin olduğunu hesab edirəm? Peyğəmbər (salləllahu aleyhi və səlləm): Yaxud müsəlman,-deyə söylədi. Az müddət susduqdan sonra həmin şəxs haqqında bilgim məni üstələdi və mən yenə sözümü təkrarlayıb dedim: Nə üçün filankəsə əta etmirsən.And olsun Allaha ki, mən onun mömin olduğunu hesab edirəm.Peyğəmbər (salləllahu aleyhi və səlləm): Yaxud müsəlman,-dedi.Az müddət susduqdan sonra həmin şəxs haqqında bilgim məni üstələdi və mən yenə sözümü təkrarladım, Peyğəmbər (salləllahu aleyhi və səlləm) isə yenə hə-

[209] Təfsir ibn Kəsir:4/220.

[210] Məcmu`əl-fətəva:7/242-253, 7/476-478.

[211] əl-Əhzab:35.

min sözləri deyərək ardından dedi: Ey Sa`d! Heç şübhəsiz ki, digəri mənə daha sevimli olduğu halda bir şəxsə əta etməyim Allahın onu üzü üstə atəşə atmasından qurxduğum səbəbilədir."[212]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Peyğəmbər (salləllahu aleyhi və səlləm) Sa`da iki cavab vermişdir: Birinci: Sənin mömin olması barədə şahidlik etdiyin insan ola bilsin ki, mömin yox sadəcə müsəlman olsun.İkinci: Əgər həmin şəxs mömindirsə deməli o, onlardan daha üstündür. Mən isə bəzən zəif imanlı şəxslərin ətadan məhrum qalma səbəbilə islamdan çıxması və nəticədə üzü üstə atəşə atılması baş verməsin deyə onlara əta edirəm.Bu, qəlbləri İslama isitmək üçün verilən ətadır."[213]

4-Cəbrayılın məşhur hədisi.Həmin hədisdə gəlmişdir: Dizlərini onun dizlərinə söykədi, biləklərini onun buduna qoydu daha sonra dedi: Ey Muhammməd, mənə islam haqqında xəbər ver! Allahın elçisi (salləllahu aleyhi və səlləm) dedi: İslam, Allahdan başqa haqq məbudun olmadığına və Muhammədin Allahın elçisi olduğuna şahidlik etməyin, namaz qılmağın, zəkat verməyin, Ramazanda oruc tutmağın və getmək gücündə olsan Allahın evinə həcc etməyindir.O: Doğru söylədin!-dedi.Biz onun soruşub daha sonra onu təsdiq etməsinə təəccübləndik.Daha sonra dedi: Mənə iman haqqında xəbər ver! Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Allaha, mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə və qədərin xeyiri və şərinə iman etməyindir.O:

---

[212] Buxari:27.Muslim:15.

[213] Məcmu`əl-fətəva:7/474.

Doğru söylədin!-dedi.Sonra dedi: Mənə ihsan haqqında xəbər ver! Peyğəmbər (salləllahu aleyhi və sələm) dedi: Allaha sanki Onu görürmüşsən kimi ibadət etməyindir.Çünki sən Onu görməsəndə O, səni görür..."[214]

Artıq həmin hədisdə Peyğəmbər (salləllahu aleyhi və səlləm) islam ilə iman və ihsan anlamı arasında fərq qoymuş və islamı zahiri əməllər, imanı isə qəlbdə olanlar etmişdir.[215]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Elm və sunnə əhli yalnız əksər insanlara gizli qalan incə məsələlər haqqında çəkişmişlər.Lakin hər bir halda onların çəkişdiyi məsələni Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) həvalə etmək gərəkdir.İslam və iman məsələsini Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) həvalə etmək, onların hər ikisinin anlamı vacib olsa belə hər hansı bir şəxsin yalnız mömin, müsəlman olacağı halda cənnəti qazana biləcəyini vacib edir.Bu məsələdə doğru olan Peyğəmbərin Cəbrayıl hədisində dini və müsəlmanları üç təbəqə etməsidir.Onun əvvəli: İslam, ortası: İman, ən uca məqamı: İhsandır.Ən uca olana çatan artıq ondan öncəkinə çatmış olacaq.Belə ki, hər bir muhsin mömindir.Mömin isə müsəlmandır.Hər bir müsəlmanın mömin olması heç də gərəkli deyil.

Qurani Kərimdə məhz belə gəlmişdir.Uca Allah ümməti üç qismə bölmüşdür.Uca Allah buyurur: "*Sonra, Kitabı qullarımız içərisindən seçdiklərimizə miras etdik. Onlardan kimisi özünə zülm edər, kimisi orta yol tutar, kimisi də*

---

214 Muslim:9.Hədisi Ömər (r.a) rəvayət etmişdir.

215 Məcmu`əl-fətəva:7/14.

*Allahın izni ilə yaxşı işlərdə öndə gedər. Böyük lütf də budur."*[216]

İmanın vaciblərini yerinə yetirməyən müsəlman özünə zülm edəndir.Orta yol tutan isə vacibi yerinə yetirib haramı tərk edən mütləq mömindir.Xeyir işlərdə öndə gedən isə Allaha sanki onu görürmüş kimi ibadət edən muhsindir."[217]

Habelə demişdir: "Bəlli olmuşdur ki, bizim dinimiz hər üçünü bir arada toplayır.Lakin o, üç dərəcədən ibarətdir: Müsəlman sonra mömin sonra isə muhsin.Uca Allah bu xüsusda buyurur: "*"Sonra, Kitabı qullarımız içərisindən seçdiklərimizə miras etdik. Onlardan kimisi özünə zülm edər, kimisi orta yol tutar, kimisi də Allahın izni ilə yaxşı işlərdə öndə gedər".*Orta yol tutan və xeyir işlərdə tələsənin hər biri cəzasız cənnətə girəcək.Özünə zülm edən şəxsin halı isə fərqlidir.

Qəlb təsdiqi ilə birgə zahiri islama sahib olan, bununla belə vacib olan daxili imanı gerçəkləşdirməyən şəxsin halı həmçinin belədir.Həmin şəxs təhdiddən üz çevirir.Buna dair irəlidə açıqlama gələcək.

İhsan öz cəhətindən daha ümumi ona sahib olanlar cəhətindən isə imandan daha xüsusidir.

İman öz cəhətindən daha ümumi ona sahib olanlar cəhətindən isə islamdan daha xüsusidir.

---

[216] Fatir:32.

[217] Məcmu`əl-fətəva:7/357.

İhsan anlamına iman da daxildir.İmana isə İslam daxildir. Muhsinlər möminlərdən daha xüsusi, möminlər isə müsəlmanlardan daha xüsusidirlər."[218]

5-Hədis: Zinakar zina etdiyi zaman mömin olaraq zina etməz.İçki içən içkini qəbul etdiyi zaman mömin olaraq içkini qəbul etməz.Oğru oğurluq etdiyi zaman mömin olaraq oğurluq etməz.Bir şəxs insanların ona baxdığı bir arada bir şeyi qəsb etdiyi zaman bunu mömin olaraq etməz."[219]

İmam Əhməd (rahiməhullah) demişdir: Əbu Cəfər əl-Bəqirin belə dediyi rəvayət olunur: "Zinakar zina etdiyi zaman mömin olaraq zina etməz" Dedi: İmandan islama çıxacaq.İman islamın çərçivəsindədir.Bir şəxs zina etdiyi zaman imandan islama çıxır."[220]

## *Birləşmə və ayrılma qaydası:*

Yuxarıda keçən nasslarda iman anlamı ilə islam anlamı arasında qeyd edilən fərqlilik bütövlüklə onların bir arada gəldiyi hala aid edilir.Lakin onlar ayrı-ayrılıqda gəldiyi zaman iman islama dair gələn açıqlamanı özündə şamil edir.Bu isə, zahiri əməllərdir. Peyğəmbər (salləllahu aleyhi və səlləm) abdul-Qeys nümayəndə heyətinə dair gələn hədisdə demişdir: "Sizə dörd şeyi əmr edib dörd şeyi qadağan edirəm.Sizə Allaha iman etməyi əmr edirəm.Allaha imanın nə olduğunu bilirsinizmi? Allahdan başqa haqq məbudun olmadığına şahidlik etmək, namaz qılmaq, zəkat vermək,

---

[218] Məcmu`əl-fətəva:7/10.
[219] Buxari:2475.Muslim:57.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.
[220] "əs-Sunnə, əl-Xalləl:4/10".

Ramazanda oruc tutmaq və qənimətlərdən beşdə bir hissəsini verməkdir.Habelə sizə dörd şeyi: Qurumuş balqabaqdan olan qablarda, yaşıl saxsıda, ovulmuş xurma ağacının kötüyündə saxlanılan xurmaları və qırla sıvanmış qabda olanı qıcqırtmağı qadağan edirəm."[221]

Habelə imanın şöbələrinə dair hədisdə demişdir: "İman yetmiş və bir neçə yaxud altmış və bir neçə şöbədən ibarətdir.Onun ən fəzilətlisi "ilə iləhə illəllah" kəlməsi, ən aşağı olanı isə yoldan əziyyət verən şeyləri kənarlaşdırmaqdır.Həya həmçinin imandan bir şöbədir."[222]

Peyğəmbər (salləllahu aleyhi və səlləm) burada imanı zahiri əməlləri şamil edəcək surətdə açıqlamışdır.

Bu səbəbdən islam və iman sözlərinin gerçəyi yoxsul və kasıb sözlərinin gerçəyi mislindədir.Bu sözlər bir arada gəldiyi zaman fərqli mənalar kəsb edir, ayrılıqda gəldiyi zaman isə hər ikisi eyni mənanı kəsb edir.

İbn Rəcəb (rahiməhullah) demişdir: "Bu nasslar ilə Cəbrayılın islam və iman haqqında soruşduğu və Peyğəmbərin onların arasında fərq qoyub əməlləri iman deyil islam anlamına daxil etdiyi hədis arasında cəm etmək, təməl qaydanın qeyd edilməsi ilə aydınlaşır.Bu təməl qayda isə müəyyən adların fərdi şəkildə və ya bir arada gəldiyi zaman onların bir sıra mənaları şamil etməsidir.Bu adlardan biri digəri ilə bir arada gəldiyi zaman o, həmin anlamların bir hissəsinə dəlalət edəcək. Onunla bir arada gələn ad isə

---

221 Buxari:4368.Muslim:17.Hədisi ibn Abbas (r.a) rəvayət etmişdir.

222 Buxari:9.Muslim:35.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.

qalan mənalara dəlalət edəcək. Bu, yoxsul və kasıb adları mislindədir.Belə ki, onlardan hər biri fərdi şəkildə gələcəyi zaman həmin adlara, möhtac olaraq vəsf olunan hər bir şəxs daxil olacaq.Lakin həmin adlardan biri digərinə birləşik gələcəyi zaman həmin adlardan biri ehtiyac sahiblərinin bir növünə digəri isə yerdə qalan növünə dəlalət edəcək.

İslam və iman adı həmçinin belədir.Əgər onlardan biri fərdi şəkildə gələrsə digərinin mənası ona daxil olacaq.O, fərdi şəkildə gəldiyi zaman, digərinin fərdi şəkildə dəlalət etdiyi mənaya dəlalət edəcək.Ancaq onlar bir arada qeyd edildiyi zaman onlardan biri fərdi şəkildə gəldiyi mənanın bir qisminə digəri isə qalan hissəsinə dəlalət edəcək.

Bir sıra imamlar bu mənanı bildirən sözlər demişlər. Əbu Bəkr əl-İsmaili Cəbəl əhlinə yazdığı məktubunda demişdir: Əhli sunnə vəl cəmaatın bir çoxu demişlər: İman söz və əməldir. Habelə hər bir ad digərinə birləşik halda qeyd edildiyi zaman islam Uca Allahın insana fərz etdiyinin yerinə yetirilməsini ifadə edəcək. Deyilmişdir ki, fərdi olaraq mömin və müsəlman [223]birlikdə gəlir və birinə dair qəsd edilən məna digərinə şamil edilmir.Lakin adlardan biri qeyd ediləcəyi zaman o, hər bir adı şamil edib ümumi mənada gələcək.

[223] "Cəmiul ulum vəl hikəm" kitabında məhz bu cür gəlmişdir.Həmçinin bunu ondan "Məaricul qabul:2/604" kitabında nəql etmişdir.Çox güman ki, doğru olan: Cümlənin məzmununa uyğun gəlsin deyə "birləşik gəlir" deməkdir.

Habelə Xattabi "məalimu-s-sunən"[224] kitabında bu mənanı qeyd etmiş ondan sonra gələn bir toplum alim isə onun görüşünu seçmişlər."[225]

Daha sonra demişdir: "Qeyd etdiyimiz bu təfsilat vasitəsilə ziddiyyət aradan qalxır və deyilir: Əgər İslam və imandan hər biri fərdi şəkildə qeyd edilərsə bu zaman onların arasında heç bir fərq olmaz.Ancaq əgər onlar bir arada gələrsə onların arasında fərq ortaya çıxacaq.

Onların arasında olan fərqli cəhətlər: İman: Qəlbin təsdiqi, iqrarı və biliyidir.İslam: Qulun Allaha təslim olması, Ona boyun əyməsi və Ona itaət etməsidir.Bu isə əməl ilə hasil olur.Uca Allahın Quranda islamı din olaraq adlandırdığı kimi o, dindir. Cəbrayılın hədisində Peyğəmbər (salləllahu aleyhi və səlləm) islamı, imanı və ihsanı din adlandırmışdır.Bu həmçinin adlardan birinin fərdi şəkildə gələcəyi zaman digərini şamil edəcəyini göstərir.Onlar arasında fərq yalnız adlardan birinin digəri ilə bir arada gələcəyi zaman ortaya çıxır.Belə olan halda iman ilə qəlb təsdiqi, İslam ilə isə əməlin cinsi qəsd edilir."[226]

Şeyxul-İslam (rahiməhullah) demişdir: Ancaq doğru olan, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) islam və iman haqqında soruşulduğu zaman bunu bəyan etməsidir.O, islamı zahiri

---

[224] Məalimu-s-sunən:4/295.Həmçinin Şeyxul-İslam bunu nəql etmişdir:7/358. Orada gəlmişdir: Belə ki, müsəlman bəzi hallarda mömin olur, bəzi hallarda isə mömin olmur.Mömin bütün hallarda müsəlmandır.Hər bir mömin müsəlmandır. Hər bir müsəlman isə mömin deyil.Məsələyə bu cür yanaşacağın zaman ayələrin izahı sənə aydın olacaq və buna dair söz öz məcrasına düşəcək və ona dair heç bir ziddiyət ortaya çıxmayacaq.

[225] Cəmiul ulum vəl hikəm:1/105.

[226] Öncəki mənbə:1/107.

əməllər olaraq imanı isə beş əsasa iman gətirmək olaraq izah etmişdir.Biz islam ilə imanı bir arada qeyd etdiyimiz zaman yalnız Peyğəmbərin (salləllahu aleyhi və səlləm) verdiyi cavab tək cavab verməliyik.Ancaq iman adı fərdi şəkildə gələcəyi zaman islamı həmçinin şamil edəcək.İslam fərdi şəkildə gəldiyi zaman insanın islam ilə birgə mömin olması istisna edilmir və bu ixtilafsız bir məsələdir.Vacib olan məhz budur.İnsanın müsəlman olub mömin adlanmaması olarmı? Artıq buna dair söz açılmışdır."[227]

## *İman ilə islam arasında olan bağlılıq "tələzum":*

Bu araşdırmanın başlanğıcında qeyd edilmişdir ki, iman ilə islam arasında fərq mövcuddur və imanı olmayanın islamı, islamı olmayanın isə imanı ola bilməz.Çünki müsəlmanın, onun islamını səhih edəcək imana sahib olmaması mümkünsüzdür.Habelə mömininin, onun imanını gerçəkləşdirəcək islama sahib olmaması mümkünsüzdür. Buna səbəb isə zahir ilə daxil arasında olan bağlılıq və əlaqədir.Bu mövzuya dair irəlidə geniş söhbət açılacaq.

Burada qəsd edilən amil, daxili iman mövcud olacağı zaman söz və əməldən ibarət olan zahiri islamın mövcud olmasının gərəkli olduğunu bəyan etməkdir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İman islama birləşəcəyi zaman iman qəlbdə olanı islam isə zahirdə olanı ifadə edəcək.Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) gələn hədisdə deyilir: "İslam aşkar, iman isə qəlbdədir.İman, Allaha, Onun

[227] Məcmu`əl-fətəva:7/259.

mələklərinə, kitablarına, peyğəmbərlərinə, ölümdən sonra dirilişə və qədərin xeyiri və şərinə iman etməkdir."[228]

İnsan bu imana sahib olacağı vaxt zəruri olaraq şəhadət, namaz, zəkat, oruc və həcc olan islama sahib olacaq.Çünki onun Allaha, Onun mələklərinə, kitablarına və peyğəmbərlərinə imanı Allaha təslimiyyəti və Ona boyun əyməsini tələb edir.Çünki insanın daxildə iqrar, sevgi və itaətə sahib olub imkan olan yerdə buna zahirdə sahib olmaması qeyri-mümkündür.Eyni cür imkan olacağı təqdirdə məqsədin yolxuğu qəti iradənin varlığını qeyri-mümkün edir.

Bununla da sənə aydın olur ki, insanın qəlbi ilə qəti olaraq iman gətirib bacardığı halda şəhadət kəlməsini tələffüz etməməsi qeyri-mümkündür.İmkan olduğu halda şəhadətin yoxluğu qəlbdə tam imanın yoxluğunu gərəkli edir. Bununla da Cəhm və onun ardıcıllarının yanlışlığı üzə çıxır. Çünki onlar zahiri iman olmadan adicə imanın axirətdə fayda verəcəyini iddia etmişlər.Bu isə qeyri-mümkündür. Çünki qəlbdə tam iman hasil olduğu zaman mütləq imkan dairəsində onu tələb edən amil zahirdə hasil olur.Çünki bir insanın digərini dərin bir sevgi ilə sevib ona qovuşmağa qadir olduğu bir halda buna doğru heç bir zahiri hərəkət etməməsi qeyri-mümkündür."[229]

---

[228] Əhməd:12404. Hədisi Ənəs (r.a)rəvayət etmişdir.Şueyb Arnaut "əl-Musnəd" kitabını təhqiq edərkən həmin hədisi zəif saymışdır.Habelə şeyx Albani "əl-Cəmiu-s-sağır:2280" kitabında hədisi zəif saymışdır.

[229] Məcmu`əl-fətəva:7/553.

Habelə demişdir: "Əgər iman və islam bir arada qeyd edilərsə islamın anlamı, imanın zəruri amili olsa belə ondan xaric olacaq.Buna misal Cəbrayılın hədisidir."[230]

Habelə demişdir: "Artıq Xattabi Buxarinin şərhində onların adlarında fərqliliyin olmasına rəğmən onların bir-birinə bağlılığını tələb edən amillər qeyd etmişdir.Habelə Bəğavi "şərhu-s-sunnə" kitabında demişdir: "Peyğəmbər (salləllahu aleyhi və səlləm) islamı əməllərdən aşkar olan üçün bir ad etmiş, imanı isə daxildə olan etiqad üçün ad etmişdir.Lakin burada əməllərin imandan olmaması yaxud qəlb təsdiqinin islamdan olmaması qəsd edilmir.Əslində isə bu, sadəcə bütövlüklə bir şey olan və bütün dini əhatə edən yığcam bir anlamın təfsilatıdır.Bu səbəbədən, Peyğəmbər (salləllahu aleyhi və səlləm) həmin hədisdə belə demişdir: Bu, sizə dininizi öyrətmək üçün gələn Cəbrayıl idi."[231]

Habelə Əbu Talib əl-Məkkidən bu sözləri nəql edib demişdir: "İslamın imandan olması məsəli iki şəhadətdə birinin digərindən məna və hökm baxımından olması mislindədir.Belə ki, Peyğəmbərə şahidlik etmək Allahın təkliyinə şahidlik etmək deyil.Onlar ayrılıqda iki fərqli şeydir.Lakin onlardan biri digəri ilə bir şey mislində məna və hökm baxımından əlaqəlidir.İman və islam həmçinin belədir.Onlardan biri digəri ilə sıx bağlıdır.Onlar bir şey mislindədirlər.Çünki islamı olmayanın imanı, imanı olmayanın isə islamı olmur.Habelə müsəlmanın, onun islamını səhih edəcək imana sahib olmaması mümkün-

---

[230] Məcmu`əl-fətəva:7/553.

[231] Məcmu`əl-fətəva:7/359.

süzdür.Habelə möminin, onun imanını gerçəkləşdirəcək islama sahib olmaması mümkünsüzdür.Çünki Uca Allah saleh əməllər üçün imanı, iman üçün isə saleh əməlləri şərt qoymuşdur.Uca Allah buna dair buyurur: *"Hər kim mömin ikən yaxşı işlər görsə, onun zəhməti danılmayacaqdır".*[232]

Habelə Uca Allah imanın əməl ilə gerçəkləşəcəyi haqqında belə buyurur: *"Kim (Onun hüzuruna) yaxşı əməllər etmiş bir mömin kimi gələrsə, onlara ən yüksək dərəcələr nəsib olar".*[233]

Əgər birinin zahiri, islam əməlləri olarsa lakin həmin şəxs daxilən qeybə iman gətirməzsə o, islamdan xaric olan münafiq olar.Habelə əgər biri daxilən qeybə iman gətirib imanın əhkamları və islamın təməllərinə uyğun əməl etməzsə o, tövhid üzərində sabit olmayan kafir olar."[234]

Habelə Əbu Talib əl-Məkki (rahiməhullah) demişdir: "İmanın əməllərdə məsəli qəlbin bədəndə olan misalındadır.Onlardan biri digərindən ayrılmazdır.Diri bir bədən sahibinin qəlbsiz mövcud olması mümkün deyil. Habelə qəlb sahibinin bədənsiz mövcud olması belədir. Onlar ayrı iki şeydir və hökm və məna baxımından ayrıdırlar.

Habelə onların məsəli zahiri və daxili olan bir toxuma bənzəyir.Onun fərqli vəsflərə sahib olması səbəbilə onlara iki toxum olması deyilməz.Habelə islamdan olan islam

---

[232] əl-Ənbiya:94.

[233] Tahə:75.

[234] Məcmu`əl-fətəva:7/333.Əbu Talib əl-Məkkinin sözləri "Qutul qulub:2/250" kitabındadır.

əməlləri imanın zahiridir.O, bədən əzaları ilə əməllərdir. İman isə islamın daxilidir.O, qəlbin əməllərindəndir."[235]

Artıq Şeyxul-İslamdan yekdilliklə imanın islamı gərəkdirdiyini isbat edən nəql qeyd edilmişdir.Şeyxul-İslam demişdir: "Şübhəsiz ki, yekdil görüşə görə iman islamı gərəkdirir.İslamın ona daxil olması heç də islamın onun özü olmasını gərəkli etmir.İslama gəldikdə isə onun mütləq surətdə imanı gərəkdirməsinə dəlalət edən heç bir dəlil yoxdur.Əgər fərz edilsəydi ki, islam vacib imanı gərəkdirir belə olan halda ən uzağı bu deyiləcəkdi:Onlar bir-birinə sıx bağlıdır.Belə ki, hər bir müsəlman mömin, hər bir mömin isə müsəlmandır.Bu, vacib imana sahib olub cənnətə daxil olacaq müsəlman qəsd ediləcəyi zaman doğru olacaq. Yekdilliklə qəbul olunan qaydaya əsasən, ibadəti üçün savab alan hər bir müsəlman qəsd ediləcəyi zaman onun imanın özəyinə sahib olması labüd olacaq."[236]

Habelə demişdir: "Əgər: Tam islam və iman bir-birinə sıx bağlıdır,- deyilərsə, bədən və ruh kimi birinin digər olması gərəkli olmaz.Belə ki, biz yalnız ruhu olan bədənə sahibik.Habelə ruh olmadan diri bədən mövcud olmur. Onlardan biri isə digəri deyil. İman ruh kimidir.O, ruhda olub bədən ilə bağlı olur.İslam isə bədən kimidir.Bədən isə yalnız ruh ilə diri olur.Bunun mənası onların bir-birinə sıx bağlı olmasıdır.Ancaq onlardan birinin anlamı digərinin anlamını daşımır.Münafiqlərin islamı ölü bədən, cansız

[235] Öncəki mənbə:7/334.Onun sözləri çox önəmlidir.Bu haqda zahir ilə daxil arasında olan bağlılığa dair söhbət zamanı söz açılacaq.

[236] Yuxarıda qeyd edilib.

**bədən mislindədir.Elə bir diri bədən yoxdur ki, onun ruhu olmasın."[237]**

[237] **Məcmu`əl-fətəva:7/367.**

# İKİNCİ FƏSİL

## Əhli sunnə vəl camaata görə küfrün anlamı

Altı araşdırmadan ibarətdir:

1-Küfrün ərəb dilində və şər`i istilahı mənası.

2-Küfr dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməldə olur.

3-Böyük və kiçik küfr.

4-Müəyyən şəxslərin təkfir edilməsində ehtiyatlı olmaq.

5-Böyük günah sahibinin hökmü.

6-Müsəlman fasiqin hökmü.

# Birinci araşdırma:

## Küfrün ərəb dilində və şər`i istilahı mənası

Küfr ərəb dilində: Ört-basdır etmə, pərdələmə,-mənasını ifadə edir.

Əbu Ubeyd (rahiməhullah) demişdir: Kafir haqqında deyiləcək ki, onun kafir adlandırılması yalnız onun, silaha bürünüb taxdığı silahı ilə hər bir şeyini örtən şəxs kimi ona bürünməsi səbəbilədir. Küfr həmçinn kafirin qəlbini örtür.Habelə gecənin adlarından biridə: Kafirdir.Çünki o hər bir şeyi örtür.

Habelə kafirin bu cür adlandırılmasına səbəb kimi danma göstərilmişdir.Ərəblər deyirlər "كافرني فلان حقي : kəfərani fulənun haqqi, yəni filankəs haqqımı dandı."[238]

İbn Quteybə (rahiməhullah) demişdir: "Kafir sözü, " كفرت الشيء : kəffərtu-ş-şey, bir şeyi örtdüm" sözündən alınmışdır.Habelə bir kişi silaha büründüyü zaman " تكفر فلان في السلاح : təkəffəra fulənun fi-s-siləh" deyilir.Bəziləri demişlər: Habelə ağacın gövdəsini örtdüyü səbəbilə onun üst lay qabığı "كافورالنخل :kəfuru-n-nəxl" adlanır.Çünki o, gövdəni örtür. Habelə hər bir şeyi bürüyüb örtdüyü səbəbilə gecə haqqında "ليل كافر : leylun kəfir" deyilmişdir."[239]

---

[238] Ğaribul hadis, Əbu Ubeyd:3/13.
[239] Ğaribul hadis, İbn Quteybə:1/247.

əl-Əzhari (rahiməhullah) demişdir: "Leys dedi: Deyilənə görə, kafirin belə adlandırılması küfrün onun bütün qəlbini örtməsi səbəbilədir.

Dedim: Leysin: Deyilənə görə, kafirin belə adlandırılması küfrün onun bütün qəlbini örtməsi səbəbilədir,- sözündə gələn məna, ona dəlalət edən açıqlamaya və onun ərəb dilində "örtmə" mənası kimi izah olunduğuna ehtiyac duyur. Kafir küfr sahibi, yəni qəlbini küfrlə örtəndir.Silah taxan şəxsin kafir adlandırılması buna nümunədir.Çünki silah həmin şəxsi örtür.

Habelə buna dair başqa bir görüş vardır və həmin görüş Leysin seçdiyi görüşdən daha yaxşıdır.Belə ki, Uca Allah kafiri tövhidə çağırdığı zaman onu, qəbul edəcəyi təqdirdə bu böyük nemətə çağırmış olur.Həmin şəxs Uca Allahın onu tövhidə çağırmasını rədd etdiyi zaman Allahın nemətinə küfr etmiş, yəni tövhiddən imtina etməsilə neməti ört-basdır etmiş və özü ilə onun arasında bir sipər çəkmişdir.

Munziri əl-Harranidən o da, ibn Sikkitdən belə deməsini rəvayət edir: Əgər bir kişi zirehinin üzərindən paltar geyinərsə o, kafir adlanacaq.Çünki həmin şəxs zirehini örtmüş olur.Dedi: Nəyisə örtən hər bir şeyə "كفره : kəffərahu" deyilir.Habelə gecəyə kafir deyilir.Çünki o, öz zülməti ilə hər bir şeyi örtür. Deyilənə görə, kafirin bu cür adlandırılması onun Allahın nemətini ört-basdır etməsi səbəbilədir.Dedim: Allahın nemətləri: Onun tövhidinə dəlalət edən ayələridir.Habelə ərəblər əkinçiyə kafir deyirlər.Çünki o, şumlanan yerə əkdiyi toxumları torpağın

altında ört-basdır edir.Uca Allah buyurur: “ كمثل غيث أعجبَ الكفار نباته: *Bu elə bir yağışa bənzəyir ki, ondan əmələ gələn bitki əkinçiləri “kuffər” heyran edir.”*[240] Yəni, bu iş əkinçilərin ən gözəl bildikləri iş olmasına rəğmən onun bitməsi onları heyran etmişdir. ”[241]

Küfrün şəritədə gələn mənası: İmanın əksidir.İman söz, əməl və etiqad olduğu kimi habelə küfr söz, əməl, etiqad və tərk etmə ilə olur.

Bu, küfrü yalnız qəlb və ya qəlb və dil ilə təkzib yaxud danma çərçivəsinə salanlara tamamilə əks olan Əhli sunnə vəl cəmaatın yekdil olduğu bir məsələdir.Çünki onu təkzib etmə və danma çərçivəsinə salmaq onun əməl yaxud tərk etmə ilə hasil olma imkanını inkar etmək anlamına gəlir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Küfr, Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) imanın olmamasıdır. Burada təkzib etmənin olması yaxud olmaması gerçəyi dəyişmir.Çünki insanın şəkk-şübhə etməsi yaxud həsəd, dikbaşlıq və ya dinə tabeçilikdən uzaqlaşdıran bəzi nəfsi istəklərə tabe olma səbəbilə bundan üz çevirməsi həmçinin küfrdür.”[242]

İbn Hazm (rahiməhullah) demişdir: “Bu, üzərindən hüccət qalxdıqdan sonra və haqqın ona çatması ilə Uca Allahın iman etməyi fərz buyurduğu hər hansı bir şeyi dili ilə olmasa belə qəlbi ilə yaxud qəlbi ilə olmasa belə dili ilə yaxud onların hər ikisi ilə danan yaxud nass ilə imandan

[240] əl-Hadid:20.
[241] Təhzibu-l-liğati, əl-Əzhari:10/193.Lisənul arab:5/145.
[242] Məcmu`əl-fətəva:12/335.

çıxaracağını ifadə edən əməl edən şəxsin dində olan vəsfidir."[243]

İmam İshaq bin Rahuyə (rahiməhullah) demişdir: "Danan şəxsin hökmünə dair olduğu kimi təkfir edilməsinə və eyni hökmün verilməsinə icma etdikləri məsələ: Uca Allaha və Onun dərgahından gələnə iman gətirən mömin, ardından peyğəmbərləri qətlə yetirməyin haram olduğunu dediyi halda peyğəmbəri öldürər yaxud onun qətl edilməsinə yardımçı olarsa kafir olar."[244]

əl-Bərbahəri (rahiməhullah) demişdir: "Qiblə əhlindən heç kəs Allahın kitabından bir ayəni yaxud Peyğəmbərin xəbərlərindən bir şeyi rədd etməyincə yaxud Allahdan qeyrisinə qurban kəsməyincə yaxud Allahdan qeyrisi üçün namaz qılmayınca İslamdan çıxmaz.Sadalanan şeylərdən birini edəcəyi zaman isə sənin onu İslamdan çıxarmağın vacib olacaq."[245]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əgər biri ehtiyac olmadan, qəsdən və onun küfr söz olduğunu bildiyi halda küfr sözü dilə gətirərsə o, həm zahirən həm də daxilən kafir olar.Onun daxilən mömin olmasının caiz olduğunu deməк olmaz.Hər kim bunu deyərsə İslamdan çıxar."[246]

Habelə demişdir: "Şübhəsiz ki, Allahı yaxud Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söymək həm zahirən həm də daxilən küfrdür.Söyən şəxsin bunun haram yaxud halal

---

[243] əl-İhkəm fi usulil əhkəm:1/49.
[244] Tə`zımu qadri-s-salət:2/930 kitabında nəql etmişdir.
[245] "Şərhu-s-sunnə, əl-Bərbahəri:81-ci səh".
[246] əs-Sarimul məslul:3/975.

olduğunu etiqad etməsi yaxud etiqadını unutması eynidir. Bu, imanın söz və əməl olduğunu deyən fəqihlərin və digər Əhli sunnənin məzhəbidir."[247]

Habelə demişdir: "Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təsdiq edib ona qəlbi və bədəni ilə nifrət edən və ədavət bəsləyən şəxs zəruri olaraq kafir olur."[248]

İbnul-Qayyim (rahiməhullah) demişdir: "Küfrün sözlü və əməli şöbələri həmçinin belədir.İnsanın könüllü surətdə küfr sözü dilə gətirməklə kafir olması bunu göstərir.Bu isə küfrün şöbələrindən biridir. Habelə insan bütə səcdə etmək, Quran yazısına sayğısızlıq etmək kimi küfrün şöbələrindən birini etməsi ilə kafir olur.Bu, bir əsasdır."[249]

---

[247] Öncəki mənbə:3/955.
[248] Məcmu`əl-fətəva:7/556.
[249] əs-Salət va hukmu tərikihə:45-ci səh.

# İkinci araşdırma:

## Küfr dil sözü, qəlb etiqadı
## və bədən əzaları ilə edilən əməldə olur.

Qeyd edilən məsələ yuxarıda nəql edilən mətnlər vasitəsi ilə bəlli olmuşdur. Bu önəmli məsələni daha da aydınlatmaq üçün deyirəm:

1-Küfrün dil sözündə olacağına dair dəlillərdən biri. Uca Allahın buyurur: *“Onlardan (nə üçün istehza etdiklərini) soruşsan, deyərlər: “Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!” De: Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz.”*[250]

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Həmin şəxslər dedikləri sözün doğru olduğunu etiqad etmirdilər. Ancaq buna rəğmən Uca Allah onların sözlə kafir olduqlarını bəyan etmişdir.”[251]

Habelə Uca Allah buyurur: *“Onlar küfr sözünü demiş, İslamı qəbul etdikdən sonra kafir olmuşlar”.*[252]

Habelə Uca Allah buyurur: *“Qəlbi imanla sabit qaldığı halda (haqqı danmağa) məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə*

---

[250] ət-Təubə:65-66.
[251] əs-Sarimul məslul:3/976.
[252] ət-Təubə:74.

*açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır."*[253]

"Məlumdur ki, O, burada küfr dediyi zaman ancaq qəlb etiqadını qəsd etməmişdir.Çünki insan buna (qəlb etiqadına) vadar edilə bilməz.O, deyib daha sonra etiqad edəni qəsd etməmiş və sadəcə məcbur ediləni istisna etmişdir.Çünki məcbur edilən istisna edilmişdir.İnsan isə etiqad və sözə məcbur edilə bilməz.İnsan yalnız söz deməyə məcbur edilə bilər.Bununla da bəlli olur ki, burada O, küfr sözü dilə gətirəni qəsd etmişdir.Uca Allahın belə şəxsə qəzəbi tutmuş və onu böyük əzab gözləyir.Ancaq qəlbi imanla sabit olduğu halda buna məcbur edilən şəxs istisnadır.Məcbur edilənlərdən buna razılıq edənlər isə həmçinin kafir olmuşlar.Beləliklə də, qəlbi imanla sabit olduğu halda küfr sözü dilə gətirməyə məcbur edilən şəxs istisna küfr sözü dilə gətirən hər bir şəxs kafir olur."[254]

Sözlə olan küfr növlərindən: Ölü və qaib şəxslərə edilən dua kimi Allahdan qeyrisinə dua etməkdir.Uca Allah buyurur: *"Kim Allahla yanaşı, haqqında özünün heç bir dəlili olmadığı başqa bir ilaha ibadət edərsə, onun cəzasını Rəbbi Özü verəcəkdir. Şübhəsiz ki, kafirlər nicat tapmazlar!"*.[255] Habelə Uca Allah buyurur: *"Allaha qarşı yalan uyduran və ya Onun ayələrini yalan hesab edən kimsədən daha zalım kim ola bilər? Yazıda olan qismətləri onlara nəsib olacaqdır. Nəhayət, elçilərimiz onların canını almaq üçün yanlarına*

---

[253] ən-Nəhl:106.

[254] əs-Sarimul məslul:3/977.

[255] əl-Muminun:117.

gəldikdə: *"Allahdan savayı çağırdıqlarınız haradadır?"– deyəcəklər. Onlar: "Bizi qoyub qaçıblar!"– deyəcək və kafir olduqlarına dair öz əleyhlərinə şahidlik edəcəklər."*[256] Habelə Uca Allah buyurur: *"Bu sizin Rəbbiniz olan Allahdır. Mülk Onundur. Sizin Ondan başqa yalvardıqlarınız xurma çəyirdəyinin pərdəsinə belə sahib deyillər. Əgər siz onları çağırsanız, onlar sizin duanızı eşitməzlər, eşitsələr də cavab verə bilməzlər. Özləri də Qiyamət günü sizin (onlara) ibadət etdiyinizi danacaqlar. Heç kəs (hər şeydən) Xəbərdar olan (Allah) kimi sənə xəbər verə bilməz."*[257] Habelə həmin duanın Uca Allaha edilən küfr və şirk olmasına dəlalət edən digər ayələr.

Şeyxul-İslam (rahiməhullah) buna dair buyurur: "Mələkləri və peyğəmbərləri ortaq tutub günahların bağışlanmasını, qəlblərə hidayətin verilməsini, kədərlərin sovrulmasını və yoxsulluğun aradan qaldırılmasını diləyən şəxslər kimi onlara dua edən, təvəkkül edən, onlardan mənfəətin gəlməsini və zərərin dəf edilməsini diləyən şəxs müsəlmanların icması ilə kafirdir."[258]

Habelə demişdir: "Həmçinin bəzi şeyxlərə dair aşırıya varma mövcuddur.Belə ifratçılıq şeyx Adiyy yaxud Yunus əl-Fətə yaxud Halləc və digərlərinə qarşı olur.Habelə Əli bin Əbu Talib (r.a) və onun kimi şəxslərə qarşı olur.Üstəlik Məsih və onun kimi şəxslərə qarşı olur.Diri olan bir şəxsə yaxud Əli və ya Adiyy və ya onlar kimi saleh şəxslərə yaxud

[256] əl-Əraf:37.
[257] Fatir:13-14.
[258] Məcmu`əl-fətəva:1/123.

Hallac və ya Misirdə olmuş hakim yaxud Yunus əl-fətə və onlar kimi saleh olduğu zənn edilən şəxslərə nisbətdə aşırıya varan və onları üluhiyyət dərəcəsinə qaldırıb: Şeyx filankəsin mənə əta etdiyi ruzidən olmayan ruzini istəmirəm,- deyən yaxud qurban kəsdiyi zaman: Ağamın adı ilə,-deyən yaxud ona və ya qeyrisinə səcdə etməklə ona ibadət edən yaxud Allahdan savayı ona dua edib məsələn: Ey filankəs ağam, məni bağışla yaxud mənə rəhm et yaxud mənə yardım et yaxud mənə ruzi ver yaxud mənim dadıma çat yaxud məni qoru yaxud sənə təvəkkül etdim yaxud sən mənə kifayətsən,-deyən yaxud yalnız Allaha yarayan digər rübubiyyət xüsusiyyətlərinə malik sözlər danışan və əməllər edən hər hansı bir insan.Bütün bunlar şirk və zəlalətdir. Bunu edən şəxs tövbəyə çağırılmalıdır.Əgər o, tövbə etməzsə öldürülməlidir.Belə ki, Uca Allah bizim yalnız Ona ibadət etməyimiz və Ona heç bir şeyi şərik qoşmamağımız və Ona heç bir başqa ilahı tay tutmamağımızdan ötrü elçiləri göndərmiş və kitabları endirmişdir.Allahla bərabər digər ilahlara məsələn; günəşə, aya, ulduzlara, Üzeyirə, Məsihə, mələklərə, Lata, Uzzaya, üçüncü olan Mənata, Yəğusa, Yəuqa, Nəsra və qeyrilərinə dua edənlər onların mövcudatı yaratmaq yaxud yağış yağdırmaq yaxud yerdən bitkilər çıxartmaq gücündə olduqlarını etiqad etmirdilər.Onlar sadəcə peyğəmbərlərə, mələklərə, ulduzlara, cinlərə, heykəllərə yaxud onların qəbirlərinə ibadət edib deyirdilər: Biz onlara yalnız onlar bizi Allaha daha yaxın etməsi üçün ibadət edirik.Habelə deyirdilər:Bunlar bizim Allah yanında şəfaətçilərimizdir.Bu səbəbə görə Uca Allah onlara Allahdan

qeyrisinə dua etməyi, istər bu ibadət duası olsun istərsə də yardım diləmə duası, yasaq edən elçilər göndərmişdir."[259]

2-Əməldə olan küfr: Allahdan qeyrisinə səcdə etmək yaxud qurban kəsmək yaxud Quran yazısını murdar yerə atmaq yaxud hər hansı peyğəmbəri öldürməkdir. İshaq bin Rahuyə və Bərbahərinin buna dair sözləri qeyd edilmişdir.

3-Qəlb sözü yaxud əməlinə zidd gələn etiqadı küfr. Məsələn: Daxilən peğəmbəri təkzib etmək yaxud peyğəmbəri təsdiq etməklə birgə ona nifrət etmək və ona ədavət bəsləmək yaxud zina və şərabın halal olduğunu yaxud hər hansı bir şəxsin Muhammədin (salləllahu aleyhi və səlləm) şəriətindən kənar çıxmaq hüququna malik olduğunu etiqad etmək və qəlb sözü və əməlinə zidd gələn küfr etiqadlar.

Bilmək lazımdır ki, təkzib etmə küfrü peyğəmbərlərin düşmənlərində az olmuşdur.İbnul-Qayyim (rahiməhullah) demişdir: "Təkzib etmə küfrü: Peyğəmbərlərin yalançı olduqlarını etiqad etməkdir.Bu qism kafirlərdə azdır.Çünki Uca Allah Öz elçilərinə onların doğru olduğuna dəlalət edən sübutlar və ayələr əta etmiş və bununla da, insanların üzərindən hüccəti qaldırıb üzürü aradan götürmüşdür.Uca Allah firon və onun tayfası haqqında buyurur: *"Buna qəti inandıqları halda, haqsızcasına və təşəxxüslə onları dandılar."*[260]

---

[259] Məcmu`əl-fətəva:3/395.

[260] ən-Nəml:14.

Habelə Peyğəmbərinə demişdir: *“Əslində onlar səni yalançı hesab etmirlər. Lakin zalımlar Allahın ayələrini inadla danırlar.”*[261] Bunun təkzib etmə küfrü adlanması həmçinin doğru olardı. Çünki bu, dil ilə təkzib etməkdir.”[262]

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Peyğəmbərləri təkzib edənlərin əksəriyyəti haqqın peyğəmbərlərin tərəfində olduğunu və onların doğru olduğunu bilmişlər. Lakin həsəd yaxud dikbaşlıq və ağalıq istəyi yaxud mənsub olduqları dini sevdikləri səbəbilə və mal-dövlət, ağalıq, tayfalar arasında olan dostluq əlaqələri və bu kimi dünyavi maraqlar səbəbilə onlar peyğəmbərlərə tabe olmaqda sevdikləri nəfsi istəklərin tərk edilməsini yaxud onlara xoş gəlməyən işlərin hasil olacağını görmüş və nəticə etibarı ilə onları təkzib edib onlarla ədavət aparmışlar. Bununla da, onlar özlərinin batil üzərində elçilərin isə haqq üzərində olduqlarını bilməsi ilə bərabər iblis və firon kimi ən kafir məxluqlara çevrilmişlər.”[263]

4-Tərk etmə ilə olan küfr. Məsələn, sələfin cumhur alimlərinə görə, üstəlik səhabələrin icmasına görə namazın tərk edilməsi küfrdür. İrəlidə buna dair açıqlama gələcək.

Habelə bütövlüklə bədən əməllərinin tərk edilməsi. Məsələn, ömür boyu Allah üçün bir səcdə belə etməyən, zəkat verməyən, oruc tutmayan, həcc etməyən və vacib yaxud müstəhəb əməllərdən heç bir şey etməyən şəxs. Bu, tövhidi sabit olmayan kafirin vəsfidir. Bu, yalnız qəlb

---

[261] əl-Ənam:33.

[262] Mədaricu-s-səlikin:1/246.

[263] Məcmu`əl-fətəva:7/191.

əməlinin yoxa çıxması ilə hasil olur.Murciələr məhz belə şəxsin küfrünə dair çəkişir və inad göstərilər.Buna səbəb, onların imanın gerçəyindən bilgisiz olmaları və zahir ilə daxil arasında olan bağlılığı inkar etmələridir.Buna dair geniş açıqlama üçüncü bölümdə gələcək.

# Üçüncü araşdırma:

## Böyük və kiçik küfr

Əhli sunnə vəl cəmaatın əsaslarına görə küfr iki qismə bölünür.Böyük və kiçik küfr.Habelə şirk, zülm və fasiqlik iki qisimdir.Habelə böyük küfrün, ona sövq edən amilə uyğun olaraq bir neçə növü vardır.

### *Böyük küfrün növləri*:

Böyük küfr, ona sövq edən amillər etibarı ilə beş qismə bölünür.İmam ibnul-Qayyim buna dair demişdir: "Böyük küfr beş növdən ibarətdir: Təkzib etmə küfrü, təsdiq ilə birgə təkəbbürlük və imtina küfrü, üz çevirmə küfrü, şübhə küfrü və nifaq küfrü.

1-Təkzib etmə küfrü: Peyğəmbərlərin yalançı olduqlarını etiqad etməkdir.Bu qism, kafirlərdə az rast gəlinir.Çünki Uca Allah Öz elçilərinə onların doğru olduğuna dəlalət edən sübutlar və ayələr əta etmiş və bununla da, insanların üzərindən hüccəti qaldırıb üzürü aradan götürmüşdür.Uca Allah firon və onun tayfası haqqında buyurur: "*"Buna qəti inandıqları halda, haqsızcasına və təşəxxüslə onları dandılar."*[264]

Habelə Peyğəmbərinə demişdir: *"Əslində onlar səni yalançı hesab etmirlər. Lakin zalımlar Allahın ayələrini*

[264] ən-Nəml:14.

*inadla danırlar."*[265] Bunun təkzib etmə küfrü adlanması həmçinin doğru olardı.Çünki bu, dil ilə təkzib etməkdir."

2-İmtina və təkəbbürlük küfrü: İblisin küfrü buna misaldır.O, Allahın əmrini danmadı və onu inkarla qarşılamadı.O, yalnız onu etməkdən imtina edib təkəbbürlük göstərdi.Habelə Peyğəmbəri (salləllahu aleyhi və səlləm) tanıyıb onu təsdiq edən və onun Allah dərgahından haqq ilə gəldiyini bilən və yalnız dikbaşlıq və təkəbbürlük səbəbilə ona boyun əyməyənin küfrü bu qəbildəndir.Uca Allah firon və onun tayfası haqqında xəbər verib deyir: *"Onlar dedilər: "Bunların tayfası bizə kölə olduğu halda, biz özümüz kimi iki adama inanacağıq?"*[266]Habelə xalqlar öz peyğəmbərlərinə belə demişlər: *"Siz yalnız bizim kimi bir bəşərsiniz".*[267]Habelə buyurur:*"Səmud (qövmü) öz azğınlığı üzündən (Allahın elçisini) təkzib etdi."*[268]Habelə bu, yəhudilərin küfrüdür.Uca Allah buyurur: *"Onlara tanıdıqları (peyğəmbər) gəldikdə isə onu inkar etdilər."*[269] Habelə buyurur: *"Kitab verdiyimiz şəxslər onu öz oğullarını tanıdıqları kimi tanıyırlar."*[270]Habelə bu, Əbu Talibin küfrüdür.Belə ki, o, Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təsdiq etmiş və onun haqq olduğuna dair şübhə etməmişdir.Lakin Əbu Talibin tayfasına olan təəssübkeşliyi və əcdadlarının şənini uca tutması ona onların dinindən üz çevirməyə və onların kafir olmasına şahidlik etməyə mane olmuşdur.

---

[265] əl-Ənam:33.
[266]əl-Muminun:47.
[267]İbrahim:10.
[268] əş-Şəms:11.
[269] əl-Bəqərə:89.
[270] əl-Bəqərə:146.

3-Üz çevirmə küfrü: İnsanın qəlbi ilə Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) üz çevirməsi, onu dinləməməsi, onu nə təkzib nə də ki, təsdiq etməməsi, onunla nə dostluq nə də ki, düşmənçilik etməməsi və onun gətirdiyi dinə heç bir əhəmiyyət verməməsidir.Buna misal bənu abdu-Yəleyl tayfasından bir şəxsin Peyğəmbərə (salləllahu aleyhi və səlləm) belə deməsini misal göstərmək olar: "Vallahi sənə bircə söz deyəcəyəm: Əgər sən doğru danışansansa belə olan halda sən mənim gözümdə sənə cavab verəcəyimdən daha sayğılısan.Yox əgər sən yalan danışansansa belə olan halda səninlə danışmağa özümə rəva bilmirəm."[271]

4-Şübhə küfrü: İnsanın Peyğəmbərin (salləllahu aleyhi və səlləm) doğru yaxud yalan olmasına qəti olmaması və ona dair şübhədə olmasıdır.Şübhə edən şəxsin şübhəsi yalnız onun ümumi şəkildə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) haqq olduğuna dəlalət edən nişanələrə nəzər yetirməkdən üz çevirəcəyi təqdirdə davamlı olacaq.Həmin şəxs onu dinləmir və ona diqqət yetirmir.Lakin əgər həmin şəxs bu nişanələrə diqqət yetirib onu nəzərdən keçirtsəydi onda heç bir şübhə qalmazdı.Çünki həmin nişanələr,ələxsus cəm

[271] İbn İshaq "sira" da rəvayət edib demişdir: Yezid bin Əbu Zəyyad Muhamməd bin Ka`b əl-Qurazidən mənə təhdis edib dedi:..Daha sonra Peyğəmbərin (salləllahu aleyhi və səlləm) Taifə gedib Səqif qəbiləsinin ağalarından olan üç qardaşa özünü təqdim etməsini qeyd etdi.Bunlar: Abdu-Yəleyl, Məsud və Həbibdir.Onlar Amr bin Umeyrin övladlarıdır. Onlardan biri belə demişdir: And olsun Allaha ki, səninlə heç vaxt söhbət etməyəcəyəm.Əgər sən dediyin kimi Allahdan göndərilmiş elçisisənsə belə olan halda sözünü rədd etməyim çox təhlükəli olardı.Əgər sən Allahın adından yalan danışırsansa belə olan halda mənin səninlə söhbət etməyim gərəksizdir." Peyğəmbər (salləllahu aleyhi və səlləm) Səqif qəbiləsindən olan adamların dediyi həmin sözlərdən ümidini üzdüyü halda onların məclisindən qalxdı.(siratu ibn Hişəm:2/28. əl-Bidəyə vən nihəyə:3/135)

halında haqqı gərəkdirir.Onun haqqa dəlalət etməsi günəşin günörtaya dəlalət etməsinə bərabərdir.

5-Nifaq küfrü: Bir şəxsin dili ilə imanı aşkar edib qəlbində bunun yalan olduğunu düşünməsidir.Bu, böyük nifaqdır. Bunun qisimlərinə dair irəlidə açıqlama gələcək."[272]

Habelə demişdir: "Demişlər: Artıq Quran küfrün bir neçə qism olduğunu bəyan etmişdir:

*Birinci*: Cəhalət, zəlalət və öncəkilərə təqlid üzündən sadir olan küfr.Bu, əksər ardıcılların və avamların küfrüdür.

*İkinci*: Öncə qeyd edilənlərin küfrü kimi danma, inadkarlıq və haqqa müxalifliyi qəsd etmə küfrü.Küfrün bu növü, əsasən kafirlərdən olan tayfanın elmi rəhbərliyinə yaxud hakimiyyət rəhbərliyinə yiyələnən yaxud tayfası yanında qazanc yeri və mal-dövləti olan şəxslərdə hasil olur.Onlardan bəzisi rəhbər vəzifəsindən ötrü bəzisi isə mal-dövləti və qazanc yerindən ötrü qorxur və qəsdən küfrü imandan üstün tuturlar.

*Üçüncü*: Xalis üz çevirmə.Həmin şəxs Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyinə nəzər yetirmir, onu nə sevir nə də ki, ona nifrət etmir, onu nə dost nə də ki, düşmən bilmir.O, ona tabe olmaqdan yaxud ona düşmənçilik etməkdən tamamilə üz çevirir.Kəlam əhlinin çoxu bu iki qismi inkar edir və yalnız küfrün birinci növünü isbat edirlər.Onlar ikinci və üçüncünü, özlüyündə küfr olduğu

---

[272] Mədəricu-s-səlikin:1/346.

səbəbilə deyil sadəcə onların birinciyə dələlət etdiyi səbəbilə küfr olduğunu hesab edirlər.Onlara görə küfr yalnız cəhalətdə öz əksini tapır.

Ancaq əgər biri Quran, sunnə və peyğəmbərlərin öz ümmətləri ilə olan əhvalatları, onların dəvətləri və onların başına gələn hadisələr haqqında düşünərsə kəlam əhlinin dedikləri sözdə yanıldıqlarına əmin olar və ümumi olaraq ümmətlərdə baş vermiş küfrün öz peyğəmbərlərinin haqq olduqlarına və onların dəvətinin və gətirdikləri risalətlərin doğru olduğuna dair yəqinlik, elm və bilik üzərində olduqlarını bilər.Bu Quran, bütlərə ibadət edən müşriklərin Allahı, Onun yeganə Rəbb və yaradan olduğunu, yerdə və onun üzərində olanın Onun mülkü olduğunu, Onun yeddi göyün və əzəmətli ərşin Rəbbi olduğunu, hər bir şeyin mülkünün Onun əlində olduğunu və idarə edib idarə olunmadığını, günəşi və ayı ram etdiyini, yağmur yağdırıb bitkilər çıxardığını iqrar etmələri haqqında xəbərlərlə doludur.Quranın onlara ünvanladığı müraciət bundan ibarətdir.Quran, peyğəmbərlərin çağırdığı risalətin doğru olduğuna məhz onların iqrar etdikləri şeyləri sübut gətirir. Belə olan halda onların Rəbbi və Xaliqi heç vaxtı iqrar etmədiklərini demək nə dərəcədə doğrudur? Bu, böyük böhtandır.Küfr adicə cəhalətdən daha geniş bir məsələdir.Üstəlik ən qabarıq küfr bunların (kəlam əhlinin) inkar edib bunun küfr olmadığını iddia etmələridir."[273]

---

[273] Miftəhu dəri-s-səadəh:1/94.

## Kiçik küfrün qaydası:

Kiçik küfr, nass yaxud icma ilə onu edəcək şəxsin İslamda sabit qalacağı ilə birgə şəriətin küfr adlandırdığı hər bir günahdır.

Buna misal: Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Hər kim qardaşına: "ey kafir!",- deyərsə həmin söz onlardan birinə qayıdar.Əgər onun dediyi kimi olmazsa həmin söz sahibinə qayıdar."[274]

"Artıq o, həmin söz deyildiyi zaman onu qardaşı adlandırmiş və bu sözün onlardan birinə qayıdacağını xəbər vermişdir.Əgər onlardan biri bütövlüklə islamdan çıxmış olsaydı biri digərinin qardaşı olmazdı.Lakin bu işdə küfr vardır."[275]

Habelə buna bənzər: Mənşəyi yamanlamaq, ölü üçün ağı çəkmək, müsəlmanın digər müsəlmanla savaşması və Allahdan qeyrisinə and içməkdir.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İnsanlarda olan iki şey küfrdür: Mənşəyi yamanlamaq və ölü üçün ağı çəkmək."[276]

Habelə demişdir: "Müsəlmanı söymək fasiqlik, onunla savaşmaq isə küfrdür."[277]

---

[274] Buxari:6104.Muslim:60.Hədisi ibn Ömər (r.a) rəvayət etmişdir.
[275] Məcmu`əl-fətəva:7/355.
[276] Muslim:67.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.
[277] Buxari:48.Muslim:64.Hədisi ibn Məsud (r.a) rəvayət etmişdir.

Habelə demişdir: "Məndən sonra bir-birinizin boynunu vuran kafirlərə dönməyin."[278]

Habelə demişdir: "Kim Allahdan qeyrisinə and içərsə küfr yaxud şirk etmiş olar."[279]

Bütün bu dəlillər kiçik küfrə aid edilir.

Buna dəlalət edən amil mənşəyi yamanlamaq və ölüyə ağı çəkmək məsələsinə dair varid olan hədisdir.Belə ki, imam Muslim Əbu Məlik əl-Əşaridən (r.a) Peyğəmbərin (salləllahu aleyhi və salləm) belə dediyini rəvayət edir: Ümmətimdə tərk edilməyəcək dörd şey cahiliyyat işlərindəndir: "Əsil-nəcabət ilə öyünmə, mənşəyi yamanlama, ulduzlardan yağmur diləmə və ölüyə ağı çəkmə.Daha sonra dedi: Əgər ağı çəkən qadın ölümündən öncə tövbə etməzsə qiyamət günü üzərində qatrandan libas və qartmaqdan zirehdə qaldırılacaq."[280]

Peyğəmbərin (salləllahu aleyhi və salləm) bu əməllərin ümmətdə qalacağını və insanların onu tərk etməyəcəyini xəbər verməsi onun islamdan çıxarmayan küfr olduğunu və onu edənin Peyğəmbərin (salləllahu aleyhi və salləm) ümmətinə mənsubiyyət şərəfindən məhrum olmayacağını göstərir.

Habelə müsəlmanın müsəlmana qarşı savaşmasının islamdan çıxaran əməl olmadığına dair dəlillər vardır.Uca Allah buyurur:"*Əgər möminlərdən iki dəstə bir-biri ilə*

---

[278] Buxari:121.Muslim:65.Hədisi Cərir (r.a) rəvayət etmişdir.
[279] Tirmizi:1535.Əbu Davud:3251.Hədisi ibn Ömər (r.a) rəvayət etmişdir.
[280] Muslim:934.Tirmizi:1001.Əhməd:22955.

*vuruşsa, onları barışdırın."*[281] Habelə buyurur: *"Ey iman gətirənlər! Öldürülənlərə görə qisas almaq sizə vacib edildi. Azad kəsə görə azad olandan, köləyə görə kölədən, qadına görə qadından (qisas alın!) Əgər (qatil) qardaşı (ölənin varisləri) tərəfindən (qanbahası müqabilində) bir şeylə əfv edilsə, onda insafla davranmalı və (qanbahası) ona müvafiq qaydada ödənilməlidir. Bu, Rəbbiniz tərəfindən bir yüngülləşdirmə və mərhəmətdir. Bundan sonra kim həddi aşsa, onun üçün üzücü bir əzab vardır."*[282]

Uca Allah burada savaşan tərəflərin iman qardaşlığını isbat edir.Bu isə öz növbəsində qətl və savaşın islamdan çıxaran küfr olmadığını göstərir.[283]

Allahdan qeyrisinə and içmək məsələsinə dair imam Tirmizi "əs-sunən" kitabında ötən hədisi qeyd etdikdən sonra demişdir: Bu, həsən hədisdir.Bəzi elm əhli bu hədisdə gələn"küfr yaxud şirk etmiş olar" sözlərini çəkindirmə olaraq izah etmişlər.Buna sübut olaraq ibn Ömər (r.a)rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) Ömərin: Atama and olsun!-dediyini eşitdiyi zaman dedi: Agah olun ki, Allah sizə atalarınıza and içməyi qadağan edir." Habelə Əbu Hureyra (r.a) rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Kim and içdiyi zaman: Lat və Uzzaya and olsun!-deyərsə "lə iləhə illəllah" kəlməsini desin." Əbu İsa demişdir: Bu, Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) rəvayət edilən: Doğrudan da, riya şirkdir,-sözləri mislindədir.

---

[281] əl-Hucurat:9.
[282] əl-Bəqərə:178.
[283] Şərhul vasitiyyə, şeyx Fəuzan:163-cü səh.

İmam Əbu Ubeyd əl-Qasim bin Salləm (rahiməhullah) demişdir: "Küfr və şirk və onların günahlar nəticəsinə vacib olması haqqında bəhs edən əsərlərə gəldikdə isə onların mənası bizə görə onu edənə küfr və şirki isbat etmir və sahibindən imanı aparmır.Ona dair yanaşma həmin küfrün yalnız kafirlərin və müşriklərin üzərində olduqları yolu və əxlaqından olmasıdır."[284]

Əhli sunnənin bu mövzuda etimad göstərdiyi əsas, bir kişidə bəzən küfr və imanın, şirk və tövhidin, təqva və pozğunluğun, nifaq və imanın bir arada yer almasının mümkünlüyüdür.Bu, Əhli sunnənin ən böyük təməllərindən biridir.Bu məsələdə onlara xəvaric, mötəzilə, qədəriyyə kimi bidət əhli müxalif olmuşlar.Böyük günah sahiblərinin atəşdən çıxması və onların orada əbədi qalması məsələsi məhz bu təməl üzərində qurulmuşdur."[285]

Şeyx ibn Useymin (rahiməhullah) "İnsanlarda iki şey küfrdür" hədisini şərh edərkən demişdir: "Onun "küfr" deməsi, yəni bu iki xislət küfrdür.Mömində küfrdən iki xislətin mövcud olması onun kafir olmasını vacib etmir.Habelə kafirdə həya, şücaət, comərdlik kimi iman xislətlərinin mövcud olması onun mömin olmasını vacib etmir.Şeyxul-İslam demişdir: Lakin Peyğəmbərin (salləllahu aleyhi və salləm) bu sözləri fərqlidir: "Kişi ilə şirk və küfr arasında namazın tərk edilməsi durur."[286]Belə ki, Peyğəmbər (salləllahu aleyhi və salləm) burada gerçəyə dəlalət edən "əlif-ləm"

---

[284] əl-İmən, Əbu Ubeyd:43-cü səh.
[285] əs-Salət, ibnul Qayyim:51-ci səh.
[286] Muslim:82.

müəyyənlik ədatını qeyd etmişdir.Bu səbəbdən, burada qəsd edilən küfr İslamdan çıxaran küfrdür.Küfrün qeyri-müəyyənlikdə gəlməsi isə fərqli məna daşıyır və İslamdan çıxmağa dəlalət etmir."[287]

Habelə Şeyxul-İslam kiçik şirkin tərifinə dair demişdir: "Şəriətin şirk olaraq vəsf etdiyi hər bir sözlü və feli əməldir. Ancaq Allahdan qeyrisinə and içən şəxs kimi onun sahibi islamdan çıxmır."[288]

Bilmək lazımdır ki, Allahdan qeyrisinə and içmək, riya, ulduzlardan yağmur diləmək kimi kiçik şirkin formalarına dair qeyd edilənlər bəzi hallarda böyük şirkə çevrilir.Şeyx ibn Useymin (rahiməhullah) demişdir: "İnsan and içdiyi şəxsi təzim edib onun Uca Allaha tay olduğunu etiqad edəcəyi zaman Allahdan qeyrisinə and içmək böyük şirk olacaq.Əks halda kiçik şirk olacaq."[289]

*Bildiriş*:

Quran və sunnədə varid olan küfr və şirk sözlərinin, ələxsus "əlif-ləm" müəyyənlik ədatı ilə gələn sözlərin mütləq gerçəyə və həmin sözlərin mütləq anlamına aid edilməsi məsələnin əsasıdır.Bu isə həmin sözlərin, heç bir maneə olmayacağı və həmin sözlərin kiçik küfrü və kiçik

---

[287] əl-Qaulul mufid şərh kitəbi-t-təuhid:2/216. ət-Tə`liq alə sahih Muslim: 1/291.Şeyxul-İslamın qeyd edilən sözləri "iqtidau-s-sıratil mustəqim:1/237" kitabındadır.

[288] Məcmu` əl-fətəva şeyx ibn Useymin:2/203.Şərhul usuli-s-sələsə dımnə məcmu`əl-fətəva ləhu:7/115.

[289] əl-Qaulul mufid:2/325.

şirki tələb etməyəcəyi təqdirdə islamdan çıxaracağını bildirir.

Şeyx Abdul-Lətif bin Abdur-Rahmən bin Həsən (rahiməhullah) demişdir: "Zülm, asilik, fasiqlik, pozğunluq, dostluq, düşmənçilik, etimad etmə, şirk və bu kimi Quran və sunnədə varid olan sözlər ilə bəzən onların mütləq anlamı və mütləq gerçəyi, bəzən isə onların gerçəyinin mütləqi qəsd edilir.Birinci, üsul alimlərinə görə əsasdır.İkinci isə yalnız ləfzi yaxud mənanı şamil edən sübut olacağı təqdirdə cümlə həmin mənaya aid ediləcək.Bu isə yalnız Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bəyanı və sunnənin izahı ilə bilinən bir məsələdir.Uca Allah buyurur:*"Biz hər bir elçini ancaq öz xalqının dilində danışan göndərdik ki, (haqqı) onlara bəyan etsin."*[290][291]

Bunun əsas olduğuna dəlalət edən amillərdən biridə, bunun insan ağlına gələn ilk şey olmasıdır.Belə ki, ibn Abbasın (r.a) rəvayət etdiyi "xusuf" günəşin batması hədisində Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Mənə cəhənnəm göstərilmişdir.Mən bu gün gördüyüm mənzərədən daha dəhşətli bir şeyheç vaxtı görməmişəm. Habelə atəş əhlinin çoxunun qadınlar olduğunu gördüm. Ona: Nə səbəbə görə ey Allahın elçisi!-deyə sual verdilər və o, dedi: Onların küfrü üzündən.İnsanlar dedi: Onlar Allaha küfr edirlərmi? Peyğəmbər(salləllahu aleyhi və səlləm) cavab olaraq dedi: "Onlar öz ərlərinə nankorluq edir və yaxşılığı

---

[290] İbrahim:4.

[291] ər-Rasəilul mufidə liş-şeyx Abdil-Lətif.Şeyxın sözlərini toplayan Süleyman bin Sahmandır:21-ci səh.

danırlar.Əgər sən onlardan birinə ömür boyu yaxşılıq edər daha sonra o, səndən bir şey görərsə: Səndən heç vaxtı xeyir görmədim,-deyəcək."[292]

[292] Buxari:1052.Muslim:907.

# Dördüncü araşdırma:

# Müəyyən şəxslərin

# təkfir edilməsində ehtiyatlı olmaq

Qeyd olunduğu kimi böyük küfr, söz, əməl, etiqad və tərk etmə ilə olur və həmin küfrə ölülərə dua etmək, Allahdan qeyrisinə qurban kəsmək, Quran yazısını murdar yerə atmaq, zina və şərabın halal olduğunu etiqad etmək və digər küfr söz və əməllər daxil olur.Ancaq bu işlərin müəyyən bir şəxs tərəfindən sadir olması onun bir-başa təkfir edilməsini gərəkdirmir.Çünki təkfir məsələsinə aid olan şərtlərin mövcud olub maneələrin aradan qalxması labüddür.Buna səbəb bəzən bir şəxsin xəta, cəhalət və məcburiyyət səbəbilə üzürlü olmasıdır.

Bu kitabda təkfirin qaydaları, şərtləri və maneələri haqqında geniş söhbət açmaq yersiz olardı.Artıq buna dair çoxlu kitablar yazılmışdır.[293] Lakin məqsədimiz iki məsələyə toxunmaqdır:

*Birinci*: Bəzən hər hansı bir yöndən üzürlü olan müəyyən şəxsə hökm verməkdə ehtiyatlı olmağın və tələskənliyə yol verməməyin zəruriliyi.Bunun üçün Şeyxul-İslam demişdir: “Onlar, təkfirin şərtlər və maneələrdən ibarət olduğuna və onun bəzən müəyyən şəxsdə öz əksini tampadığına və

[293] Nəvaqidul imən əl-qauliyə vəl aməliyyə, Abdul-Əziz bin Muhamməd Abdul-Lətif:52-84-cü səh.Mənhəc ibn Teymiyyə fi məsələti-t-təkfir, Abdul-Məcid bin Səlim əl-Mişabi:1/193-273.Davabitu-t-təkfir ində şeyxeyi-l-isləm ibn Teymiyyə va ibn Abdil-Vahhəb, Əbul Ulə bin Raşid bin Əbul Alə ər-Raşid:39-176-cı səh.

mütləq təkfirin yalnız şərtlər olub maneələr aradan qalxacağı zaman müəyyən şəxsə nisbətdə gərəkli olduğuna dair düşünməmişlər.Bu isə ümumi ifadələri dilə gətirən imam Əhməd və bütün digər imamların, bu sözləri danışan əksər insanları müəyyən olaraq təkfir etmədiklərini bəyan edir."[294]

Habelə demişdir: "Məsələnin əsası olaraq, Quran, sunnə və icma ilə küfr olan sözə dair belə deyiləcək: O, mütləq söz olaraq küfrdür.Buna şər`i dəlillər dəlalət etməkdədir.Çünki iman, Allahdan və Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) mənimsənən əhkamlardan biridir.Bu, insanların şəxsi düşüncəsi və nəfsi istəyilə hökmü çıxarılan işlərdən deyil. Təkfirin şərtləri sabit olub maneələri aradan qalxmayınca heç də bunu dilə gətirən hər bir şəxsin kafir olduğuna dair hökm vermək vacib deyil.Misal olaraq bir şəxs: Şərab və sələmçilik halaldır,-sözlərini, İslamda yeni olduğu yaxud uzaq bir çöllükdə yaşadığı yaxud bir söz eşidib onun Qurandan və Peyğəmbərin hədislərindən olmadığını etiqad edib onu inkar etdiyi səbəbilə deyir."[295]

Habelə demişdir: "Bu məsələyə dair doğru görüş, Allahın kəlam sifəti ilə vəsf olunmadığını və axirətdə görünməyəcəyini deyən cəhmiyyələrin sözü kimi bəzən hər hansı sözün küfr olmasıdır.Lakin bəzən bir qism insanlara bunun küfr olduğu gizli qaldığı səbəbilə küfrü dilə gətirənin təkfir edilməsinə dair ümumi söz deyilir.Belə ki, sələf demişlər: Quranın məxluq olduğunu deyən şəxs

---

[294] Məcmu`əl-fətəva:12/478.

[295] Məcmu`əl-fətəva:35/165.

kafirdir. Habelə kim Allahın axirətdə görünməyəcəyini deyərsə kafir olar.Ancaq qeyd edildiyi kimi hüccət qalxmayana qədər müəyyən şəxs təkfir edilməz.Misal olaraq təvil edib namazın və zəkatın vacibliyini danan, şərab və zinanı halal sayan şəxs. Həmin əhkamlar müsəlmanlar arasında yuxarıdaki əhkamlardan daha aşkardır.Bu səbəbdən həmin işlərdə yozum edib yanlışlıq edən şəxsə yalnız bəyan edilib tövbə ərz ediləndən sonra küfr hökmü çıxarılırsa digər şeydə belə olması daha öndədir.Buna, şərabı halal sayan bir sıra insanlara qarşı səhabələrin tutduğu mövqeyi göstərmək olar."[296]

Habelə demişdir: "Bu səbəbdən imamlar yekdil olmuşlar ki, elm və iman əhlindən uzaqda yerləşən bir çöllükdə yaşayan və İslamda yeni olan şəxs aşkar və mütavatir əhkamlardan bir şeyi inkar edərsə ona Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi din anlatılana qədər küfr hökmü çıxarılmaz."[297]

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir: "Üzərindən hüccət qalxmayan şəxs İslamda yeni olan yaxud uzaq bir çöllükdə yaşayandır.Yaxud da bu, ayırma və qovuşdurma sehri kimi gizli məsələlərdə olur.Belə şəxs anlatılmayınca təkfir olunmur.Lakin Allahın açıqladığı dinin əsaslarnda və kitabında bəyan etdiyi əhkamlarında Allahın hüccəti Qurandır.Əgər o, bir şəxsə çatarsa artıq ona hüccət çatmış olar. Lakin anlaşılmazlığın əsası sizin hüccətin

[296] Məcmu`əl-fətəva:7/619.
[297] Məcmu`əl-fətəva:11/407.

qalxması ilə hüccətin anlaşılması arasında fərq qoymamağınızdan irəli gəlir."[298]

*İkinci*: Bildirmək lazımdır təkfirin qaydaları haqqında danışan bəzi insanlar bu məsələdə böyük xətaya yol vermişlər. Belə ki, onlar düşünmüşlər ki, şəhvət yaxud dünya istəyi təkfirin maneələrindən biridir və insan yalnız küfrü qəsd edəcəyi, onu etiqad edəcəyi və buna razı olacağı halda kafir olur.

Onlar düşünmüşlər ki, insan yalnız qəsdən və bilərəkdən küfr söz deyərsə yaxud küfr əməl edərsə kafir olar.Daha sonra bunu deyən iddia etsə ki, o bununla küfrü deyil və yalnız hər hansı bir istəyinə yaxud dünya mənfəətinə nail olmağı qəsd edərsə kafir olmaz.

Bu, açıq-aydın zəlalətdır və Quran və sunnənin bir sıra nasslarına ziddir.Uca Allah küfr və mürtədliyin səbəblərindən dünya həyatına olan sevgi və istəyin olduğunu bəyan etmişdir. Daha sonra bəzi insanlar peydə olub bunu təkfirin maneələrindən biri olaraq təqdim edirlər.

1-Uca Allah buyurur:*"Qəlbi imanla sabit qaldığı halda (haqqı danmağa) məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır. Bu ona görədir ki, onlar dünya həyatını axirətdən üstün tuturlar. Həm də Allah kafirləri doğru yola yönəltmir."*[299]

---

[298] əd-Duraru-s-səniyyə:10/434.
[299] ən-Nəhl:106-107.

**2-Uca Allah buyurur:** *“Onlardan (nə üçün istehza etdiklərini) soruşsan, deyərlər: “Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!” De: “Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz”. Sizlərdən bir qismini bağışlasaq da, digərlərinə günahkar olduqlarına görə əzab verərik.”*[300]

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Bəzən kafir həmin zərərin olduğunu bilir lakin dünya sevgisi onu küfrə sürükləyir.Bunu irəlidəki ayələr açıqlayır:*“Qəlbi imanla sabit qaldığı halda (haqqı danmağa) məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır. Bu ona görədir ki, onlar dünya həyatını axirətdən üstün tuturlar. Həm də Allah kafirləri doğru yola yönəltmir.Bunlar o kəslərdir ki, Allah onların qəlblərini, qulaqlarını və gözlərini möhürləmişdir. Onlar qafildirlər! Şübhəsiz ki, axirətdə ziyana uğrayanlar da onlardır!”.*[301] Uca Allah iman gətirdikdən sonra kafir olanı, habelə onun axirətdə olan cəzasını qeyd edib demişdir: *“Bu ona görədir ki, onlar dünya həyatını axirətdən üstün tuturlar.”* Uca Allah onların layiq görüldüyü cəzanın bu səbəbdən olduğunu bəyan etmişdir. Uca Allah dünyanı axirətdən üstün tutmağı, ziyanı vacib edən əsas amil etmişdir.Bəzən dünyanı axirətdən üstün tutma,küfrün axirətdə zərər verəcəyinə və onu edənin axirətdə heç bir paya sahib olmayacağına dair bilgi və təsdiq ilə birgə hasil olur.”[302]

---

[300]ət-Təubə:65-66.

[301] ən-Nəhl:106-109.

[302] Məcmu`əl-fətəva:7/559.

Bəzi insanlara Uca Allahın “*kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa”* sözlərində gələn məna müəmmalı qaldığı səbəbilə onlar bunun təkfir üçün şərt olduğunu və həmin sözləri dilə gətirənin bu sözləri ilə küfrü yaxud mal-mətanı qəsd edib etmədiyini bilməyin vacib olduğunu düşünmüşlər.Əslində isə ayədə onların görüşünə dəlalət edən heç bir amil yoxdur və həmin qeyd xüsusi olaraq məcbur edilənin təkfir edilməsi məsələsinə aid edilir. Belə ki, insan küfrdən razı qalmayacağı təqdirdə məcburiyyət halında kafir olmur.Ancaq əgər insan könüllü olaraq küfr sözü dilə gətirərsə artıq bundan razı olmuş sayılacaq.

Artıq Şeyxul-İslam bu məsələni müəllifi olduğu kitablarda ətraflı izah etmişdir.İbn Teymiyyə (rahiməhullah) demişdir: “Əgər biri ehtiyac olmadan, qəsdən və dediyi sözün küfr olduğunu bildiyi halda küfr sözü dilə gətirərsə, həmin şəxs həm zahirən həm də, daxilən kafir olar.Onun daxildə mömin olmasının caiz olduğunu demək qadağandır.Kim bunu deyərsə İslamdan xaric olar.Uca Allah buyurur: *“Qəlbi imanla sabit qaldığı halda (haqqı danmağa) məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır.”*

Məlumdur ki, həmin şəxs küfr ilə yalnız qəlb etiqadını qəsd etməmişdir.Çünki insanın buna məcbur edilməsi mümkün deyil.Allah məcbur edileni istisna etmiş və heç də küfrü deyib onu etiqad edəni qəsd etməmişdir.Çünki O, məcbur ediləni istisna etmişdir.İnsan etiqad və sözə məcbur

edilə bilməz.İnsan yalnız sözə məcbur edilə bilər.Bununla da məlum olur ki, əgər biri küfr söz danışarsa Allahın qəzəbinə gələr, böyük əzaba duçar olar və məcbur edilib qəlbi imanla sabit olan istisna olmaqla kafir olar.Məcbur edilənlərdən küfrə razı olan həmçinin kafir olur. Bununla da, küfr sözü dilə gətirməyə məcbur edilib qəlbi imanla sabit olan istisna küfr sözü dilə gətirən hər bir şəxs kafirə çevrilir.Uca Allah istehza edənlər haqqında buyurur: "*Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz*".Uca Allah onların, dedikləri sözün doğru olduğunu etiqad etmədikləri ilə birgə sözlə kafir olduqlarını bəyan etmişdir.Bu, geniş mövzudur.Qeyd edildiyi kimi buna dair bilgi, qəlb təsdiqinin sevgi və təzimi vacib etdiyi kimi onun alçaltma və sayğısılıq mənasını daşıyan söz yaxud əməli qəsd etməyə mane olmasıdır."[303]

Habelə demişdir: "Əgər deyilərsə ki, Uca Allah belə buyurur: "*kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa*", həmin şəxsə deyiləcək: Bu, onun əvvəlinə uyğun gəlir.Çünki əgər biri məcbur edilmədən küfr edərsə artıq küfrə razı olmuş sayılacaq.Əks halda ayənin əvvəli axırına zidd gəlmiş olacaq.Əgər burada kafir olan ilə küfrə razı olan şəxs qəsd edilsəydi ancaq məcbur edilən şəxs istisna edilməzdi.Çünki bu, məcburiyyətsiz olur.Belə olan halda küfrə razı olmayacağı təqdirdə həm məcbur ediləni, həm də, məcbur edilməyəni istisna etmək vacib olardı.İnsan könüllü surətdə küfr söz danışdığı zaman küfrə razılaşmış olur.Buna Uca Allahın ayələri dəlalət edir: "*Münafiqlər*

[303] əs-Sarimul məslul:3/975.

*ürəklərində olanı xəbər verəcək bir surənin nazil edilməsindən çəkinirlər. De: "Siz istehza etməyinizdə olun. Allah qorxub çəkindiyiniz şeyi üzə çıxaracaqdır! Onlardan (nə üçün istehza etdiklərini) soruşsan, deyərlər: "Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!" De: "Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz". Sizlərdən bir qismini bağışlasaq da, digərlərinə günahkar olduqlarına görə əzab verərik."*[304] Uca Allah onların: Biz küfr sözü onu etiqad etmədən dedik və biz sadəcə söhbət edib zarafatlaşırdıq,- sözlərini demələri ilə bərabər iman gətirdikdən sonra kafir olduqlarını xəbər vermişdir.Allah, Onun ayələri ilə istehza etməyin küfr olduğunu və bunu yalnız həmin sözdən razı qalan şəxsin edəcəyini bəyan etmişdir.Əgər insanın qəlbində iman olsaydı onun imanı bu sözü dilə gətirməyə mane olardı."[305]

Habelə demişdir: "Həmçinin: Uca Allah kafirlərdən məcbur ediləni istisna etmişdir.Əgər küfr yalnız qəlb təkzibi və cəhaləti səbəbilə olsaydı Uca Allah məcbur ediləni ondan istisna etməzdi.Çünki insanın buna məcbur edilməsi qeyri-mümkündür.Bununla məlum olur ki, küfr söz danışmaq, məcburiyyət halı istisna olmaqla küfrdür.Uca Allah buyurur: "*qəlbini küfrə açsa*".Yəni, dünyanı axirətdən üstün tutduğu səbəbilə bunu etsə.Peyğəmbər (salləllahu aleyhi və sələm) bu xüsusda buyurur: "İnsan mömin olaraq sabaha çıxacaq axşam isə kafirə çevriləcək. Habelə mömin olaraq axşama

---

[304] ət-Təubə:64-66.

[305] Məcmu`əl-fətəva:7/220.

çıxacaq səhər isə kafirə çevriləcək.Dinini dünya mənfəətindən ötrü satacaq."[306]

Ayələr Ammar bin Yəsir, Biləl bin Rabah və onlar kimi zəif möminlərə dair nazil olmuşdur.Belə ki, müşriklər onları Peyğəmbəri (salləllahu aleyhi və sələm) söyməyə və bu kimi küfr sözlər deməyə məcbur etdikləri zaman Ammar kimi onlardan bir qismi dili ilə onların istədiyini yerinə yetirmiş Biləl kimi bir qismi isə başına gələn bəlaya dözmüşlər. Onlardan heç biri qəlbində olana zidd bir şeyə məcbur edilməmişdir.Onlar sadəcə küfrü dil ilə deməyə məcbur edilmişlər.Bu səbəbdən, əgər biri məcburiyyətsiz küfr danışarsa, yalnız bundan razı qaldığı səbəbilə bunu etmiş olar."[307]

Bununla da bəlli olur ki, küfrdən razı qalaraq onun könüllü surətdə dilə gətirilməsi təkfirdə şərt yaxud qeyd deyil və sadəcə zəruri bir vəsfdir.

Həmçinin Şeyxul-İslam Muhammədd bin Abdul-Vahhəbin dərin bilgisinin göstəricisi onun "kəşfu-ş-şubuhat" risaləsini ən-Nəhl və ət-Təubə surələrində gələn ayələri qeyd etməklə bitirməsidir.Şeyx demişdir: "Ancaq sənə Allahın kitabında iki ayəni anlatmaq gərəkdir:

*Birinci*: Uca Allah buyurur: "*Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz*".Peyğəmbərlə (salləllahu aleyhi və sələm) birlikdə rumlulara qarşı yürüşə çıxan bəzi səhabələrin əyləncə və zarafat olaraq dilə gətirdikləri sözə

---

306 Muslim:118.Hədisi Əbu Hureyra rəvayət etmişdir.

307 Məcmu`əl-fətəva:7/560.

görə kafir olduqlarına əmin olduğun zaman sənə bəlli olur ki, küfr sözü dilə gətirib mal-mülkün yaxud ad-sanın azalmasından ehtiyat etmək yaxud kiməsə xoş gəlmək məqsədilə onu etmək bunu zarafatla dilə gətirməkdən daha acınacaqlıdır.

İkinci ayə: Uca Allah buyurur: "*Qəlbi imanla sabit qaldığı halda (haqqı danmağa) məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır. Bu ona görədir ki, onlar dünya həyatını axirətdən üstün tuturlar. Həm də Allah kafirləri doğru yola yönəltmir.*"Uca Allah bunlardan yalnız qəlbi imanla sabit olduğu halda küfrə məcbur edildəni üzürlü etmişdir.Bundan savayı isə iman gətirdikdən sonra kafir olmuşdur və onun bu sözləri qorxu yaxud kiməsə xoş gəlmək yaxud vətəninə və ya ailəsinə və ya yaxınlarına və ya mal-mülkünə sahib çıxmaq səbəbilə etməsi yaxud bunu zarafatla və ya başqa məqsədlə etməsi eynidir və bunlardan yalnız məcbur edilən müstəsnadır.

Ayə buna iki cəhətdən dəlalət edir:

*Birinci*: Uca Allah buyurur: "*məcbur edilən kəslər istisna olmaqla*".Uca Allah yalnız məcbur edildəni istisna etmişdir. Məlumdur ki, insan yalnız sözə və ya hərəkətə məcbur edilə bilər.Qəlbin etiqadına isə heç kəs məcbur edilə bilməz.

*İkinci*: Uca Allah buyurur: "*Bu ona görədir ki, onlar dünya həyatını axirətdən üstün tuturlar*". Uca Allah bu küfr və əzabın etiqad, cəhalət, dinə nifrət və küfrə sevgi səbəbilə

olmadığını bildirmişdir.Buna səbəb isə yalnız insanın əldə edəcəyi dünya mənfəətlərindən bir şeyi dindən üstün tutmasıdır."[308]

Şeyx Salih əl-Fəuzan (hafizahullah) bu məsələni şərh və izah edərək demişdir: "Nəticə etibarı ilə küfr sözünü dilə gətirən şəxs beş haldan kənar çıxmır:

*Birinci hal*: Bunu qəlbi ilə etiqad etməsidir.Beləsinin küfründə heç bir şübhə yoxdur.

*İkinci hal*: Bunu qəlbi ilə etiqad etmədiyi və buna məcbur edilmədiyi halda həmin şeyi dünya tamahı yaxud insanların xoşuna gəlmək və onlara müvafiq gəlmək üçün etməsidir.Belə bir şəxs Quran ayəsinə əsasən kafirdir.Uca Allah buyurur: "*Bu ona görədir ki, onlar dünya həyatını axirətdən üstün tuturlar*".

*Üçüncü hal*: Sevmədiyi və qəlbi ilə etiqad etmədiyi halda küfr və şirki öz yaxınlarına müvafiq gəlməkdən ötrü etməsidir. Həmin şəxs bunu ölkəsinə yaxud mal-mülkünə yaxud yaxınlarına bağlı olduğu səbəbilə edir.

*Dördüncü hal*: Qeyd edilən şəxslər etdiyi kimi bunu zarafat və əyləncə məqsədi ilə etməsidir.Bu şəxs, ayənin məzmununa əsasən kafir olur.

*Beşinci hal*: Bunu öz ixtiyarı ilə deyil məcburi etməsidir. Lakin həmin şəxsin qəlbi imanla sabit olmalıdır.Bu şəxs, məcburiyyəti dəf etmək üçün bu işdə rüxsətə sahib olur.

---

[308] Kəşfu-ş-şubuhat, dımnə-l-cəmi` əl-fərid:277.

Ötən dörd halda isə bunu edən şəxs ayələrdə qeyd edildiyi kimi kafir olur.

Burada belə deyən şəxsə rəddiyə vardır: İnsan küfr söz deyəcəyi yaxud küfr əməllər edəcəyi halda belə onun qəlbində olan etiqad bilinməyənə qədər ona küfr hökmü çıxarılmaz.Bu, nasslara müxalif olan batil sözdür.Habelə bu, azğın murciələrin sözüdür."[309]

Habelə demişdir: "Bu isə belə deyənin sözünün batilliyini göstərir: Əgər biri küfr söz deyər yaxud küfr əməl edərsə, dediyini və etdiyini qəlbi ilə etiqad etməyincə kafir olmaz. Habelə belə deyənin: Cahil soruşub öyrənmək imkanına malik olsa belə mütləq şəkildə üzürlüdür.Bu sözlər, zamanımızda elm və hədisə nisbət olunan bəzi şəxslər tərəfindən ortaya atılmışdır."[310]

Şeyx Haməd bin Əli bin Atiq (rahiməhullah) müxaliflərdən birinə cavab verərkən demişdir: Həmin şəxs, Allahın Öz Peyğəmbərini göndərdiyi Quran və sunnədən, habelə səhabələrin və onlardan sonra gələn elm əhlinin yolundan çıxıb demişdir: Bizim Allaha olan etiqadımız küfrə razı olan, yəni qəlbini küfrə açan və genişlədən, bununla da, dindən xaric olub küfrü bəyənən şəxsi təkfir etməkdir.Bu, onun ifadəsidir.Onun sözündən elə çıxır ki, küfr deyən yaxud edən şəxs kafir olmur və həmin şəxs yalnız küfrə qəlbini açacağı təqdirdə kafir olur.Bu, sağlam ağıla və səhih xəbərlərə zidd gələn sözdür, habelə möminlərin yolundan qeyrisinə tabe olmaqdır.Çünki Allahın kitabı, Peyğəmbərin

---

309 Şərhu kəşfi-ş-şubuhat, şeyx Salih əl-Fəuzan:122.

310 Öncəki mənbə:55-ci səh.

(salləllahu aleyhi və səlləm) sunnəsi və ümmətin icması küfr deyənin yaxud küfr edənin küfrdən razı qalmasının şərt olmadığına yekdil olmuşlar.Onlardan yalnız məcbur edilən istisna edilmişdir.Küfrə razı olan isə, yəni qəlbini küfrə açan, onu həzm edən və ondan xoş olan şəxs, bunu dilə gətirməsə və bədən əzaları ilə etməsə belə kafir və Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) düşmənidir.Buna Quran, sunnə və ümmətin icması dəlalət edir.Bunu bir neçə cəhətdən bəyan edəcəyik..."[311]

Artıq "ət-Təubə" surəsində gələn ayənin nazil olma səbəbinə dair ibn Cərir, ibn Əbu Hatim, Əbu-ş-Şeyx və ibn Mərduyə Abdullah bin Ömərin (r.a) belə dediyini rəvayət etmişlər:"Təbuk yürüşü zamanı bir adam məclisdə belə demişdir: Biz bu qarilərimiz kimi qarın doyduran, yalan danışan və düşmənlə qarşılaşma zamanı qorxaqlıq edən şəxs görməmişik.Məclisdə olan bir kişi dedi: Yalan danışdın. Ancaq sən münafiqsən. Mütləq bunu Peyğəmbərə xəbər verəcəm.Peyğəmbərə (salləllahu aleyhi və səlləm) bu xəbər çatdığı zaman artıq buna dair Quran nazil olmuşdu.Abdullah bin Ömər (r.a) dedi: Mən həmin şəxsi, ayağları daşlara dəyə-dəyə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dəvəsinin kəndirindən sallanıb belə dediyini gördüm: Ey Allahın elçisi, biz yalnız söhbət edib əylənirdik.Peyğəmbər (salləllahu aleyhi və səlləm) isə cavab olaraq deiyrdi: "*Allaha, Onun ayələrinə və Onun*

---

[311] əd-Difə` an əhli-s-sunə vəl ittibə`:20-ci səh.Artıq bu zəlalətə on yöndən cavab vermişdir.

*Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz"*[312]

Bilmək lazımdır ki, iman gətirdikdən sonra kafir olmuş həmin istehza edən şəxslər, bəzi alimlərin dediyi kimi bundan öncə kafir və münafiq olmamışlar.Doğru görüş onların zəif imanlı müsəlman olmalarıdır.Lakin onların zəif imanı kafir olduqları sözü deməyə onlara mane olmamışdır.

Artıq Uca Allah onların küfrünün başqa bir şeyə görə deyil məhz bu sözə görə olduğunu bəyan etmiş və onların iddia etdikləri zarafatı və küfrü qəsd etmədiklərini təkzib etməmişdir.Şeyxul-İslam buna dair demişdir: "Bəzi adamlar bu ayələr barədə demişlər: Onlar ilk olaraq qəlbləri ilə kafir olmuş daha sonra dilləri ilə iman gətirdikdən sonra kafir olmuşlar.Bu, doğru deyil.Çünki qəlbdə küfr ilə birgə dildə iman etmək küfrü sabit edir.Belə şəxslər haqqında: Siz iman gətirdikdən sonra artıq kafir oldunuz,-deyilməz.Çünki onlar əslən kafir olaraq qalmışdılar.Ancaq əgər burada: Siz imanı aşkar etdikdən sonra küfrü aşkar etdiniz,-mənası qəsd edilərsə, belə olan halda həmin şəxslər bunu yalnız yaxın ətrafı önündə aşkar etmişlər.Onlar isə yaxın ətrafı ilə daimə belə olmuşlar. Lakin onlar münafiqlik edib onların qəlblərində olan nifaqı aşkara çıxaracaq surənin nazil olmasından həzər etdikləri və istehza məzmunlu söz danışdıqları zaman iman gətirdikdən sonra kafir olmuşlar. Varid olan ləfz onların öncə münafiq olduqlarına dəlalət etmir.Uca Allah buyurmuşdur: *"Ya Peyğəmbər! Kafirlərə və münafiqlərə qarşı vuruş! Onlarla sərt davran! Onların məskəni Cəhənnəmdir. Ora nə pis yerdir! (Münafiqlər) Allaha and içirlər ki, (Peyğəmbər haqqında nalayiq sözlər) deməyiblər. (And olsun ki) onlar küfr sözünü demiş, islamı*

[312] Təfsir ibn Cərir:6/408.İbn Kəsir:2/483.

*qəbul etdikdən sonra kafir olmuş, müvəffəq ola bilmədikləri bir işə girişmişdilər. (Onların) kin-küdurət bəsləmələrinin səbəbi yalnız Allahın və Peyğəmbərinin Öz nemətləri ilə onları varlandırmasıdır. Bununla belə, əgər tövbə etsələr, onlar üçün xeyirli olar. Yox, əgər üz döndərsələr, Allah onları dünyada və axirətdə şiddətli bir əzaba mübtəla edər."*[313] Burada: "*islamı qəbul etdikdən sonra kafir olmuş*",- demişdir.Bu islam, çöl ərəblərinin növündən olan islam ola bilər.Belə olan halda, İman gətirdikdən və islamı gəbul etdikdən sonra sözləri eyni olacaq.Habelə onların öncədən münafiq olması mümkündür. Belə olan halda küfr və mürtədliyi aşkar etdikləri etibarı ilə onlar heç bir imana sahib olmamışlar.Bu səbəbdən Uca Allah onları tövbəyə çağırıb demişdir: *"əgər tövbə etsələr, onlar üçün xeyirli olar*". "*Yox, əgər üz döndərsələr"*, yəni tövbədən sonra tövbədən üzr döndərsələr "*Allah onları dünyada və axirətdə şiddətli bir əzaba mübtəla edər*".Bu, yalnız küfrü aşkara çıxaran şəxsə aiddir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) hədd və cəzanı yerinə yetirmək məqsədilə belə şəxslərə qarşı vuruşmuşdur. Bu,növbəti ayədə qeyd edilmişdir: "*Kafirlərə və münafiqlərə qarşı vuruş! Onlarla sərt davran!*". Habelə ayənin sonunda demişdir: *"Yer üzündə onların nə bir dostu, nə də bir imdada yetəni var!*"

İslamı qəbul etdikdən sonra kafir olan bu sinif insanlar iman gətirdikdən sonra kafir olan şəxslərdən deyillər.Çünki həmin adamlar dedikləri sözdə Allaha and verdilər.Onlar islamı qəbul etdikdən sonra onları kafirə çevirən sözü dilə gətirdilər və nail ola bilməyəcəkləri şeyi özlərinə məqsəd qoydular.Bu isə onların bu işdə səy göstərdiklərini ancaq öz məqsədlərinə çata bilmədiklərini göstərir.Uca Allah orada:

[313] ət-Təubə:73-74.

Onlar etmədikləri şeyi qəsd etmişlər,-deməmişdir.O, ancaq onların nail ola bilməyəcəkləri şeyi qəsd etdiklərini demişdir. Həmin şəxslərdən həm söz həm də, əməl sadir olmuşdur.Uca Allah buyurur: "*Onlardan (nə üçün istehza etdiklərini) soruşsan, deyərlər: "Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!"*.Onlar etiraf edib üzr istəmişlər.Bu səbəbdən onlara deyildi: "*Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz". Sizlərdən bir qismini bağışlasaq da, digərlərinə günahkar olduqlarına görə əzab verərik.*" Bu ayələr göstərir ki, həmin şəxslər etdikləri əməlin küfr olmadığını düşünmüş və bunun küfr olduğunu ağıllarına gətirməmişlər.Uca Allah onlara Allah, Onun ayələri və Peyğəmbəri ilə istehza etməyin küfr olduğunu və bunu edənin iman gətirdikdən sonra kafir olacağını bəyan etmişdir.Bu isə onların zəif imana sahib olduqlarını göstərir. Onlar haram olması barədə bilgiyə sahib olduqları şeyi etmiş lakin onun küfr olduğunu bilməmişlər.Bu, onları kafirə çevirən küfr olmuşdur.Onlar isə onun caiz olduğunu etiqad etməmişlər."[314]

Şeyx Süleyman bin Səhman (rahiməhullah) demişdir:"O, dedi: Kafir yalnız imanı seçməsi ilə mömin olduğu kimi eynilə mömin küfrü qəsd edib onu seçməyəcəyi zaman icma ilə kafir olmur.

Buna cavab olaraq deyiləcək: Bəli, kafir yalnız imanı seçməsi ilə mömin olur.Əksini deməkdən isə Allaha sığınırıq. Çünki bu, batil və qeyri-məqbul qiyasdır.Qeyd edilən icma isə Allahın kitabı və Peyğəmbərin (salləllahu aleyhi

---

[314] Məcmu`əl-fətəva:7/272.

və səlləm) sunnəsinə ziddir.Çünki: Biz bu qarilərimiz kimi qarın doyduran, yalan danışan və düşmənlə qarşılaşma zamanı qorxaqlıq edən adam görməmişik,-deyib, Peyğəmbəri və onun əshabını qəsd edən kəslər küfrü qəsd etməyib onu seçmədikləri halda həmin sözləri demişlər. Onlar həmin sözləri yalnız zarafat və əyləncə olaraq söyləmişlər. Peyğəmbərə (salləllahu aleyhi və səlləm) bu sözlər çatdırıldığı zaman artıq o, yola düşməyə hazırlaşıb dəvəsinə minmişdi.O, dedi: Ey Allahın elçisi! Biz sadəcə söhbət edib əylənir və yol yorğunluğunu almaq üçün ünsiyyət qururduq. Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: "Allah, Onun ayələri və Peyğəmbərinə istehzamı edirsiniz."Şübhəsiz ki bu, insanı ehtiyatlı olmağa çağırır və insanın bəzən dilə gətirəcəyi söz yaxud edəcəyi əməl səbəbilə kafir olacağını göstərir.Bundan daha təhlükəli olanı qəlb istəkləridir.O, sahili olmayan bir dənizdir.Habelə bu, böyük nifaqdan qorxmağa sövq edir.Çünki Uca Allah onların dedikləri sözdən öncə həmin şəxslərə imanı isbat etmişdir."[315]

Bəlli olur ki, istehza edərək həmin sözləri dilə gətirən şəxslər onun doğru və icazəli olduğunu etiqad etmir və onun küfr olduğunu düşünmürdülər.Lakin onlar bunun haram olduğunu bilmişdilər.Bu isə küfrün hasil olması üçün onu etiqad etməyin yaxud qəsd etməyin şərt olmadığını açıq-aydın göstərir.Bununla da məlum olur ki, əgər biri biləəkdən və öz ixtiyarı ilə küfr söz deyər yaxud edərsə kafir olar.Onun küfrü qəsd etmədiyini və yalnız dünya

---

[315] əl-Əsinnətul hidəd fi raddi şubuhati Aləvi Haddəd, şeyx Süleyman bin Sahman:161-ci səh.

həyatını göz önündə tutduğunu iddia etməsi heç nəyi dəyişməyəcək.Üstəlik dünya həyatını istəmək, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) doğru olduğunu bilən və onun gətirdiyi dinin haqq olduğuna yəqin olan bir çoxunun küfrünə səbəb olmuşdur.

Bu səbəbdən, elm əhlinin qoyduğu qaydaya əsasən küfrü etiqad etmədiyini və onu qəsd etmədiyini iddia etməsi ilə birgə zarafatla küfr edən şəxs kafir olur.Həmin şəxs bəzən dediyində doğru olur.Lakin yuxarıda qeyd edildiyi kimi bu məsələyə düzgün yanaşma qəlbdə olan imanın küfr sözü dilə gətirməyə mane olmasıdır."[316]

Artıq Şeyxul-İslam bəyan etmişdir ki, əyləncə səciyyəsi şəriət baxımından heç bir dəyər daşımır və insanı kafirə çevirən kəlmə öz tələbinin vacibliyini itirmir.Şeyxul-İslam (rahiməhullah) demişdir: "Bunu daha da aydınlaşdıran amil: Əgər insan küfr və iman sözlərini, onların gerçək olmayan surətində qəsd edərsə küfrü doğru, imanı isə qeyri-səhih olar.Belə ki, əgər bir şəxs etiqadı gerçək olmadan dünya mənfəəti üçün küfr söz danışarsa həmin şəxsin həm daxilən həm də, zahirən küfrü sabit olar.

---

[316] Qadı Əbu Bəkr bin əl-Arabi demişdir: "Onların bunu ciddi yaxud zarafatla deməsi qaçılmazdır.Bu isə necəliyindən asılı olmayaraq küfrdür.Çünki zarafatla küfr etmək küfrdür.Ümmətdə buna dair heç bir ixtilaf yoxdur." Sözləri bitdi.(Əhkəmul quran:2/543).Habelə Qurtubi bunu nəql etmişdir:8/181.Şeyx Salih əl-Fəuzan, Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbin sözlərini şərh edərkən demişdir: "İslamı pozan bu on amildə dediyini yaxud etdiyini qəsd edən şəxslə bunu qəsd etməyib zarafat edən və bunu sadəcə zarafat və əyləncə olaraq edən şəxs arasında heç bir fərq yoxdur.Burada, insan qəlbi ilə etiqad etməyənə qədər kafir olmaz, deyən murciələrə tutarlı cavab vardır." (silsilətu şərh ər-rasəil:286)

Buna səbəb, insanın gerçəyini etiqad edərək iman sözünü dilə gətirməyə və istər ciddi istərsə də, zarafatla küfr yaxud yalan söz danışmamağa əmr olunmasıdır.İnsan istər ciddi istərsə də, zarafatla küfr yaxud yalan söz danışdığı zaman gerçək kafirə yaxud yalançıya çevrilir.Çünki bu kimi sözlərlə əylənmək mübah deyil.Bu üzdən əyləncə səciyyəsi şəriət baxımından heç bir dəyər daşımır.Çünki o, haramdır. Həmin kəlmə isə onun tələbinin vacibliyini itirmir."[317]

3-Sunnə, Quranın dəlalət etdiyi mənalara dəlalət edir. Şeyxul-İslam (rahiməhullah) demişdir: "On üçüncü sunnə: Bu, bizim Əbul-Qasim Abdullah bin Muhamməd əl-Bəğavidən rəvayət etdiyimizdir: Yəhyə bin Abdul-Hamid əl-Hamməni bizə təhdis edib dedi: Əli bin Mishər Salih bin Həyyandan, o da, ibn Bureydədən o da, atasından təhdis edib dedi: Bir adam Mədinənin kənarında yaşayan bir tayfanın yanına gəlib dedi: Allahın elçisi (salləllahu aleyhi və səlləm) mənə sizə dair, habelə sizin mal-mülkünüzə və filan və filan şeylərə dair öz görüşümə əsasən hökm verməyimi əmr etdi.Həmin şəxs cahiliyyət dövründə onlardan qız istəmiş onlar isə qızı ona ərə verməkdən imtina etmişlər.Daha sonra həmin adam gedib qadını özünə aldı.Həmin tayfa Peyğəmbərə (salləllahu aleyhi və səlləm) buna dair xəbər göndərdiyi zaman Peyğəmbər (salləllahu aleyhi və səlləm) belə dedi: Allahın düşməni yalan danışdı! Daha sonra bir kişi yollayıb ona dedi: Əgər sən ona diri ikən rast gəlsən onu öldür.Əgər onu ölmüş görsən onu odda yandır. O, gedib həmin adamın əqrəb sancmasından öldüyünü gördü, daha sonra onu odda yandırdı.Bunun

[317] İqamətu-d-dəlil alə butləni-t-təhlil, dımnə əl-fətəva əl-kubra:6/75.

ardından Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Kim qəsdən mənim adımdan yalan danışarsa atəşdə yerini hazırlasın!".

Habelə Əbu Əhməd bin Adiyy "əl-kəmil" adlı kitabında rəvayət edib demişdir: Həsən bin Muhamməd bin Anbər bizə təhdis edib dedi: Haccəc bin Yusuf əş-Şair bizə təhdis edib dedi: Zəkəriyyə bin Adiyy bizə təhdis edib dedi: Əli bin Mishər Salih bin Həyyandan o da, ibn Bureydadan o da, atasından xəbər verib dedi: Bənu Leys qəbiləsi Mədinədən iki mil uzaqda yerləşirdi.Cahiliyyət dövründə bir kişi onların bir qızına elçi düşmüş lakin onlar qızı ona ərə verməmişlər.Həmin adam üzərində bürüncək onların yanına gəlib dedi: Allahın Peyğəmbəri (salləllahu aleyhi və səlləm) bu bürüncəyi mənə geyindirib sizin mal-mülkünüzə və canınıza dair öz hökmümü verməyimi mənə əmr etdi.Daha sonra o, sevdiyi qadının yanına yollanıb onu ələ keçirtdi. Həmin tayfa buna dair Peyğəmbərə (salləllahu aleyhi və səlləm) xəbər yolladığı zaman Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Allahın düşməni yalan danışdı! Daha sonra bir adam yollayıb dedi: Həmin şəxsə sağ olduğu halda rast gələcəyini düşünməsəm belə, ona sağ olduğu halda rast gəlsən onun boynunu vur.Əgər onun öldüyünü görsən onu odda yandır. Dedi: Bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözləridir: "Kim qəsdən mənim adımdan yalan danışarsa atəşdə yerini hazırlasın!".Bu, səhih kitab sahibinin şərtinə əsasən səhih isnadlı hədisdir və biz onda hər hansı bir illətin olduğunu bilmirik."[318]

---

[318] əs-Sarimul məslul:2/325.

Nəhayət dedi: "Habelə həmin adamın bu hədisdə Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tənə etməsi və onun şənini kiçiltməsi qeyd olunmamışdır. Həmin şəxs yalnız onun adından yalan danışmaqla öz şəhvətini təmin etməyi güdmüşdür.Bu, onun adından yalan danışan hər bir şəxsin durumudur.Bunu edən şəxs, ona istehza etməyi qəsd etmiş olmasa, yalnız hər hansı bir mənfəət əldə etməyi qəsd edir. Onun güddüyü marağlar isə ya mal-dövlət ya da ki, nüfuz və yüksək məqama yiyələnməkdir. Belə ki, onun adından yalan danışan şəxs insanları azdırmaq məqsədi güdməyəcəyi zaman yalnız keçərli sözə sahib olmaq və təzim olunmaq kimi ağalıq məqsədini yaxud aşkar şəhvətlər əldə etməyi güdəcək.Qısası, əgər biri, kafir olmağı qəsd etməsə belə küfr sayılacaq söz deyər yaxud əməl edərsə bununla kafir olar. Çünki Allahın istədiyindən savayı demək olar ki, heç kəs küfr etdiyi zaman küfrü qəsd etmir."[319]

4-Buxari və Muslim Əbu Səid əl-Xudrinin (r.a) belə dediyini rəvayət etmişlər: Mən Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə dediyini eşitdim: Sizin içinizdə bir tayfa çıxacaq.Siz öz namazlarınızı onların namazları qarşısında, orucunuzu onların orucu qarşısında və əməlinizi onların əməli qarşısında cılız görəcəksiniz.Onlar Quranı oxuyacaqlar ancaq onların oxuduğu onların boğazını adlamayacaq. Onlar ox yaydan çıxdığı kimi dindən çıxacaqlar."[320]

Məlum olduğu kimi bunların əksəriyyəti dindən çıxmağı qəsd etməmiş və buna səy göstərməmişlər.Çünki

---

[319] Öncəki mənbə:2/339.

[320] Buxari:5058.Muslim:1064.

Peyğəmbər (salləllahu aleyhi və sələm) onların böyük ibadətə sahib olacaqlarını və bunu nifaqdan ötrü etməyəcəklərini qeyd etmişdir.Bu da onu göstərir ki, insan bəzən qəsd etmədiyi halda belə dindən çıxır.

ət-Tabəri "təhzibul əsər" kitabında mövzuya dair hədisləri sadaladıqdan sonra demişdir: "Burada belə deyənlərə rəddiyə vardır: İslam hökmü sabit qiblə əhlindən olan şəxs yalnız bildiyi halda islamdan çıxmağı qəsd etməsi ilə islamdan çıxmış olur.Bunu deyən şəxs Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hədisdə dediyi sözləri ibtal edir: "Onlar haqqı deyəcək və Quranı oxuyacaqlar.Onlar islamdan çıxacaq və onunla heç bir şeyə bağlı olmayacaqlar." Məlum olduğu kimi, onlar yalnız Quran ayələrini yanlış yozduqları səbəbilə müsəlmanların qanını və malını halal saymışlar."[321]

İbn Hubeyra (rahiməhullah) demişdir: "Habelə müsəlmanlardan elələri də var ki, islamdan çıxmağı qəsd etmədikləri və islamdan savayı din seçmədikləri halda dindən çıxırlar."[322]

Bir sözlə,Əhli sunnə söz və əməl səbəbilə təkfir etməkdə küfrün etiqad edilməsini yaxud qəsd edilməsini yaxud insanın ondan razı qalmasını şərt qoymur və dünya mənfəətlərini güdməyi və dünyanı axirətdən üstün tutmağı

[321] Fəthul bəri:12/300.
[322] Fəthul bəri:12/301.

böyük küfr olan sözləri danışan yaxud edən şəxsi təkfir etmək üçün maneə hesab etmirlər.[323]

Mürtədlik mövzusunda şərtə bağlı olan qəsd etmə, yatan və istəmədiyi sözü səhvən danışan şəxsi çıxartmaq məqsədilə felin yaxud sözün qəsd edilməsidir.Buna misal irəlidəki sözləri deyən şəxsdir: "Allahım Sən mənim qulum, mən isə sənin rəbbinəm!".[324] Həmin şəxs möhkəm sevinc səbəbilə səhv etmişdir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Sözün qəlbdə qəsd edilməsi bütün insanlara görə mötəbər sayılır.Belə ki, əgər insan yuxuda yaxud dəlilik anında yaxud qəlbən qəsd etməyərək səhvən dilindən bir söz çxararsa həmin məsələyə dair heç bir hökm qüvvəyə düşməz."[325]

---

[323] Bəzi müasirlər aşırıya varmış "ğulat" murciələrə müvafiq gələrək küfrü təkzib etmə, danma və qəlb halallaşdırması çərçivəsinə salmışlar.Elm və din əhlinin onlara qarşı yaranacaq münasibətdən qorxduqları zaman isə belə deməyə başlamışlar: Küfr həm söz həm də əməl ilə olur.İnsanlar beləsinin Əhli sunnənin məzhəbinə müvafiq gəldiyini düşündüyü bir əsnada həmin şəxslər belə deyirlər: Küfr söz danışan yaxud küfr əməl edən küfrü etiqad etməyincə kafir olmur.Bununla da, məsələ küfrün etiqad çərçivəsinə salınması ilə nəticələnir.Mütləq buna və bu kimi zəlalət və azdırıcı fikirlərə diqqət ayırmaq lazımdır.Məlum olduğu kimi, küfrü etiqad etmək müstəqil şəkildə olan küfrdür.Bu səbəbdən, əgər onun söz yaxud felə birləşik surətdə gəlməsi şərti qoyularsa belə olan halda söz və fel heç bir təsir qüvvəsinə malik olmaz.Bu isə növbəti sözlərə zidd gəlir: Küfr söz və fel ilə olur.Məhz buna görə elm əhli: İnsan etiqad etməyincə kafir olmaz,-sözünü deyən şəxsləri murciələrdən saymışlar.Artıq buna dair şeyx Salih əl-Fəuzanın sözləri qeyd edilmişdir.Habelə irəlidə qeyd ediləcək cəhmiyyə firqəsinə və onlara müvafiq gələnlərə görə küfrün anlamının bəyanı zamanı bu məsələ izah ediləcək.

[324] Muslim:2747.Buxari:6309.

[325] əl-Fətəva əl-kubra:6/75.Habelə (4/204) demişdir: Bildirirəm ki, səhvən yaxud çaşaraq yaxud ağılsızlıq səbəbilə insanın qəsdsiz bir sözü dilə gətirməsi nəticəsində heç bir hökm sabit olmur."

Şatıbi qeyd etmişdir ki, fellər məqsədlərdən kənar olduğu zaman heyvanların və cansız əşyaların hərəkətləri kimi olur və heç bir hökm ilə əlaqəli olmur.[326]

[326] əl-Muvafəqat:1/149.Sərxoş insanın hökmünün sabit olacağı haqqında isə demişdir ki, insan özünü sərxoş hala saldığı zaman sanki qəsdli şəxs kimi olur.Şeyxul-İslam demişdir: Çoxları, sözü qəsd etməməsi ilə bərabər sərxoş adamın hökmünün sabit olacağını demişlər.Onlar demişlər: İnsanın öz ağlını başından çıxarması haram olması səbəbilə həmin şəxs ağlı başında qalan hökmündə olur.(əl-fətəva əl-kubra:6/75).

# Beşinci araşdırma:

## Böyük günah sahibinin hökmü

Əhli sunnənin təməllərindən, onların xəvariclərin etdiyinə əks olaraq insanı mütləq asilik və böyük günah səbəbilə təkfir etməməsi və mötəzilənin dediyinə əks olaraq onu cəhənnəmə əbədi olaraq daxil etməməsidir.Onlar sadəcə belə şəxsin işini Allaha həvalə edirlər.Çünki Allah istəsə onu əzaba düçar edər istəsə onu bağışlayar.[327]

Bu səbəbdən onların bu sözü məşhur olmuşdur: Halal saymayacağı təqdirdə qiblə əhlindən heç kəsi günaha görə təkfir etmirik.[328]

Onların burada qəsd etdikləri günah: İslamdan çıxaracaq küfr olmayan və İslam dininin dörd əsasından biri olmayan asiliklərdir.

Tahaviyyənin şərhçisi demişdir: "Buna görə də, bir çox imamlar: Biz heç kəsi günah səbəbilə təkfir etmirik,- ifadəsini işlətməkdən imtina etmişlər.Lakin belə deyilməlidir: Biz, xəvariclər etdiyi kimi hər bir günah səbəbilə təkfir etmirik. Çünki ümumi inkar ilə ümumiliyin inkarı arasında fərq mövcuddur.Vacib olan isə hər bir günaha görə təkfir edən xəvariclərin sözünə müvafiq gəlməyərək yalnız ümumiliyi inkar etməkdir."[329]

---

[327] Şərhul vasitiyyə, ibn Useymin:2/644.Şərhu-t-tahaviyyə:321,369-cı səh.
[328] Şərhu-t-tahaviyyə, ibn Əbul İzz əl-Hənəfi:316-cı səh.
[329] Öncəki mənbə:317-ci səh.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əgər biz: Əhli sunnə günah səbəbilə təkfir etmədiyinə yekdil olmuşlar,-desək, bununla yalnız zina və şərab içmək kimi asilikləri qəsd etmiş olarıq. (İslamın) bu əsaslarına gəldikdə isə onu tərk edənin təkfir edilməsinə dair məşhur ixtilaf vardır."[330]

## *Əhli sunnənin bu təməl qaydaya dair gətirdikləri bəzi dəlilləri*:

1-Uca Allah buyurur: *"Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa (günahları) isə dilədiyi kimsəyə bağışlayar."*[331]

Uca Allah şirkdən savayı hər bir günahı istəyi altına daxil etmişdir.Təbii ki bu, tövbə etməyənlərə aiddir.Tövbə olan yerdə isə şirk ilə başqa günah arasında heç bir fərq olmur.Çünki Uca Allah bütün günahları bağışlayır.Uca Allah buyurur: *"(Qullarıma mənim bu sözümü) de: "Ey Mənim özlərinə qarşı həddi aşmış qullarım! Allahın rəhmindən ümidinizi üzməyin. Şübhəsiz ki, Allah bütün günahları bağışlayır. O, həqiqətən, Bağışlayandır, Rəhmlidir!".*[332][333]

2-Buxari və Muslim Ubədə bin Samitdən (r.a) rəvayət edirlər ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) ətrafında əshabından bir toplum insanın hüzurunda demişdir: Allaha heç bir şeyi şərik qoşmayacağınıza, israf etməyəcəyinizə, zina etməyəcəyinizə, övladlarınızı öldürməyəcəyinizə,

---

[330] Məcmu`əl-fətəva:7/302.
[331] ən-Nisa:48.
[332] əz-Zumər:53.
[333] Məcmu`əl-fətəva:2/358,7/683.

uydurulmuş yalanaəl atmayacağınza və yaxşı işlərdə asi olmayacağınıza dair mənə beyət edin! Sizdən kim əhdinə sadiq qalarsa əcrini Allah verər.Kim bu işlərdən bir şeyə baş vurub buna görə dünyada cəzalanarsa bu onun üçün kəffarə olar.Kim bu işlərdən bir şeyə baş vurduqdan sonra Allah onu ört-basdır edərsə onun işi Allaha aid olar və Allah istəsə onu əfv edər istəsə onu cəzalandırar. Biz ona bu işlərdə beyət etdik."[334] Bu, heç bir ehtimal daşımayan açıq-aydın nassdır.

3-Buna dair ən qüvvətli dəlillərdən biri də, müsəlmanların zinakar, oğru və böhtan atan şəxslərdən heç birinin öldürülməyəcəyinə dair icma etmələridir.Əgər onların günahları İslamdan çıxmağı gərəkdirmiş olsaydı onlardan hər biri mütləq qətlə yetirilərdi.

Tahaviyyənin şərhçisi demişdir: "Bunun cavabı: Bütün Əhli sunnə böyük günah sahibinin, xəvariclərin dediyinə əks olaraq bütövlüklə İslamdan çıxaracaq küfrə düşmədiyinə yekdildirlər. Çünki əgər o, islamdan çıxaracaq küfrə düşmüş olsaydı hər bir halda öldürüləcək mürtədə çevrilər və qisas sahibinin onu əfv etməsi qəbul edilməz, habelə zina, oğurluq və şərab içmək kimi günahlara görə cəzalar tətbiqini tapmazdı.Bu sözün batil və yararsız olması islam dinində zəruri olaraq bilinir.Əhli sunnə belə şəxslərin iman və islamdan çıxmadığına, küfrə girmədiyinə və mötəzilə firqəsinin dediyinə əks olaraq kafirlərlə birgə cəhənnəmdə əbədi olaraq qalmağa layiq olmadığına yekdil olmuşlar.Onların (mötəzilə firqəsinin) sözləri həmçinin

[334] Buxari:18.Muslim:937.

batildir.Çünki Uca Allah böyük günah sahibini möminlərin sırasında etmişdir. Uca Allah buyurur: *“Əgər (qatil) qardaşı (ölənin varisləri) tərəfindən (qanbahası müqabilində) bir şeylə əfv edilsə, onda insafla davranmalıdır”.*[335]Uca Allah qatili möminlərin sirasından çıxartmamış və onu qisas sahibinin qardaşı adlandırmışdır.Heç şübhəsiz ki, məqsəd dində olan qardaşlıqdır.Habelə Uca Allah buyurur: *“Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları barışdırın.”* Nəhayət demişdir: *“Möminlər, həqiqətən də qardaşdırlar. Elə isə qardaşlarınızı barışdırın”.*[336]

Quran, sunnə və icmanın nassları zinakar, oğru və böhtan atanın qətlə yetirilməyəcəyinə dəlalət edir.Həmin şəxslərə şəriətin qoyduğu cəzalar tətbiq ediləcək.Bu isə onların mürtəd olmadığını göstərir.

Səhih hədisdə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Əgər biri bu gün namus yaxud digər bir şeydə qardaşına zülm etmişsə qoy elə bu gün, dirhəm və dinərin fayda verməyəcəyi vaxt gəlməmişdən öncə ondan halallıq alsın. Çünki əgər onun saleh əməli olarsa etdiyi zülm miqdarında ondan çıxılar.Əgər onun yaxşı işləri olmazsa zülm etdiyi şəxsin pislikləri alınar və həmin şəxsə çırpılar.Daha sonra o, atəşə atılar.Buxari və Muslim rəvayət etmişlər.[337] Bəlli olur

[335] əl-Bəqərə:178.

[336] əl-Hucurat:9-10.

[337] Buxari:2449.Hədis, şərhçinin qeyd etdiyi ləfzə yaxındır.Lakin hədis Muslimdə varid olmamışdır.Hafiz “əl-fəth” kitabında demişdir: “Muslim həmin hədisin mənasını digər yöndən təxric etmişdir və o, bu hədisdən daha aydın gəlmişdir.” Daha sonra “müflis” hədisini qeyd etmişdir.

ki, zalım məzlumun ondan öz haqqını alacaq həsənələrə sahib olur."[338]

4-Habelə şəfaət və atəşə girdikdən sonra oradan çıxacaq insanlar haqqında gələn hədislər. Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Şəfaətim ümmətimdən böyük günah sahibləri üçündür."[339] Habelə demişdir: "Atəşdən "lə iləhə illəllah" deyib qəlbində arpa dənəsi çəkisində xeyirə sahib olan çıxacaq. Habelə atəşdən"lə iləhə illəllah" deyib qəlbində buğda dənəsi çəkisində xeyirə sahib olan çıxacaq. Habelə atəşdən "lə iləhə illəllah" deyib qəlbində zərrə qədər xeyirə sahib olan çıxacaq."[340]

Habelə Əhli sunnənin qəbul etdiyi digər məşhur və məlum dəlillər.İslam ümməti dinlər arasında orta mövqe tutduğu kimi həmçinin Əhli sunnə bu məsələdə firqələr içində orta mövqe tutmaqdadır.Şeyxul-İslam buna dair buyurur: Onlar adlar, əhkamlar, "vəd və vəid" mujdə və təhdid mövzusunda müsəlmanlardan olan böyük günah sahiblərini atəşdə əbədi qalacaq şəxslərdən edən, onları bütövlüklə imandan çıxaran və Peyğəmbərin şəfaətini təkzib edən "vaidiyyə" firqəsi ilə fasiqdə olan imanın peyğəmbərlərin imanı kimi olduğunu, saleh əməllərin din və imandan olmadığını deyən və bütövlüklə təhdid və cəzanı təkzib edən "murciə" firqəsi arasında orta mövqe tuturlar.Əhli sunnə vəl cəmaat, fasiq müsəlmanın imanın bir hissəsinə və özəyinə sahib olduğuna, fasiq müsəlmanın

---

[338] Şərhu-t-tahaviyyə:320-ci səh.Məcmu`əl-fətəva:7/482.

[339] Əhməd:13245.Tirmizi:3435.Əbu Davud:4739.Hədisi Ənəs (r.a) rəvayət etmişdir. Şeyx Albani və Şueyb Arnaut hədisi səhih saymışlar.

[340] Buxari:44.Muslim:193.Hədisi Ənəs (r.a) rəvayət etmişdir.

cənnəti gərəkdirən bütün vacib imana sahib olmadığına, habelə onun əbədi atəşdə qalmayacağına, qəlbində xardal dənəsi çəkisində imana sahib olan şəxsin atəşdən çıxacağına və Peyğəmbərin (salləllahu aleyhi və sələm) öz şəfaətini böyük günah sahibləri üçün saxladığına iman edirlər."[341]

*Bildiriş*:

Təhdidin günahkarlardan bir qism insanlara şamil edilməsi labüddür:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Sələf və imamlar mütavatir olaraq nasslarda qiblə əhlindən bəzi insanların atəşə girmələrinin daha sonra oradan çıxmalarının labüdlüyünə dair gələnlərə yekdil olmuşlar.Atəşə qiblə əhlindən heç kəsin girməyəcəyinə dair əminlik ifadə edənə gəldikdə isə biz, hər hansı bir şəxsin bunu dediyini bilmirik.Sonra isə belə deyənlər vardır: Əslində heç bir əzab yoxdur və bu sadəcə gerçək olmayan bir qorxutmadır.Bu, dinsizlərin və kafirlərin dediyi sözlərdəndir."[342]

Habelə demişdir: "Bu, səhabələr, sələf və imamların məzhəbidir.Onlar qəti etiqad edirlər ki, bu ümmətin bəzi günahkarları atəşə girəcək bəzisi isə bağışlanacaqdır."[343]

Səffərini (rahiməhullah) demişdir: "Bəzi təhqiqçilər eşitmə yolu ilə tövbə etmədən öləcəkləri təqdirdə bir qism günahkarlara yaxud zinakarlar, şərab içənlər, cana bais olanlar, sələm yeyənlər, oğru və quldurlar kimi onlardan hər

341 Məcmu`əl-fətəva:3/374.
342 Məcmu`əl-fətəva:7/501.
343 Öncəki mənbə:16/19.Habelə:16/196,28/578.əl-Fətəva əl-kubra:4/226.

cür insana təhdidin icrasının labüdlüyünə icmanın bağlandığını qeyd etmişlər.Belə ki,bağışlanması caiz olduğu səbəbilə müəyyən fərdi insana deyil hər növdən olan insanlara təhdidin icrası labüddür.Təhdidin icrasını ifadə edəcək ən kiçik anlam onun hər növdən birini şamil etməsidir.Dəlillər, günahkarların müsəlman günahkar çərçivəsindən çıxmadıqlarını qəti şəkildə bildirir.

Bəzi insanlar buna əsasən bütün müsəlmanlar üçün bağışlanma diləməkdən imtina etmişlər.Çünki bu, qeyd edilənlə bir araya sığmır.Bu, ümmətdən olan hər bir şəxs üçün fərdi şəkildə bağışlanma istənilməyəcəyi təqdirdə dəyərsiz söz olacaq.Çünki bağışlama əzab və əzaba düçar olmadan sonra öz təsdiqini tapır.Bu səbəbdən əgər biri bağışlanma diləməyə mane olmağa mane olmaq lazımdır deyərsə doğru söz söyləmiş olar. Müvəffəqiyyət Allah-dandır."[344]

[344] Ləvamiul ənvaril bəhiyyə:1/389.

# Altıncı araşdırma:

## Fasiq müsəlmanın hökmü

Fasiq müsəlman deyildiyi zaman qiblə əhlindən olan günahkar qəsd edilir.Onun bu cür adlandırılması və hökmü haqqında fikirayrılığı dinin əsasları məsələsinə dair İslamda çıxan ilk ixtilaf olmuşdur.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Bu məqamın araşdırılması nəticəsində adı çəkilən mövzuya dair qaranlıq tərəflər aradan qalxır və məlum olur ki, müsəlmanların arasında atəşin ən alt təbəqəsində olacaq xalis münafiq olmayan və Allahın növbəti ayədə xəbər verdiyi möminlərdən olmayan bir qism insanlar vardır:*"Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən, sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə cihad edənlərdir! (İmanlarında) sadiq olanlar da məhz onlardır."*[345].

Onlar Uca Allahın növbəti ayədə xəbər verdiyi möminlər deyillər: "*Həqiqi möminlər məhz onlardır*".[346] Onlar nə münafiq, nə adı çəkilən həqiqi və sadiq mömin nə də ki, əzabsız cənnətə girəcək şəxslər deyillər.Həmin şəxsin itaətləri və günahları, yaxşılıqları və pislikləri vardır.Habelə həmin şəxsin cəhənnəmdə əbədi qalmasına mane olan imanı

---

[345] əl-Hucurat:15.

[346] əl-Ənfəl:4.

vardır.Eyni zamanda həmin şəxsin, cəhənnəmi ona vacib edən böyük günahları vardır.

Bu qism insanları bəzi adamlar: Fasiq müsəlman "əl-fəsiqul milliy" adlandırırlar.İnsanlar onun adı və hökmünə dair ixtilaf etmişlər.Ona dair ixtilaf, dinin əsaslarını şamil edən məsələlərə aid İslamda çıxmış ilk ixtilafdır."[347]

Əhli sunnə bu növ insanları təkfir etmir və onların əbədi olaraq cəhənnəmdə qalacağına dair hökm çıxarmırlar.Əksinə onlar, ötən araşdırmada keçdiyi kimi həmin şəxsin Allahın istəyi altında olduğunu hesab edirlər.Lakin onlar həmin şəxslərə mömin adının şamil edilib edilməməsi məsələsində ixtilaf etmişlər.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əhli sunnə vəl cəmaat, səhabələr, onlara gözəl şəkildə tabe olanlar və hədis əhlindən, fəqihlərdən, habelə fəqih murciə, kərrami, kulləbi, əşari və şiədən olan kəlam əhlindən olan digər müsəlman tayfaları, murciəsi və qeyri-murciəsi belə deyirlər: "Səhih hədislərdə deyildiyi kimi bəzən Uca Allah bir şəxsi atəşdə əzablandırır daha sonra onu cənnətə daxil edir.

Pisliklərə sahib olan həmin şəxs buna görə əzablandırılır daha sonra sahib olduğu yaxşılıqlara görə cənnətə girir. Onun günahı və itaəti vardır.Həmin tayfalar onun hökmünə dair deyil, sadəcə onun adına dair ixtilaf etmişlər. Cəhmiyyə və qeyrilərindən olan murciələr demişlər: O, kamil imanlı mömindir.

---

[347] Məcmu`əl-fətəva:7/478.

Əhli sunnə vəl cəmaat onun naqis imanlı mömin olduğunu demişlər.Əgər belə olmasaydı həmin şəxs əzabı dadmazdı. Habelə həmin şəxsin müsəlmanların yekdil sözünə əsasən xeyirxahlıq və təqvada naqisliyi vardır.

Elə isə ona mömin adı şamil oluna bilərmi? Buna dair iki görüş vardır.Əslində bu məsələdə təfsilat qoyulmalıdır:

Belə ki, insanlar kəffarə üçün qulun azad edilməsi kimi dünya əhkamları haqqında soruşulduqları zaman: O, mömindir,-deyirlər.Onun möminlərə ünvanlanan xitaba daxil olması haqqında soruşulduğu zaman həmçinin.

Ancaq axirətdəki hökmü haqqında soruşulduğu zaman: Bu növ insanlar, cənnət vədi alan möminlərdən deyillər,-deyiləcək.Uca Allahın onu bir-başa bağışlamayacağı təqdirdə həmin şəxsin cəhənnəmdə əbədi qalmasına mane olan və atəşdə əzab çəkdikdən sonra onu cənnətə salan imanı vardır.Bu səbəbədən deyilmişdir: O, imanı ilə mömin böyük günahı ilə fasiq olmuşdur yaxud o, naqis imanlı mömindir.

Əhli sunnədən və mötəzilədən həmin şəxsi mömin adlandırmayanlar deyirlər: Fasiqlik adı iman adına zidd gəlir.Uca Allah buyurur: *“İman gətirdikdən sonra fasiq adını qazanmaq necə də pisdir.”*[348]Habelə buyurur: *“Məgər möminlə fasiq eynidirmi?”*.[349] Peyğəmbər (salləllahu aleyhi və səlləm)

[348] əl-Hucurat:11.

[349] əs-Səcdə:18.

demişdir: "Müsəlmanı söymək fasiqlik, onunla savaşmaq isə küfrdür."[350][351]

Habelə demişdir: "Onlar fasiq müsəlmandan bütövlüklə iman adını çıxarmır və mötəzilə firqəsi kimi onun əbədi cəhənnəmlik olduğunu demirlər.Çünki fasiq (müsəlman) iman adına daxildir.Uca Allah buyurur: "*mömin qulun azad edilməsi*"[352] Bəzən isə həmin şəxslər mütləq iman adına daxil olmurlar.Uca Allah buyurur: *"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar".*Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Zinakar zina etdiyi zaman mömin olaraq zina etməz.İçki içən içki içdiyi zaman mömin olaraq içki içməz.Oğru oğurluq etdiyi zaman mömin olaraq oğurluq etməz.Habelə insanların gözü önündə dəyərli bir şeyi qəsb edən şəxs mömin olaraq bunu etməz."[353]

Onlar deyirlər: O, naqis imana sahib olan mömindir yaxud imanı olduğu üçün mömin böyük günaha sahib olduğu üçün isə fasiqdir.Həmin şəxs mütləq şəkildə iman adına yiyələnmir, eyni zamanda həmin addan mütləq şəkildə məhrum edilmir."[354]

"Bir şeyin mütləqi ilə mütləq bir şey arasında olan fərq, mütləq bir şeyin kamil bir şey olmasıdır.Bir şeyin mütləqi isə, nöqsanlı olarsa belə həmin şeyin özəyi mənasını daşıyır. Fasiq, imanda mütləq adı, yəni kamil adı almır.Habelə o,

---

[350] Buxari:48.Muslim:64.Hədisi ibn Məsud (r.a) rəvayət etmişdir.
[351] Məcmu`əl-fətəva:7/354.
[352] ən-Nisa:92.
[353] Buxari:5578.Muslim:57.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.
[354] Şərhul vasitiyyə, Şeyx əl-Fəuzən:161-ci səh.Məcmu`əl-fətəva:3/151.

həmin adın mütləqindən məhrum edilmir. Biz onun mömin olmadığını demirik.Biz deyirik: Naqis imanlı yaxud imana sahib olduğu üçün mömin, böyük günaha sahib olduğu üçün isə fasiqdir.Əhli sunnə vəl cəmaatın məzhəbi məhz budur. Bu, ən ədalətli və orta məzhəbdir.Bir sıra firqələr onlara bu məsələdə müxalif olmuşlar.Murciələr demişlər: Kamil imanlı mömindir.Xəvariclər demişlər: Kafirdir. Mötəzilələr demişlər: İki məqam arasında bir məqam-dadır."[355]

## *Zinakar və oğrudan inkar edilən iman:*

Artıq bəlli olmuşdur ki, şəriət sahibi zinakar, oğru və içki içən mislində olan günah sahiblərindən mütləq imanı inkar etmiş lakin onlardan imanın mütləqini inkar etməmişdir.Bu səbəbdən həmin şəxslərin müsəlman və təsdiq edənlər olduqlarını demək olar.Habelə həmin şəxslər onların imanını doğru edən və onlardan küfr və nifaqı dəf edən qəlb və bədən əməllərinə sahibdirlər.

Artıq səhih sunnədə varid olmuşdur ki, insan zina etdiyi zaman onun imanı çıxır.Peyğəmbər (salləllahu aleyhi və salləm) demişdir: "Bir adam zina etdiyi zaman ondan iman çıxır və

[355] Şərhul vasitiyyə, şeyx ibn Useymin:2/651.İbnul Qayyim demişdir: "Mütləq iman yalnız buyurulmuş kamil olana deyilir.İmanın mütləqi isə həm naqis həm də kamil olana aid edilir.Məhz bu səbəbdən Peyğəmbər (salləllahu aleyhi və salləm) zinakardan, içki içəndən və oğrudan mütləq imanı inkar edib həmin şəxslərdən imanın mütləqini inkar etməmişdir." Habelə demişdir: "Burada məqsəd, mütləq iman ilə imanın mütləqi arasında fərq qoymaqdır.Mütləq iman insanın cəhənnəmə daxil olmasına əngəl olur.İmanın mütləqi isə orada əbədi qalmağa əngəl olur." (bədəiul fəvaid:4/227).

bir kölgə tək onun üzərində olur.Zina edən işini bitirdiyi zaman isə iman ona qayıdır."[356]

Burada varid olan iman: Təsdiqin getməsi yaxud qəlb əməlinin bütövlüklə getməsi deyil qorxu, nur və mütilik anlamını daşıyır.

Zinakar zina edəcəyi təqdirdə zinanın haram olduğunu etiqad etməli, ona nifrət etməli, ondan xoşlanmamalı və onun aqibətindən qorxmalıdır.Oğru, içki içən və digər günah edənlər həmçinin belədir.Bununla da, onlar imanın özəyini qorumuş olarlar.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əgər biri zina, oğurluq, içki içmək və bu kimi böyük günahlar edərsə həmin şəxsin qəlbində təsdiqin özəyi qalacağı halda belə onun qəlbindən qorxu, mütilik və nurun getməsi labüd olacaq.Bu, böyük günah edildiyi zaman qəlbdən çıxarılan imandır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Zinakar zina etdiyi zaman mömin olaraq zina etməz.İçki içən içki içdiyi zaman mömin olaraq içki içməz.Oğru oğurluq etdiyi zaman mömin olaraq oğurluq etməz." Müttəqilər Uca Allahın onları vəsf etdiyi kimidirlər:*"Allahdan qorxanlara şeytandan bir vəsvəsə toxunduğu zaman (Allahı) xatırlayar və dərhal (gerçəyi) görərlər."*[357] Onların qəlblərinə şeytandan bir vəsvəsə gəldiyi zaman xatırlayar və dərhal gerçəyi görərlər. Səid bin Cubeyr (rahiməhullah) demişdir: "Bu, qəzəblənən daha sonra Allahı xatırlayıb öz hirsini boğan şəxsdir.Leys

---

[356] Əbu Davud:4690.Tirmzi:2625.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.Şeyx Albani "sahih əbu davud"da həmin hədisi səhih saymışdır.
[357] əl-Ə`raf:201.

Mucahidin belə dediyini rəvayət edir: Bu, günah etmək fikrinə düşən daha sonra Allahı xatırlayıb günahı tərk edən şəxsdir.

Şəhvət və qəzəb pisliklərin əsasıdır.İnsan gerçəyi gördüyü zaman etmək istədiyindən dönür.Daha sonra Uca Allah buyurur: *"(Şeytanlar) öz qardaşlarında azğınlığı artırarlar. Sonra da onlardan əl çəkməzlər."*[358]Yəni, şeytanlar öz qardaşlarının azğınlığını artırar sonra isə onlardan əl çəkməzlər.İbn Abbas (r.a) demişdir: İnsanlar günahlardan əl çəkməz, şeytranlar isə onları buraxmazlar.İnsan gerçəyi görmədiyi zaman onun qəlbi azğınlıq içində qalır, şeytanlar isə onun azğınlığını artırırlar.Əgər onun qəlbində təsdiq olsaydı o, təkzib etməzdi.Belə olan halda onun qəlbində olan nur, gerçəyi görmə, habelə qorxu oradan çıxır.Bu, kor olmasa belə gözlərini yumub heç bir şeyi görməyən şəxsə bənzəyir. Habelə günahların qaraltısı qəlbi bürüdüyü zaman insan, kafir tək kor olmasa belə doğru olanı görməyə qadir olmur.Əsərlərdə məhz bu cür gəlmişdir."

Bunun ardından Həsəndən, ibn Abbasdan və Əbu Hureyradan əsərlər qətirib demişdir: "Əbu Hureyranın (r.a) Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) rəvayət etdiyi hədisdə belə gəlmişdir: "Zinakar zina etdiyi zaman onun imanı çıxar və kölgə kimi olar.İnsan işini bitirdiyi zaman isə iman ona qayıdar."Bu, digər bir yerdə geniş izah ediləcək."[359]

Şeyxul-İslam (rahiməhullah) qəlbdə təsdiqin qalması ilə bərabər zinakardan çıxanın məhz nur, qorxu və mütilik

---

[358] əl-Ə`raf:202.

[359] Məcmu`əl-fətəva:202.

olduğunu bəyan etmişdir.Şeyx digər yerdə imanın özəyi qalsın deyə asiliyə nifrət etmə, ondan xoşlanmama və günah işləndiyi zaman Allahdan qorxma kimi qəlb əməlinin varlığının şərt olduğunu bəyan etmişdir.O, demişdir: "İnsan yalnız imanın və sevginin zəifliyi səbəbilə haram işlər görür.İnsan haqqa zidd olan məkruh işlər etdiyi zaman bunu qəlbdə ona qarşı olan müəyyən zəifliyi yaxud həmin məkruhlara olan güclü sevgisi səbəbilə edir.İnsan həm aşkar həm də gizli edilən yaramaz işlər, günah, haqsızcasına zülm etmək, Allahın, haqqında heç bir dəlil nazil etmədiyi bir şeyi Ona şərik qoşmaq və Allaha dair elmsiz söz söyləmək kimi haramlardan olan hər hansı bir şeyi yalnız imanın özəyində yaxud kamilliyində zəif imana sahib olması yaxud elmin və təsdiqin zəif olması yaxud da ki, sevgi və nifrətin zəif olması səbəbilə edir.Lakin imanın özəyi olan təsdiq səhih olacağı zaman mömin həmin haram işləri, ona nifrət bəsləyərək və ondan xoşlanmayaraq edəcək.İnsan həmin haramları şəhvətin onu üstələməsi səbəbilə edəcəyi təqdirdə həmin haramları, ona olan nifrətlə etməsi, Allahın bundan ötrü cəzasından qorxması, habelə Onun cəzasından tövbə yaxud yaxşı işlər yaxud əfv yaxud da ki, digər bir şey səbəbilə xilas olacağına dair ümid etməsi labüd olacaq. Ancaq əgər insan haramlara nifrət etməyib Allahdan qorxmaz və Onun rəhmətinə ümid bəsləməzsə onun heç bir vəchlə mömin olması mümkün olmayacaq.Əslində həmin şəxs kafir yaxud münafiq olacaq."[360]

[360] Qaidətun fil məhabbəh:104-cu səh.

Habelə demişdir: "Həmçinin səhih hədisdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə deməsi sabit olmuşdur: "Sizdən biriniz münkər iş gördükdə onu əli ilə dəyişsin.Bacarmasa dili ilə etsin.Bacarmasa qəlbi ilə etsin.Bu, imanın ən zəifidir."[361] Digər rəvatəydə: Bundan aşağı xardal dənəsi çəkisində belə iman yoxdur."[362] Bu isə qəlbdə Allahın sevmədiyi münkər şeylərə nifrətin olmayacağı zaman insanın imansız olacağını bəyan edir.Nifrət və sevgi qəlb əməllərindəndir.Məlumdur ki, iblis və onun kimilər Allahın bu işləri haram etdiyini bilir lakin ona nifrət etmir, üstəlik Allahın və Peyğəmbərin haram etdikləri şeylərə dəvət edirlər."[363]

*Bildiriş:*

Bir qism elm əhlinin kəlamında, bəzi nasslarda varid olan imanın inkar edilməsi ilə kamilliyin inkar edilməsi qəsd edilir.Bunun vacib kamillik şərti ilə vurğulanması gərəkdir. Çünki müstəhəb kamilliyi tərk edən şəxsdən iman inkar edilmir.Əgər belə olsayı insanları çoxundan imanı inkar etmək zərurəti yaranardı.

Birinciyə dair ən-Nəvəvi (rahiməhullah) demişdir: "İmanın asiliklər səbəbilə azalmasına və kamilliyin inkarı məqsədi

---

361 Muslim:49.Hədisi Əbu Səid əl-Xudri (r.a) rəvayət etmişdir.

362 Muslim:50.Hədisi ibn Məsud (r.a) rəvayət etmişdir.Hədisin ləfzi belədir: "Məndən öncə Allah hər ümmətə elə bir peyğəmbər göndərməmişdir ki, ümmətindən onun sunnəsinə sarılan və onun yolunu tutan həvari və əshabı olmasın.Onlardan sonra etmədikləri şeyləri deyən və əmr olunmadıqları şeyləri edən şəxslər peydə olacaqlar. Onlarla əli ilə savaşan mömindir.Onlarla dili ilə savaşan mömindir.Onlarla qəlbi ilə savaşan mömindir.Bundan aşağı xardal dənəsi çəkisində belə iman yoxdur."

363 Məcmu`əl-fətəva:7/557.

ilə asiliyə baş vuran şəxsdən imanın inkar edilməsinə dair açıqlama bölümü."[364]

Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Zinakar zina etdiyi zaman momin olaraq zina etməz..." "Alimlər bu hədisin mənasına dair ixtilaf etmişlər.Təhqiqçilərin hədisin mənasına dair dedikləri səhih görüş: İnsan kamil imana sahib olduğu halda bu günahları etməz.Qeyd olunan bu sözlər, bir şeyi inkar edir ancaq həmin şeyin kamilliyini inkar etmək məqsədi ilə istifadə edilir.Həmçinin belə deyilir: Elm yalnız fayda verəndir.Mal yalnız dəvədir.Yaşam yalnız axirət yaşamıdır."[365]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Allah yaxud Onun elçisi Allahın və Peyğəmbərin əmr etdikləri bir şeyin anlamına daxil olan adı yalnız onun bəzi vacibləri tərk ediləcəyi zaman inkar edirlər.Buna misal: "Quranın anası (fatihə) olmadan namaz yoxdur." Habelə: Əmanəti olmayanın imanı, əhdi olmayanın isə dini yoxdur." Habelə digər dəlillər.

Bir fel ibadətdə müstəhəb olacağı zaman müstəhəbin yoxluğu səbəbilə o, inkar edilməyəcək.Çünki əgər bu caiz olsaydı bir çox mömindən iman, namaz, zəkat və həcc adlarının inkar edilməsi caiz olardı.Həmçinin elə bir əməl yoxdur ki, digəri ondan daha fəzilətli olmasın.İnsanlardan heç kim Peyğəmbərin (salləllahu aleyhi və səlləm), hətta Əbu Bəkr və Ömərin (r.a) etdiyi mislində xeyirli işlər edə bilməz.Əgər ibadətin müstəhəb kamilliyini etməyən şəxsdən iman adının

364 Muslim. Kitəbul imən.

365 Şərhu Muslim:2/41.

inkar edilməsi caiz olsaydı belə olan halda bir çox əvvəlki və sonraki müsəlmanlardan onun inkar edilməsi caiz olardı. Bunu isə ağıllı insan deməz.

Əgər inkar edilənin kamillik olduğunu deyən şəxs tərk ediləcəyi təqdirdə insanı qınağ obyektinə çevirəcək və cəzaya məruz qoyacaq vacib kamilliyin inkar edilməsini qəsd edərsə doğru demiş olar.Ancaq əgər o, müstəhəb kamilliyin inkar ediləcəyini qəsd edərsə bilsin ki, bu Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözlərində heç vaxt gəlməmişdir.Bunun gəlməsi ümumiyyətlə caiz deyil. Çünki əgər bir şəxs ona vacib olan surətdə vacib əməl edib vacib əməlində heç bir nöqsana yol verməzsə onun: Onu etmədi,-deyilməsi nə gerçək surətdə nə də ki, məcazi formada caiz olmayacaq.Peyğəmbər (salləllahu aleyhi və səlləm) namazı yaramaz qılan çöl ərəbinə: Qayıd namaz qıl, çünki sən namaz qılmadın!-dediyi zaman, habelə namaz cərgəsinin arxasında namaz qılana namazı yenidən qılmağı əmr edib: Cərgənin arxasında fərdi namaz yoxdur,-dediyi zaman bütün bunlar vacibin tərk edilməsi səbəbilə olmuşdur."[366]

***Fayda***: İnkarın mərtəbələri.

Şeyx ibn Useymin (rahiməhullah) demişdir: "Bir şeyin inkar edilməsi üç haldan ibarətdir: İnkar etmənin əsas mənası bir şeyin varlığını inkar etməkdir.Buna misal: Bütə ibadət edənin imanı yoxdur,-sözüdür.Əgər hər hansı bir amil səbəbilə varlığın inkar edilməsi əngəllənərsə belə olan halda o, bir şeyin səhihliyinin inkar edilməsini ifadə edəcək.Buna

---

[366] Məcmu`əl-fətəva:7/14.

misal: Dəstəmazsız namaz yoxdur,-sözləridir.Əgər hər hansı bir amil səbəbilə səhihliyin inkar edilməsi əngəllənərsə belə olan halda o, kamilliyin inkar edilməsini ifadə edəcək.Buna misal: “Yemək hazır olduğu zaman namaz yoxdur” sözləri, habelə: “Heç biriniz iman gətirmiş olmaz”,-sözləridir.Bu, müstəhəb kamilliyin deyil vacib kamilliyin inkar edilməsidir.Şeyxul-İslam ibn Teymiyyə demişdir: “Bir şey, hər hansı bir əngəl olmayacağı təqdirdə yalnız ona aid olan vacibin yoxluğu səbəbilə inkar edilir.”[367]

---

[367] əl-Qaulul mufid alə kitəbi-t-təuhid:2/161.ət-Tə`liq alə sahih Muslim:1/248. Orada gəlmişdir: “Əgər biri: Varlığı ilə birgə əməlin kamilliyi inkar ediləcəyi zaman həmin əməlin hökmü necə olacaq? Biz deyəcəyik: Alimlərə görə olan qayda: İmanın inkar edilməsi ilə nəticələnən hər bir şey böyük günahlardan sayılır.”

# İkinci bölüm

## Müxtəlif firqələrə görə iman və küfr anlamı

**Bura daxil olan məsələlər:**

***Birinci fəsil*: Xəvaric və mötəzili firqələrinə görə iman.**

***İkinci fəsil*: Cəhmiyyə firqəsinə dair açıqlama.**

***Üçüncü fəsil*: Kərramiyyə firqəsinə dair açıqlama.**

***Dördüncü fəsil*: Əşariyyə firqəsinə dair açıqlama.**

***Beşinci fəsil*: Məturudiyyə firqəsinə dair açıqlama.**

***Altıncı fəsil*: Fəqih murciələrin firqəsinə dair açıqlama.**

***Yeddinci fəsil*: Müasir irca fikrinin xüsusiyyətləri.**

# Ön söz

Bu bölüm, Əhli sunnə vəl cəmaata müxalif olan ən məşhur firqələrə görə iman və küfrün gerçəyinin bəyan edilməsindən ötrü qələmə alınmışdır.Həmin firqələri iki qismə bölmək olar:

*Birinci:* Vaidiyyə.Bunlar xəvaric və mötəzili firqələridir. Burada onlar barəsində açılacaq söhbət onların qədim zamanlarda günah sahiblərinə dair dedikləri məşhur sözlərini qeyd etməkdən ibarət olacaq.Habelə ümid edirik ki, gələcəkdə onların digər sözləri və şübhələri haqqında söz açmaq fürsətini əldə edəcəyik.

*İkinci:* Murciə.Bunlar müxtəlif firqələrdən təşkil olunur. Həmin firqələrin ən məşhur olanı dörddür:

1-Cəhmiyyə.

2-Kərramiyyə.

3-Əşari və Maturudilər.Onların murciə firqələrindən sayılmasına dair açıqlama gələcək.

4-Fəqih murciələr.

Bu bölümün sonunda müasir irca fikrinin xüsusiyyətləri qeyd ediləcək.Burada məqsəd bu əsrdə murciələrin geniş yayılmış sözlərini bəyan etməkdir.Xüsusi olaraq qeyd edilməlidir ki, bu sözlər, iman və küfr mövzusuna dair sələfin sözləri ilə murciələrin sözlərini cəm edən və özlərini

**sunnəyə nisbət edən bəzi şəxslər tərəfindən səsləndirilir.Bu məsələ haqqında ətraflı izah gələcək.**

Xəvaric və Mötəzili firqələrinin görüşünə əsasən iman söz və əməldir.Lakin o, artıb azalmır və onda istisna edilmir. Onlara görə iman, bir qismi itəcəyi zaman bülövlüklə itəcək bir şeydir. Məhz bu etiqad onları böyük günah sahibinin əbədi olaraq cəhənnəmdə qalacağını deməyə sövq etmişdir. Lakin onlar həmin şəxsin dünyadaki hökmünə dair ixtilaf etmişlər. Xəvariclər onun kafir olduğunu demiş, mötəzililər isə onun iki məqam arasında olan bir məqamda yerləşdiyini demişlər.

İmam ibn Mandəh (rahiməhullah) insanların imanın anlamına dair ixtilaf etmələrini bəyan etdiyi əsnada demişdir: "Xəvariclər demişlər: İman, bütün fərz edilmiş itaətləri qəlb, dil və digər bədən əzaları ilə etməkdir."[368]

Qadı Əbu Yə`lə (rahiməhullah) demişdir: "Şər`i iman, bütün zahiri və daxili, vacib və məndub itaətlərdir.Bu, əksər mötəzililərin sözüdür.Onlardan Əbu Hişəm və əl-Cəbəi demişlər: Bu, könüllü ibadətlər kənar sırf vaciblərə aiddir."[369]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Sonra isə xəvaric və mötəzililər demişlər: İtaət bütövlüklə imandandır.İmanın bir qismi yoxa çıxacağı zaman digər qismi həmçinin yoxa çıxacaq.Bu səbəbdən böyük günah sahibinin imandan heç bir şeyə sahib olmadığına hökm vermişlər."[370]

Habelə demişdir: "Xəvaric, murciə, mötəzilə, cəhmiyyə və bunlara bənzər firqələrin iman məsələsinə dair etdikləri

---

[368] "əl-İmən, ibn Mandəh:1/331"."əl-Fisal, ibn Hazm:3/227".
[369] Məsəilul imən:156-cı səh.
[370] Məcmu`əl-fətəva:7/510.

ixtilafın əsası onların imanı bir şey etmələridir.İmanın bir qismi gedəcəyi zaman o, bütövlüklə gedəcək.Onun bir qismi sabit qaldığı zaman isə o, bütövlüklə sabit qalacaq.Onlar imanın bir qismi gedəcəyi təqdirdə digər qismin qalacağını deməmişlər. Peyğəmbər (salləllahu aleyhi və səlləm) isə demişdir: Qəlbində misqal dənəsi qədər imanı olan şəxs cəhənnəmdən çıxacaq."[371][372]

Bundan savayı xəvaric və mötəzililər islam və imanın bir şey olduğunu hesab edirlər.[373]

*Onların günah sahiblərinə dair sözləri*:

Artıq qeyd edilmişdir ki, Əhli sunnə günah sahiblərini təkfir etmir və onlardan bütövlüklə iman adını çıxartmırlar.

Xəvariclər isə böyük günah sahibinin kafir olduğunu, cəhənnəmdə əbədi qalacağını və kafirlərin daddığı əzabı dadacağını deyirlər.

Əbul Həsən əl-Əşari (rahiməhullah) onların etiqadını bəyan edərək demişdir: "Nəcdət firqəsi istisna olmaqla onlar hər bir böyük günahın küfr olduğuna icma etmişlər.Habelə Nəcdə adlı şəxsin ardıcılları olan Nəcdət firqəsinə mənsub

---

[371] Bu cür ləfzlə olan rəvayətə rast gəlmədim.Ancaq imam Buxari "22" Əbu Səid əl-Xudridən bu rəvayəti nəql etmişdir: Cənnət əhli cənnətə, cəhənnəm əhli cənəhhəmə girəcəklər.Daha sonra Uca Allah deyəcəkdir: Qəlbində xardal dənəsindən misqal çəkisində imanı olanı oradan çıxarın.Onlar oradan qaralmış halda çıxarılıb həya yaxud həyat adlanan bir çaya atılacaqlar." Muslim hədisi buna yaxın bir ləfzlə rəvayət etmişdir:84.

[372] Məcmu`əl-fətəva:7/510.

[373] Öncəki mənbə:7/414.

olanlar istisna olmaqla onlar böyük günah sahibinin daimi əzaba düçar olacağına icma etmişlər."[374]

Nəcdət firqəsindən olanlar demişlər: Bilmirik, Allahın möminləri əzaba düçar etməsi mümkündür.Əgər Allah bunu edərsə yalnız onların günahları nisbətilə onları atəşdən savayı bir şeydə əzablandıracaq.Ancaq onlar əzabda əbədi qalmayacaq və son olaraq cənnətə girəcəklər.Habelə onlar iddia etmişlər ki, insan (harama) ani baxması yaxud cuzi yalan danışması və həmin şeydə israrlı olması ilə müşrik olur.İsrar etməyəcəyi halda zina edən, oğurluq edən və şərab içən şəxs isə müsəlmandır."[375]

Şəhrastani (rahiməhullah) demişdir: "Xəvariclərin ən böyük firqələri altıdır: "Əzəriqa, Nəcdət, Sufriyyə, Acəridə, İbadiyyə, Səalibə.Digər firqələr isə onlardan şaxələnir. Onları bir araya toplayan söz, həmin insanların Osman və Əlini özlərinə yaxın bilməmələridir.Onlar bu əsası hər bir itaətin önünə çəkir və nigah sazişinin yalnız bu əsas üzərə səhih olacağını deyirlər.Habelə onlar böyük günah sahiblərini təkfir edir və sunnəyə müxalif olacağı təqdirdə imama qarşı üsyan qaldırmağın vacib bir haqq olduğunu hesab edirlər."[376]

Şeyx Ğalib əl-Avəci qeyd etmişdir ki, xəvariclərin çoxu asikar müsəlmanları İslamdan çıxaran küfr ilə təkfir edir, onların İslamdan çıxdığını və digər kafirlərlə birlikdə cəhənnəmdə əbədi qalacaqlarını deyirlər.Bu arada İbadiyyə

---

[374] Məqalətul isləmiyyin:1/168.
[375] Məqalətul isləmiyyin:1/175.
[376] əl-Miləl va-n-nihal:1/107.

firqəsi onların (böyük gübah sahiblərinin) nemətə nankorluq etmə küfrünə düşdüklərini deyir, eyni zamanda günah sahibinin tövbə etmədən öləcəyi zaman cəhənnəmdə olacağına hökm verir və onun dünyada münafiq olduğuna hökm çıxarırlar.Onlar nifaqı nemətə küfr etməyə həmməna edirlər.[377]

Mötəzilənin məşhur sözlərindən biri isə, onların böyük günah sahibinin nə mömin nə də ki, kafir olmadığını deməlıəridir.Üstəlik onun iki məqam arasında olan bir məqamda olduğunu deyirlər. Onlar xəvariclər kimi həmin şəxsin cəhənnəmdə əbədi qalacağını, bununla belə həmin şəxsin kafirlərin görəcəyi əzabı görməyəcəyini deyirlər.

Əşari "əl-məqalət" kitabında demişdir: "Əsammdan savayı ondan öncə (Cəbəi qəsd edilir) bütün mötəzililər fasiqin mömin olacağını inkar edir və belə deyirdilər: Fasiq nə mömin nə də ki, kafir deyil.Onlar onu iki məqam arasında olan məqam adlandırıb deyirdilər: Fasiqin, bizim ona mömin adını verməyəcəyimiz imanı var, habelə yəhudinin, bizim ona mömin adını verməyəcəyimiz imanı vardır."[378]

Habelə demişdir: "Təhdid məsələsinə gəldikdə bunda mötəzililər və xəvariclərin sözü birdir.Çünki onlar deyirlər: Böyük günah üzərə ölən şəxslər cəhənnəmdə əbədi olaraq qalacaqlar.Fərq yalnız ondadır ki, xəvariclər islama nisbət olunan böyük günah sahibinin kafirlərin çəkəcəyi əzabı

[377] Firaqu muasira:1/109.

[378] Məqalətul isləmiyyin:1/331.

çəkəcəyini, mötəzililər isə onun kafirlərin əzabı kimi əzab görməyəcəyini deyirlər."[379]

Habelə onlardan kiçik və böyük günahın təyin edilməsinə, böyük günahlardan yan durmaq şərtilə kiçik günahların bağışlanacağına və burada qeyd olunması lüzumsuz olan digər məsələlərə dair çoxlu ixtilaflar hekayət etmişdir.

Heç şübhəsiz ki, xəvariclər və mötəzililərin sözü Quran və sunnəyə, habelə ümmətin sələfinin getdiyi yola zidd olan məşhur bidətlərdəndir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Bilmək lazımdır ki, Əhli sunnədən heç kəs, böyük günah sahiblərinin atəşdə əbədi olaraq qalacaqlarına dair xəvaric və mötəzili firqələrinə müvafiq gəlməmişdir.Bu söz, məşhur bidətlərdən sayılır.Belə ki, səhabələr, onlara gözəl şəkildə tabe olanlar və müsəlmanların digər imamları qəlbində zərrə qədər imana sahib olan şəxsin cəhənnəmdə əbədi qalmayacağına yekdil olmuşlar.Habelə onlar Peyğəmbərin (salləllahu aleyhi və səlləm) islam ümmətindən olan böyük günah sahiblərinə Allahın izni ilə şəfaət edəcəyinə yekdil olmuşlar.Buxari və Muslimdə gələn hədisdə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Hər bir peyğəmbərin müstəcəb duası olmuşdur. Mən də, öz duamı qiyamət günü ümmətim üçün şəfaət

[379] Öncəki mənbə:1/240.

olaraq saxlamışam."[380] Artıq bu hədislər öz məqamında qeyd edilmişdir."[381]

[380] Muslim:199.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.Buxari:7474.
[381] Məcmu`əl-fətəva:7/222.

# İKİNCİ FƏSİL

## Cəhmiyyə firqəsinə dair açıqlama

**Bura üç araşdırma daxildir:**

**1-Onların imana dair sözü.**

**2-Cəhmiyyə firqəsinə görə küfrün anlamı.**

**3-Cəhmin yanlışlıqları.**

# Birinci araşdırma:

## Onların imana dair sözü

Cəhm və ona müvafiq gələnlər imanın sadəcə Allahı tanımaq oduğunu, küfrün isə yalnız Onun haqqında bilgisizlik olduğunu söyləmişlər.Habelə onlar dil ilə sözün və qəlb və bədən ilə əməl etməyin imandan olmadığını və imanın bir şey olub fərqlənmədiyini və onda istisnanın edilmədiyini demişlər.

Bu, imana dair deyilən ən yaramaz sözdür.Məhz bu səbəbdən imam Əhməd, Vaki` və digərləri bu sözü deyənləri təkfir etmişlər.

İmam Əşari "əl-məqalət" kitabında demişdir: "Murciələr imanın mahiyyətinə dair ixtilaf etmişlər.Onlar on iki firqədən ibarətdirlər.Onlardan olan birinci firqə Allaha imanın yalnız Allah, Peyğəmbər və onun Allah dərgahından gətirdiyi hər bir şey haqqında bilgi olduğunu və bilgidən savayı olan dil ilə iqrarın, qəlb ilə itaətin, Allahı və Peyğəmbəri sevməyin, Allahı və Peyğəmbəri təzim etməyin, Ondan qorxmağın və bədən əzaları ilə əməl etməyin iman olmadığını iddia etmişlər.Habelə onlar Allaha küfrün onun haqqında bilgisizlik olduğunu iddia etmişlər.Bu söz, Cəhm bin Safvandan hekayət edilir."[382]

Şəhrastəni Cəhmin sözlərini bəyan edərək demişdir: "Onun sözlərindən: Əgər biri bildikdən sonra dili ilə

[382] Məqalətul isləmiyyin:1/214.

danarsa, danması ilə kafir olmaz.Çünki elm və bilik danma ilə itmir və həmin şəxs mömin olaraq qalır.Habelə demişdir: İman hissələrə bölünmür, yəni etiqad, söz və əmələ bölünmür.O, demişdir: Onun (iman) sahibləri bir-birindən üstün olmurlar.Belə ki, peyğəmbərlərin imanı və ümmətin imanı bir səviyyədə olur.Çünki bilgilər üstünlük xüsusiyyətindən kənardır.Bütün sələf alimləri bu cür sözləri çox sərt şəkildə rədd etmiş və onu xalis inkarçılıq etiqadına aid etmişlər."[383]

Şeyxul-İslam Əşarinin murciələrin firqələrinə dair sözlərini nəql etdikdən sonra demişdir: "Əşarinin murciələrə dair qeyd etdiyi sözlərin çoxundan elə nəticə çıxır ki, onlara (murciələrə) görə imanda bəzi qəlb əməllərinin olması labüddür.Bu məsələdə isə yalnız Cəhm və Salihi kimi azsaylı adamlar çəkişmə aparmışlar."[384]

Habelə demişdir: "Təsdiqlə bərabər Allahı sevmək və Allahdan qorxmaq kimi müəyyən şeylərin olması labüddür. Çünki təsdiqlə bərabər bundan heç bir şeyin yoxluğu qəti şəkildə iman olmayacaq.Üstəlik həmin təsdiq firon, yəhudilər və iblisin təsdiqi kimi olacaq.Sələfin cəhmiyyə firqəsinə irad tutduğu məsələ məhz budur. Humeydi (rahiməhullah) demişdir: "Vaki`in belə dediyini eşitdim: Əhli sunnə deyirlər: İman söz və əməldir.Murciələr isə: İman sözdür,-deyirlər.Cəhmiyyə isə: İman bilgidir,-deyirlər.Başqa bir rəvayətdə demişdir: Bu, küfrdür.Muhamməd bin Ömər əl-Kulləbi demişdir: Vaki`in belə dediyini eşitdim:

[383] əl-Miləl va-n-nihal:1/74.əl-Fəsl:3/227.

[384] Məcmu`əl-fətəva:7/549.

Cəhmiyyə qədəriyyədən daha şərlidir.Habelə Vaki` demişdir: Murciələr iqrarın əməlin yerini verdiyini deyənlərdir. Bu sözü deyənlər özlərini həlaka atmışlar. Habelə əgər biri: Əməlsiz niyyət yetərlidir,- deyərsə küfr etmiş olar.Bu, Cəhmin sözüdür. Əhməd bin Hənbəl həmçinin Vaki` dediyi kimi demişdir."[385]

Habelə demişdir: "Üstəlik Əhməd bin Hənbəl, Vaki` və digərləri Cəhmin imana dair dediyi sözü deyənləri təkfir etmişlər."[386]

Habelə demişdir: "Cəhm belə deyirdi: İman, dilə gətirilən söz olmazsa belə adicə qəlb təsdiqidir.Ümmətin alimləri və imamlarından hər hansı bir şəxsin bunu deməsi bilinmir.Üstəlik Əhməd, Vaki` və digərləri bu sözü deyənləri təkfir etmişlər. Lakin Əşari və onun ardıcılarının çoxu onu bu məsələdə müdafiə etmişlər.Bununla belə onlar demişlər: Biz şəriətin kafir olması haqqında hökm verdiyi hər bir şəxsə küfr  hökmü verirvə şəriətin onu təkfir etməsinə dair onun qəlbinin bilgidən məhrum olduğunu dəlil olaraq qətiririk."[387]

Burada diqqət çəkən amil, Şeyxul-İslamın imanın bilgi olduğuna dair deyilən sözü onun adicə təsdiq olduğunu deyən sözlə bərabər tutmasıdır.Şeyxul-İslam bunu bəyan etmək üçün demişdir: "Həmçinin qəlb bilgisi ilə tabeçilikdən kənar olub qəlb sözü edilən adicə qəlb təsdiqi

---

385 Məcmu`əl-fətəva:7/307.

386 Öncəki mənbə:7/120.Habelə: 14/121,7/405,10/272.

387 Məcmu`əl-fətəva:13/47.İrəlidə Əşari və onun ardıcıllarının məzhəbinə dair açıqlama gələcək.

arasında olan fərq incə bir məsələdir.Ağıl sahiblərinin çoxu onu inkar edirlər.Onun doğru olduğu fərz edilərsə, hər bir şəxsə, aralarında fərqin təsəvvür olunmadığı iki şeyi vacib etməsi gərəkli olmayacaq. İnsanların çoxu qəlb bilgisi ilə onun təsdiqi arasında fərqin mövcudluğunu təsəvvür etməyərək deyirlər: İbn Kulləbin və Əşarinin fərqin mövcudluğuna dair dedikləri söz həqiqətə uyğun gəlməyən batil sözdür.Onun bir çox ardıcılları fərqin mövcud olmadığını etiraf etmişlər."[388]

Nəhayət demişdir: "Burada məqsəd isə, əgər bir insan bir qədər düşünərsə Peyğəmbərin doğru olduğuna dair bilgi ilə onun doğru olduğuna dair boyun əymə və digər qəlb əməllərindən məhrum olan adicə qəlb təsdiqi arasında fərq qoymaqda çətinlik çəkəcək."[389]

Bu məsələyə dair əlavə açıqlama əşarilərin iman haqqında olan etiqadı əsnasında qeyd ediləcək.

Bir sözlə Cəhm və ona müvafiq gələnlər imanın adicə bilgi yaxud təsdiq olduğunu və bunun, islam sözünü heç vaxtı dilə gətirməyən və vaciblərdən heç bir şey etməyən şəxsə belə fayda verəcəyini hesab edirlər.Bununla belə Cəhm, iblis və firon kimi şəriətin təkfir etdiyi şəxslərin təkfir edilməsinə əməl etmiş, lakin onların qəlbində Allah haqqında heç bir bilginin olmadığını iddia etmişdir.

Şübhəsiz ki, iblis və fironun təsdiqə sahib olmaları cəhmiyyə firqəsinə onların iman sahibləri olduqlarını

[388] Məcmu`əl-fətəva:7/398.
[389] Öncəki mənbə:7/400.

deməyə vadar edir.Bu isə qaçılmaz bir gerçəkdir.Məhz bu səbəbdən, onlar buna cavab verməyə çətinlik çəkmişlər.

İbnul-Qayyim (rahiməhullah) demişdir: "Əgər biri, insan Peyğəmbərə tabe olmasa, ona ədavət bəsləsə, ona nifrət etsə və ona qarşı savaşsa belə imanın, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) və onun gətirdiyi dinin doğru olduğuna adicə etiqad etmək olduğunu deyərsə, həmin şəxsə bunların hamısının mömin olmasını deməsi gərəkli olar.Bu, qaçılmaz bir gərəkdirmədir.Bu səbəbdən bunlar, onlara ünvanlanan sözlərə cavab verməyə çətinlik çəkmişlər.Onlar sadəcə ağıl sahibinin deməyə xəcalət çəkdiyi bir cavabı vermişlər.Belə ki, onlardan bəzisi demişdir: İblis Allahın varlığını, Allahın onun Rəbbi və Yaradanı olduğunu iqrar etmir, bunu bilmir və sadəcə istehza edirdi.Firon və onun tayfası həmçinin Musanın nübuvvətinin doğru olduğunu bilmir və Yaradanın varlığını etiqad etmirdilər.

Bu kimi rüsvayşı görüşlərə düşməkdən Allaha sığınırıq. Görüşləri müdafiə etmək və həmin görüşlərin sahiblərinə təqlid etmək insanı bundan daha çox bəlalara sürükləyir. Yalğız buraxılmaqdan Allaha pənah aparırıq!"[390]

Artıq bir çox dəlillər iblisin Allahı tanıdığını və Onun rübubiyyətini təsdiq etdiyini göstərmişdir.Firon həmçinin bu cür olmuşdur.Uca Allah iblis haqqında buyurur:*"(İblis) dedi: "Ey Rəbbim! Sən məni yoldan çıxartdığına görə, mən də yer üzündə onlara (pis işləri) gözəl göstərib onların hamısını*

[390] Miftəhu dəri-s-səadəti:1/94.

*azdıracağam."*[391] Habelə buyurur: *"(İblis) dedi: "Sənin qüdrətinə and olsun ki, onların hamısını yoldan çıxaracağam".*[392]

Habelə Uca Allah firon və onun tayfası haqqında buyurur: *"Buna qəti inandıqları halda, haqsızcasına və təşəxxüslə onları dandılar. Gör fəsad törədənlərin aqibəti necə oldu!".*[393] Habelə Musanın firona dediyi sözü xəbər verərək buyurur: *"(Musa) dedi: "Sən artıq bilirsən ki, bunları yalnız göylərin və yerin Rəbbi, açıq-aşkar möcüzə olaraq endirdi. Mən isə, ey Firon, sənin məhv olacağını yəqin bilirəm".*[394] Bu isə, iblis və fironun təsdiqə sahib olduqlarını və Cəhm və onu müvafiq gələnlərin iddia etdiyi kimi küfrün təkzib etmə yaxud cəhalət çərçivəsinə salınmadığını göstərir.

---

[391] əl-Hicr:39.

[392] Sad:82.

[393] ən-Nəml:14.

[394] əl-İsra:102.

# İkinci araşdırma:

## Cəhmiyyə firqəsinə görə küfrün anlamı

Artıq Əşarinin xəbər verdiyi və Şeyxul-İslamın ondan nəql etdiyi kimi, Cəhmə görə küfrün Allah haqqında bilgisizlik olması qeyd edilmişdir.

Cəhm imanı qəlb biliyi çərçivəsinə salmış küfrü isə onun tam əksi etmişdir.Yəni, bilginin və təsdiqin yoxa çıxması.O, bundan savayı küfrün olduğunu hesab etmirdi.

Şeyxul-İslam Əşarinin sözlərini nəql edərək demişdir: "Onlar Allaha küfrün Onun haqqında bilgisizlik olduğunu iddia etmişlər.Bu söz, Cəhm bin Safvandan hekayət edilir. Habelə cəhmiyyə firqəsi insanın bilib daha sonra dili ilə bunu danacağı zaman etdiyi danma sabəbilə kafir olmayacağını, imanın hissələrə bölünməyib iman əhlinin onda bir-birindən üstün olmayacağını və iman və küfrün bədən əzalarında deyil yalnız qəlbdə olacağını iddia etmişlər."[395]

Şəhrastəni (rahiməhullah) demişdir: "Cəhmin sözlərindən: Əgər biri bilib daha sonra dili ilə danarsa etdiyi danma sabəbilə kafir olmaz. Çünki elm və bilik danma ilə yoxa çıxmır.Bu səbəbdən həmin şəxs mömindir."[396]

---

[395] Məcmu`əl-fətəva:7/543.

[396] əl-Miləl va-n-nihal:1/74.

Cəhm küfrü qəlb bilgisizliyi və təkzibi çərçivəsinə salmışdır.Bununla belə o, aşkar küfr işlər görənlərin dünyada təkfir ediləcəyinə və nass ilə kafir olub axirətdə əzaba düçar olacaq şəxslər istisna olmaqla həmin şəxslərin daxilən mömin olub cənnət əhlindən olacağına dair hökm vermişdir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Bu səbəbdən, Cəhm və ona müvafiq gələnlər mislində olan kəlam əhli bunun, öz məzhəblərinə uyğun olaraq riayət etməli olduqları zəruri amil olduğunu bildikləri zaman demişlər: Əgər bir şəxs (küfr olan) zahiri əməllərdən bir şey edərsə bununla daxilən kafir olmaz. Lakin bu, dünya əkamlarında küfrə bir dəlil olacaq.Onlara həmin şəxsin axirətdə kafir olacağını tələb edən nasslar göstərildiyi zaman onlar demişlər: Bu nasslar, onun daxilən Allah haqqında heç bir bilgiyə sahib olmadığına dəlalət edir.Bu, onlara görə bir şeydir.Bununla da, onlar sağlam ağıla və səhih dəlilə müxalif çıxmışlar."[397]

Habelə cəhmiyyə firqəsindən savayı bir çox murciələr həmçinin küfrün qəlb çərçivəsindən kənar çıxmadığını demişlər.Lakin onlardan bir qismi küfrü yalnız təkzib etmə və cəhalət amillərinə bağlamır, üstəlik ədavət və sayğısızlıq kimi qəlb əməlinə zidd gələn şeyləri ora daxil edirlər.

Bunların hamısı Əhli sunnəyə, Allahı söymək yaxud Onun üçlük olduğunu demək yaxud bütə səcdə etmək kimi zahiri küfr edənlərin təkfir edilməsi məsələsində müvafiq

---

[397] Məcmu`əl-fətəva:7/401.

olurlar.Lakin onlar bunun özlüyündə küfr olduğunu deyil sadəcə küfrün bir əlaməti olduğunu hesab edirlər.

Bunlardan biri Əbul Hüseyn əs-Salihi adlı şəxsdir.Belə ki, o Cəhmə müvafiq gələrək küfrün yalnız Allah haqqında bilgisizlik olduğunu, habelə Allahın üç ilahdan üçüncüsü olduğunu deyənin sözünün küfr olmadığını lakin bu sözün ancaq kafirdən çıxacağını demişdir.Çünki Allah bu sözü deyəni təkfir etmiş və müsəlmanlar bu sözlərin yalnız kafir tərəfindən dilə gətiriləcəyinə dair icma etmişlər.[398]

Bu, Əşarinin seçdiyi iki görüşdən biridir.Şeyxul-İslam demişdir: "Artıq Əşari "əl-mucəz" kitabında əs-Salihinin bu və digər sözlərini qeyd etmiş daha sonra demişdir: "Adlara dair seçdiyim əs-Salihinin sözüdür."[399]

---

[398] Məqalətul isləmiyyin:1/214.Məcmu`əl-fətəva:7/544.əl-Miləl va-n-nihal:1/142.əl-fərq beynəl firaq:195.

[399] Məcmu`əl-fətəva:7/544, 7/509. Şeyxul-İslam bir çox yerdə Cəhm ilə əs-Salihini bir arada qeyd edir və əşarilərin bu iki şəxsin sözlərini müdafiə etdiklərini vurğulayır.Şübhə yoxdur ki, Cəhm və əs-Salihi imanın yalnız Allahı tanımaq olduğuna, habelə küfrün yalnız Onu tanımamaq olduğuna yekdildirlər.Əşari bunu onlardan "əl-məqalət" əsərində xəbər vermişdir.Habelə Şeyxul-İslam bunu nəql etmişdir.Lakin araşdırma zamanı məlum olur ki, əs-Salihi Cəhmə iki məsələdə müxalif olmuşdur:

Birinci: O, iddia etmişdir ki, "Allahı tanımaq: Onu sevmək və Ona boyun əyməkdir." (əl-Məqalət:1/214. Məcmu`əl-fətəva:7/544) Beləliklə də, o, qəlb əməlini isbat edib onu məhz biliyin özü etmişdir.Cəhm isə, qeyd edildiyi kimi qəlb əməlini isbat etmir.Lakin əs-Salihinin məzhəbi həmçinin batildir.Onun sözündən elə çıxır ki, iblis və firon qəlb əməlinin getməsi səbəbilə Allahı təsdiq etmirdilər.Güman ki, Şeyxul-İslam əs-Salihi və onun ardıcıllarına bu məqamda işarə etrmişdir: "Murciələr zahiri əməli imandan çıxarmışlar.Onlardan qəlb əməllərini həmçinin çıxartmağı qəsd edib onu təsdiq edənlər açıq-aydın zəlalətdədirlər.(Məcmu`əl-fətəva:7/554.Buna dair Cəhmin "bilgisi" ilə Əşarilərin "təsdiqi" arasında olan fərqə dair söhbət zamanı açıqlama gələcək.)

İkinci: əs-Salihidən nəql edilən üstün görüş onun zahiri küfrlər edənin daxilən kafir olacağına dair hökm verməsidir.Cəhm isə küfr danışanın yaxud

Habelə bunlardan biri, Bişr əl-Mirrisidir.Həmin şəxs günəşə səcdə etməyin və Allahdan qeyrisinə səcdə etməyin küfr olmadığını lakin bunun küfrün əlaməti olduğunu deyirdi. Çünki Allah, günəşə yalnız kafirin səcdə etdiyini bəyan etmişdir.[400]

Habelə bunlardan biri, Əbu Muaz ət-Tuməni və onun ardıcıllarıdır.Həmin şəxs deyirdi: Əgər biri peyğəmbəri öldürər yaxud vurarsa kafir olar.Ancaq həmin şəxs zərbə səbəbilə deyil ancaq saygısızlıq, ədavət və nifrət səbəbilə kafir olur.[401]

İbn Hazm (rahiməhullah) cəhmiyyə firqəsinin və onlara müvafiq olanların məzhəbini bəyan edərək demişdir: "Bunlar demişlər: Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təhqir etmək küfr deyil və sadəcə bunu edənin qəlbində küfrün olmasına bir nişanədir."[402]

Habelə demişdir: "Uca Allahı söymək məsələsinə gəldikdə isə cəhmiyyə və əşarilərdən savayı yer üzündə bunun xalis küfr olmasına müxalif gələn müsəlman yoxdur.Yuxarıda qeyd edilən iki tayfanın sözləri isə dəyərsizdir.Bunlar Uca Allahı söyməyin və küfrü elan etməyin küfr olmadığını deyirlər. Onlardan bəzisi demişlər: Bunu deyən, Uca Allahı söymə səbəbilə yəqinliklə kafir

---

küfr edənin zahirdə kafir daxildə isə mömin olacağını demişdir.Əşari isə əs-Salihinin sözünə tabe olub Cəhmin buna dair sözünə müxalif olmuşdur.Buna dair açıqlama ikinci hissədə gələcəkdir. Əşarinin məzhəbini dəstəkləyən şəxslər bu məsələdə ixtilaf etmişlər.Onlardan bir qismi əs-Salihinin sözünə bir qismi isə Cəhmin sözünə meyl etmişlər.

[400] Məqalətul isləmiyyin:1/140.Məcmu`əl-fətəva:7/548.əl-Fərq beynəl firaq:193.

[401] əl-Miləl va-n-nihal:1/141.

[402] əl-Fisal:3/239.

olmur və bu, sadəcə həmin şəxsin küfrü etiqad etdiyinə bir dəlildir.Onların bu məsələdə əsası islam əhlinin icmasından kənar olan yaramaz əsasdır.Onlar deyirlər: İnsan təqiyyə və rəvayət yolu ilə olmadan öz ixtiyarı ilə küfrü və bütlərə ibadəti elan edəcəyi halda belə iman yalnız qəlb ilə təsdiqdir.

Əbu Muhamməd (rahiməhullah) demişdir: Bu, xalis küfrdür. Çünki bu, ümmətin icmasına, Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm), habelə bütün səhabələrin və onlardan sonra gələnlərin hökmünə ziddir.Rafizilərdən olan kafir tayfa Quranın nöqsanlı olub təhrif olunduğunu iddia etmələrinə rəğmən insanlardan heç kəs istər kafir istərsə də, mömin olsun bu Quranın Muhamməd (salləllahu aleyhi və səlləm) tərəfindən gəldiyinə və onun Uca Allahdan gələn vəhy olduğunu dediyinə dair ixtilaf etməmişdir.Onlar qeyd etdiklərimiz şeylərə, orada küfr adlanan şeylərin olduğuna və məlum sözlər dilə gətirən şəxslərə qəti olaraq küfr hökmü çıxarılacağına dair ixtilaf etməmişlər.Misal olaraq Uca Allah buyurur: *"Şübhəsiz ki, Allah Məryəm oğlu Məsihdir"– deyənlər artıq kafir oldular."*[403] Habelə buyurur: *"Onlar küfr sözünü demiş, İslamı qəbul etdikdən sonra kafir olmuşlar".*[404] Məlum olmuşdur ki, küfr həmçinin sözlə olur.

İblis (ləanəhullah) Uca Allahın onu oddan Adəmi isə palçıqdan yaratdığını bildiyi halda Uca Allah ona kafir hökmünü çıxarmış və ona Adəmə səcdə etməyi əmr edərək

[403] əl-Maidə:72.
[404] ət-Təubə:74.

Adəmi ondan üstün etmişdir. İblis isə qiyamət gününə qədər Allahdan möhlət istəmişdir.

Sonra onlara deyiləcək: Əgər Uca Allahı söyməsk sizə görə küfr deyilsə belə olan halda onun küfrə dəlalət etdiyinə dair dediyiniz sözü haradan çıxartmısınız?

Əgər onlar: Çünki onu deyən şəxsə küfr hökmü çıxarılmışdır,-desələr, onlara deyiləcək:Həmin şəxsə ancaq Uca Allahın bildiyi gizli qəlb etiqadına əsasən deyil yalnız dediyi sözünə əsasən hökm çıxarılmışdır.Uca Allah yalnız onun sözünə küfr hökmü çıxarmışdır.Çünki onun sözü küfrdür.Həmin şəxsin qəlbində bunun olduğunu qəti olaraq bilən varmı? Artıq Uca Allah bir tayfa haqqında belə xəbər vermişdir: *"Onlar qəlblərində olmayanı ağızları ilə deyirlər."* [405]Bununla da onlar, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) nübuvvətinin doğru olduğunu öz övladlarını tanıdıqları kimi tanıyan, lakin buna rəğmən əminliklə kafir olduqları bilinən yəhudilər kimi kafir olmuşlar.Çünki onlar küfr sözünü elan etmişlər."[406]

Bir sözlə cəhmiyyə və onlara müvafiq gələnlər küfrü qəlb cəhaləti və təkzibi amilinə qaytarır, bununla bərabər Allahı söymək və bütə səcdə etmək kimi icma ilə küfr olması sabit olan şeyləri edəni təkfir edib deyirlər: Şəriət sahibi bunu küfrün nişanəsi etmişdir.Həmin şeyi edən şəxsin daxilən mömin olması istisna olunmur.

---

[405]Ali İmran:167.

[406] Muxtəsaru-l-isal, mulhaqu bil Muhallə:12/435.

Bu, onların həmin məsələdə seçdikləri ümumi məsləkdir. Onlar zahir ilə daxil arasında olan bağlılığı inkar edirlər.Onlar zahirdə böyük küfr olan söz və əməllərin olması ilə birgə qəlbdə doğru və tam imanın olduğunu, habelə küfr edən şəxsin zahirinə küfr hökmünü çıxarmağın həmin şəxsin daxilən mömin və axirət diyarında səadətə qovuşan şəxslərdən olmasına maneə olmadığını iddia edirlər.

Onlara iblis və firon kimi bir kimsənin həm zahirən həm də, daxilən kafir olacağına və axirətdə kafirlərin əzabını görəcəyinə dair bir nass yaxud icma gətirildiyi zaman onlar deyirlər: Bu, onun təsdiq və bilikdən məhrum olduğuna dəlalət etməsindən irəli gəlir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Cəhm və Salihinin sözünü deyən bu şəxslər Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söyməyin, üçlük sözünü dilə gətirməyin və küfr olan hər bir söz danışmağın daxilən küfr olmadığını və yalnız zahirdə küfrün olmasına dəlalət etdiyini iddia etmişlər.Həmin söyən və təhqir edən şəxsin daxilən Allahı tanıyan, Onu təkləşdirən və Ona iman gətirən şəxs olması caizdir.Ancaq nass yaxud icma vasitəsilə həmin şəxsin həm daxilən həm də zahirən kafir olacağına dair onların üzərindən hüccət qaldırıldığı zaman onlar belə deyirlər: Bu, onun daxilən təkzib etdiyini gərəkdirir, iman isə bunun olmamasını tələb edir."[407]

[407] Məcmu`əl-fətəva:7/557, 7/583.

Habelə demişdir: “Burada Cəhm bin Safvan və onun ardıcıllarının xətası üzə çıxır.Belə ki, onlar imanın adicə qəlb təsdiqi və elmi olduğunu düşünmüş və qəlb əməllərini imandan etməmişlər.Habelə onlar bəzən Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söyən, Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) ədavət bəsləyən, Allahın dostları ilə düşmənçilik edən, Onun düşmənləri ilə dostluq edən, peyğəmbərləri qətlə yetirən, məscidləri viran edən, Quran yazısına sayğısızlıq edən, kafirlərə son dərəcə sayğı göstərib möminləri isə son dərəcə alçaldan bir insanın qəlbən kamil imana sahib olacağını düşünmüşlər.Onlar demişlər: Bu, qəlbdə olan imana zidd gəlməyən günahlardır. İnsanın Allah qatında mömin olduğu halda bu işləri etməsi mümkündür.Onlar demişlər: Ona yalnız dünyada kafirlərin əhkamları sabit olur. Çünki bu sözlər, iqrar və şahidlər vasitəsilə hökm verildiyi kimi zahirə uyğun hökm verilməsi üçün küfrün əlamətidir.Çünki bəzən insan, daxildə iqrar etdiyindən fərqli olur, şahidlik gətirən şahidlər həmçinin. Ancaq onlara Quran, sunnə və icmadan belə şəxslərin həmin səbəbə görə kafir və axirətdə əzaba düçar olacağı gətirildiyi zaman belə deyirlər: Bu, onun qəlbində təsdiq və elmin yoxluğuna dəlildir.Onlara görə küfr bir tək şeydir ki, o da cəhalətdir.İman həmçinin bir şeydir: Elm yaxud qəlbin təkzibi və təsdiqi.Onların ixtilaf etdiyi məsələ: Qəlb təsdiqi elmdən savayı bir şeydirmi yoxsa onların ikisi bir şeydir?

Bu sözün imana dair deyilən ən yaramaz söz olmasına rəğmən kəlam əhlindən olan murciələrin bir çoxu bu görüşü seçmişlər.Vaki` bin Cərrah, Əhməd bin Hənbəl, Əbu Ubeyd

və digərləri kimi sələf alimləri bu sözü deyənləri təkfir etmişlər. Onlar demişlər: İblis Quranda bildirildiyi kimi kafirdir. Onun küfrü isə xəbəri təkzib etməsi etibarı ilə deyil yalnız təkəbbürlük göstərməsi və Adəmə səcdə etməkdən imtina etməsi səbəbilə olmuşdur.Firon və onun tayfası həmçinin. Uca Allah onlar barəsində buyurur:*"Buna qəti inandıqları halda, haqsızcasına və təşəxxüslə onları dandılar".*[408] Habelə Musa firona demişdir: *"(Musa) dedi: "Sən artıq bilirsən ki, bunları yalnız göylərin və yerin Rəbbi, açıq-aşkar möcüzə olaraq endirdi."*[409]Bu sözləri bu ayələrdən sonra demişdir: *"Biz Musaya doqquz aşkar möcüzə verdik. İsrail oğullarından soruş; (Musa) onların yanına gəldikdə Firon ona: "Ey Musa! Mən sənin ovsunlandığını zənn edirəm"– demişdi. (Musa )dedi: "Sən artıq bilirsən ki, bunları yalnız göylərin və yerin Rəbbi, açıq-aşkar möcüzə olaraq endirdi. Mən isə, ey Firon, sənin məhv olacağını yəqin bilirəm."*

Doğru danışan Musa (aleyhi-s-sələm) belə demişdir: Sən artıq bilirsən ki, bunları yalnız göylərin və yerin Rəbbi, açıq-aşkar möcüzə olaraq endirdi.Bu isə onu göstərir ki, firon ayələri nazil edənin Allah olduğunu bilirdi.Firon elmsizlik səbəbilə deyil sadəcə pis iradəsi və məqsədləri səbəbilə insanlar içində ən çox inadkarlıq və tüğyan edən şəxs olmuşdur.Uca Allah buyurur: *"Həqiqətən, Firon yer üzündə təkəbbürlük göstərib onun əhalisini zümrələrə bölmüşdü. (Firon) onlardan bir zümrəni zəiflədir, onların oğlan uşaqlarını öldürür, qadınlarını isə sağ buraxırdı.*

[408] ən-Nəml:14.
[409] əl-İsra:102.

*Həqiqətən, o, fitnə-fəsad törədənlərdən idi."*[410] Habelə buyurur: *"Buna qəti inandıqları halda, haqsızcasına və təşəxxüslə onları dandılar".*[411] Habelə Uca Allahın xəbər verdiyi yəhudilər: *"Kitab verdiyimiz şəxslər onu (Peyğəmbəri) öz oğullarını tanıdıqları kimi tanıyırlar."*[412] Habelə Uca Allahın xəbər verdiyi bir çox müşriklər: *"Əslində onlar səni yalançı hesab etmirlər. Lakin zalımlar Allahın ayələrini inadla danırlar."*[413][414]

Şeyxul-İslam imam Əhmədin bu adamlara, Allahı iqrar etdiyi üçün "zunnər" zimmə əhlinin taxdığı kəməri taxanın, xaç asanın və kilsə və məbədlərə gedənin iman sahibi olacağını gərəkdirən sözü deməli olduqlarını qeyd etdikdən sonra demişdir:

"Dedim: İmam Əhmədin qeyd etdiyi bu sözlər insanların onların əleyhinə gətirdiyi ən gözəl sözlərdir.O, bu məsələyə dair digər insanların dedikləri sözlərin bir qismini bir araya toplamışdır.Bu, qaçılmaz bir gərəkdirmədir.Bu səbəbdən Cəhm və ona müvafiq gələnlər mislində olan kəlam əhli bunun məzhəblərinə uyğun riayət etməli olduqları zəruri amil olduğunu bildikləri zaman demişlər: Əgər bir şəxs (küfr olan) zahiri əməllərdən bir şey edərsə bununla daxildə kafir olmaz lakin bu, dünya əkamlarında küfrə bir dəlil olacaq.Onlara həmin şəxsin axirətdə kafir olacağını tələb edən nasslar göstərildiyi zaman onlar demişlər: Bu nasslar,

---

[410] əl-Qasas:4.
[411] ən-Nəml:14.
[412] əl-Bəqərə:146.
[413] əl-Ənam:33.
[414] Məcmu`əl-fətəva:7/188.Habelə:7/146.

onun daxilən Allah haqqında heç bir bilgiyə sahib olmadığına dəlalət edir.Bu, onlara görə bir şeydir.Bununla da, onlar sağlam ağıla və səhih dəlilə müxalif çıxmışlar."[415] Üstəlik onların müxalifliyi "sağlam fitrətə sahib olan insanların icmasına və bir çox düşüncə sahiblərinin görüşünə qarşı çıxmalarıdır. İnsan bəzən haqqın digəri tərəfində olduğunu bilir lakin ona olan həsəd səbəbilə yaxud ondan daha üstün olma arzusu ilə yaxud nəfsi istək üzündən onu danır.Çünki həmin şəxs qəlbində haqqın digəri ilə olduğunu bildiyi halda onun nəfsi istəkləri onu digərinə təcavüz etməyə və hansı yol ilə olursa olsun onun dediyi sözləri rədd etməyə sövq edir.

Peyğəmbərləri təkzib edənlərin hamısı haqqın onların (peyğəmbərlərin) tərəfində olduğunu və onların doğru danışan olduqlarını bilir lakin onlara olan həsəd yaxud ağalıq və lovğalıq istəyi yaxud mənsub olduqları dini və mal-dövləti, ağalığı, tayfalar arasında dostluğu və həmin şeylərin vasitəsi ilə əldə etdikləri digər marağları sevdikləri səbəbilə peyğəmbərlərə tabe olmaqda onlara xoş gələn istəklərin tərk edilməsini yaxud onlara xoş gəlməyən işlərin baş verəcəyini hesab edir və nəticə etibarı ilə onları təkzib edir, onlara ədavət bəsləyir və bu üzdən iblis və firon kimi ən kafir insanlara çevrilirlər.Bununla belə onlar özlərinin batil peyğəmbərlərin isə haqq üzərində olduqlarını bilirlər."[416]

---

[415] Məcmu`əl-fətəva:7/401.

[416] Məcmu`əl-fətəva:7/191.

# Üçüncü araşdırma:

## Cəhmin yanlışlıqları

Şeyxul-İslam kitablarının bir çox yerində Cəhmin düşdüyü zəlalətləri qeyd etmişdir.Buna səbəb həmin fikirlərin çox təhlükəli, zərərli və yaramaz olması və Əhli sunnəyə mənsub olan boyük bir camaatın ona tabe olmasıdır. Şeyxul-İslam (rahiməhullah) demişdir: "Cəhmin imana dair təməli bir çox yöndən yanlışdır:

Onlardan: Onun, Allahı sevmək, Ondan qorxmaq və digər qəlb əməlləri olmadan imanın adicə qəlb təsdiqi və biliyi olduğunu düşünməsidir.

Habelə onun, şəriətin kafir və əbədi cəhənnəmlik olması barədə hökm verdiyi şəxsin qəlbində təsdiqə sahib olacağını qeyri-mümkün hesab etməsidir.Bu səbəbdən onlar iblis, firon, yəhudilər və onlara bənzərlərin qəlbində bundan heç bir şeyə sahib olmadıqlarına dair əminlik ifadə etmişlər."[417]

Habelə demişdir: "Artıq qeyd etmişik ki, onlar üç yöndən yanlışlığa düşmüşlər:

*Birinci*: Onlar qəlbdə olan imanın qəlbdə olan əməlsiz tam olacağını düşünmüşlər.İmanın Allahı sevmək, Ondan qorxmaq, Ona təvəkkül etmək, Ona qovuşmağı arzulamaq

[417] Məcmu`əl-fətəva:10/749.Habelə:7/582-584.Şeyxul-İslam orada Cəhmin altı yanlışlığını qeyd etmişdir:Habelə 7/190 bax.Orada cəhmiyyənin yanlışlıq etdiyi iki əsası qeyd etməklə kifayətlənmişdir.

kimi qəlb əməlləri olmadan adicə təsdiq odluğunu düşünmüşlər.

*İkinci*: Onlar qəlbdə olan imanın zahiri əməl olmadan tam olacağını düşünmüşlər.Bunu isə bütün murciələr deyirlər.

*Üçüncü*: Onlar demişlər: Şəriətin təkfir etdiyi hər bir şəxs yalnız qəlbən Uca Rəbbi təsdiq etmədiyi səbəbilə təkfir olunmuşdur.

Sonraki insanların bir çoxu sələfin görüşləri ilə murciə və cəhmiyyənin sözlərini ayırd edə bilmirlər.Buna səbəb, imana dair daxilən cəhmiyyə və murciələrin görüşündə olan bir çoxlarının sözlərində birinin digəri ilə qarışıq düşməsidir.Həmin şəxs sələfi və hədis əhlini yüksək tutur və onların sözləri arasında cəm apardığını yaxud özü kimilərin sözü ilə sələfin sözü arasında cəm apardığını düşünür."[418]

Habelə demişdir: "Əbul Həsənin Cəhmin imana dair sözünü müdafiə etməsi səbəbilə Cəhmin imana dair sözünə müvafiq gələnlər bəzən sələf və imamların sözünü bəzən isə Cəhmə müvafiq gələn kəlam əhlinin sözünü deyirlər.Bu hətta Allahı və Peyğəmbəri söymək məsələsinə aiddir.Mən hənbəli, şafii və malikilərdən olan bir toplum insanın imamların sözləri haqqında söz açdığı zaman belə dediyini gördüm: Bu, həm daxilən həm də, zahirən küfrdür.Onların sözlərini danışdıqları zaman isə belə deyərdilər: Bu, zahirən

[418] Məcmu`əl-fətəva:7/363.

**küfrdür, ancaq onun daxilən tam imana sahib olan mömin olması caizdir.Axı onlara görə iman hissələrə bölünmür."[419]**

---

[419] **Öncəki mənbə:7/403.**

Kərramilər imanın yalnız dil ilə söz olduğunu və onun artıb azalmayan və istisna edilməyən bir şey olduğunu demişlər.

Əşari "əl-məqalət" kitabında demişdir: "Murciələrdən olan on ikinci firqə: Muhamməd bin Kərramın ardıcılları olan kərramilərdir.Onlar imanın qəlbı çıxmaqla yalnız dil iqrarı və təsdiqi olduğunu iddia etmiş və qəlb biliyinin yaxud dil təsdiqindən başqa bir şeyin iman olacağını inkar etmişlər. Onlar Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində olan münafiqlərin əslində mömin olduqlarını iddia etmişlər.Habelə onlar Allaha küfrün dil ilə danma və inkar etmə olduğunu iddia etmişlər."[420]

Dedim: Kərramilər münafiqi mömin adlandırırlar.Lakin irəlidə qeyd ediləcəyi kimi onun əbədi cəhənnəmlik olduğuna hökm verirlər.

İbn Mandəh (rahiməhullah) demişdir: "Onlardan (murciələrdən) bir tayfa demişlər: İman qəlbi çıxmaqla dil əməlidir. Onlar irca fikrində aşırıya varan şəxslərdir."[421]

İbn Hazm (rahiməhullah) demişdir: "İnsanlardan bir tayfa, insanın qəlbi ilə küfr etiqadda olacağı halda belə imanın Allahı dil ilə iqrar etmək olduğunu demişlər.İnsan bunu etdiyi zaman mömin və cənnətlik olur.Bu, Muhamməd bin Kərram əs-Sicistəni və onun ardıcıllarının sözüdür."[422]

---

[420] Məqalətul isləmiyyin:1/233.
[421] əl-İmən, ibn Mandəh:1/331.
[422] əl-Fisal:3/227.

Dedim: İbn Hazm burada kərramiyyə haqqında yanlış fikir yürütmüşdür. Çünki onlar münafiqin xilas olacağına hökm vermir, üstəlik onun əbədi cəhənnəmlik olduğunu deyirlər.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Kərramilər bütün insanların iman baxımından eyni olması və imanda istisnanın edilməməsi məsələsində murciə və cəhmiyyələrə müvafiq gəlirlər.Onlar imanı aşkar edən şəxs üçün əlavə olaraq deyirlər: O, həqiqi mömindir.Lakin həmin şəxs münafiq olacağı təqdirdə onlara görə əbədi cəhənnəmlik olacaq.Çünki cənnətə yalnız həm daxilən həm də, zahirən iman gətirmiş daxil olacaq.Onların adından münafiqin cənnətə daxil olacağını xəbər verənlər isə yalan danışmışlar. Əslində isə onlar belə deyirlər: Münafiq mömindir.Çünki iman zahiri sözdür.Eynilə digərləri həmin şəxsi müsəlman adlandırır.Çünki İslam, zahiri təslimiyyətdir.

Şübhəsiz ki, cəhmiyyənin sözü onların sözündən şəriət, dil və ağıl cəhətindən bir çox səbəbə görə yararsızdır.

Əgər: Kərramiyyənin sözü müsəlmanların icmasından kənar bir sözdür,-deyilərsə, cavab olaraq deyiləcək: Habelə Cəhmin imana dair sözü ondan öncəki müsəlman icmasından kənardır. Üstəlik sələf Cəhmin imana dair sözünü deyənləri təkfir etmişlər."[423]

Habelə demişdir: "Cənnətə layiq olan möminin daxilən mömin olması labüddür.Bu məsələdə qiblə əhlinin, hətta münafiqi mömin aldandıran kərramilərin yekdilliyi möv-

---

[423] Məcmu`əl-fətəva:7/141.

cuddur.Kərramilər deyirlər: İman sözdür.Habelə deyirlər: Axirətdə yalnız daxili iman fayda verəcək.

Bəziləri onların adından güya onların münafiqləri cənnət əhlindən etmələrini xəbər vermişlər.Bu, onların adından yanlış sözdür. Onlar imanın hissələrə bölünmədiyinə və fərqlənmədiyinə dair murciələrin şübhəsi səbəbilə hökm deyil yalnız ad məsələsinə dair ixtilaf etmişlər."[424]

Şeyxul-İslam (rahiməhullah) murciələrin şübhəsi dediyi zaman kərramilərin: İman hissələrə bölünmür,-sözündən qaçmaq üçün imanı, söz olan bir şey etmələrinə və etiqadı ora daxil etməmələrinə işarə edir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Kərramilərin bilgi və təsdiqin vacibliyini rədd etmədiklərinə rəğmən onlar belə deyirlər: Bu şeylər imana daxil deyil.Bunu deməklə onlar imanın hissələrə bölünməsi sözündən qaçmaq istəyirlər. Çünki onlar imanın bir hissəsi gedəcəyi zaman digər hissəsinin qalacağını mümkünsüz sayırlar.Üstəlik onlara görə bu, qəlbdə iman və təkəbbürlüyün bir arada gəlməsini gərəkdirir.Əşarinin və digərlərinin icma olaraq qeyd etdikləri kimi onlar bunun mümkünsüz olduğuna dair icmanın olduğunu etiqad etmişlər.

Həmin adamlar böyük elm, ibadət, habelə gözəl islam və iman sahibləri olmaları ilə bərabər bu şübhəyə düşmüşlər. Bu səbəbdən fəqih murciələrin sırasına ümmətdə elmi və dini ilə seçilən şəxslər daxil olmuşlar.Buna görə də, sələfdən

[424] Məcmu`əl-fətəva:7/215.

heç kəs fəqih murciələrdən hər hansı bir şəxsi təkfir etməmiş və bunu etiqadı bidətlərdən deyil sadəcə bidət söz və əməllərdən etmişlər.Çünki həmin məsələlərdə ixtilafın çoxu ləfzidir.Bununla belə, məhz Quran və sunnəyə uyğun gələn ləfz doğrudur. Heç kim Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözünə müxalif söz demək hüququna malik deyil. Ələxsus qeyd etmək lazımdır ki, bütün bunlar murciə və digərlərindən olan kəlam əhlinin bidətlərinə və günahların çoxalmasına yol açmışdır.Bununla da, ləfzdə olan həmin xırda xəta əqidə və əməllərdə böyük yanlışlığa səbəb olmuşdur.Məhz bu səbəbdən irca fikrinə böyük iradlar tutulmuşdur."[425]

### *Kərramilərin sözlərində olan əcaiblik*:

Ötənlərdən bəlli olur ki, kərramilər,murciəlik və əməlin imandan çıxarılması bidəti ilə münafiqə mömin adının verilməsi kimi ləfzi əcaibliyi bir arada cəm etmişlər.

Şeyxul-İslam Cəhmin qəlb əməllərini imandan çıxarması sözü ilə kərramilərin sözü arasında müqayisə apararaq demişdir: "Bu söz, (Cəhmin sözü) əcaibdir.Habelə imanın adicə dil ilə söz olduğunu deyən kərramilərin sözü əcaibdir." Nəhayət dedi: "İbn Kərramın sözündə hökm deyil ad müxalifliyi vardır.Çünki o, münafiqləri mömin adlandırması ilə bərabər onların əbədi cəhənnəmlik olduqlarını deyirdi.Bununla da o, camaata hökmdə deyil adda müxalif

[425] Məcmu`əl-fətəva:7/394.

olmuşdur.Cəhmin ardıcılları isə həm ad həm də, hökmdə müxalifdirlər."[426]

[426] Məcmu`əl-fətəva:7/550.İbn Hazm, Kərram və onun əshabından onların belə dediklərini xəbər vermişdir: "Əgər biri qəlbində küfr etiqadı daşıyarsa Uca Allah qatında mömin olar, habelə Allahın dostu və cənnət əhlindən olar. Daha sonra bəzi kərramilərin bunu dediklərini qeyd etdi və onlardan Muhamməd bin İsa əs-Sufi əl-Əlbirinin adını çəkdi.Daha sonra dedi: "Kərramilərdən bir dəstə insan demişlər: "Münafiqlər mömin və cəhənnəm əhlindən olan müşriklərdir."(əl-Fisal:5/73,74) Şeyxul-İslam kitablarının bir sıra yerlərində münafiqin Allah qatında iman sahibi olacağına və axirətdə qurtuluşa nail olacağına dair kərramilərə nisbət edilən sözün onların adına deyilən yanlış fikir olduğunu qeyd etmişdir.Buna dair irəlidə geniş açıqlama qeyd ediləcək.

# DÖRDÜNCÜ FƏSİL

## Əşariyyə firqəsinə dair açıqlama

Beş araşdırmadan ibarətdir:

1-Onların imana dair sözləri.

2-Onların imanın artıb azalmasına dair sözləri.

3-Onların imanda istisna etməyə dair sözləri.

4-Əşarilərin təsdiqi ilə Cəhmin bilgisi arasında fərq.

5-Əşarilərə görə küfrün anlamı.

# Birinci araşdırma:

## Onların imana dair sözləri

Həmin firqənin imamı Əbul Həsən əl-Əşarinin iki məşhur görüşü vardır: Birinci, onun sələfə müvafiq gəlməsi, ikinci isə Cəhmə müvafiq gəlməsidir.Belə ki o, “məqalətul isləmiyyin” və “əl-ibənə” kitablarında sələfin məzhəbini müdafiə etmişdir. O, hədis və sunnə əhlinin yolu haqqında xəbər verərək demişdir: “Onlar imanın söz və əməl olduğunu və artıb azaldığını iqrar edir və onun məxluq yaxud qeyri-məxluq olduğunu demirlər. Habelə onlar böyük günah sahiblərndən heç bir şəxsin cəhənnəmdə qalacağına şahidlik etmir və tövhid əhlindən heç kimin cənnətlik olduğuna hökm vermirlər.Habelə onlar deyirlər: Onların işi Allaha aiddir və Allah istəsə onları əzaba düçar edər istəsə bağışlayar.Habelə onlar Uca Allahın tövhid əhlindən bir toplum insanı cəhənnəmdən çıxaracağına iman edirlər.Buna dair Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) rəvayətlər gəlmişdir.”[427]

Daha sonra demişdir: “Bu, onların əmr etdiyi, habelə əməl edib etiqad etdikləri məsələlərdir.Biz onların sözlərindən qeyd etdiklərimizi deyir və həmin görüşü seçirik.Bizi müvəffəq edən yalnız Allahdır.O, bizə kifayət edər və O,

[427] Məqalətul isləmiyyin:1/347

necə də gözəl havadardır.Biz ondan kömək diləyir və Ona təvəkkül edirik.Qayıdış Ona tərəfdir."[428]

Əl-İbənə kitabında demişdir: "Əgər biri bizə deyərsə ki, artıq siz mötəzili, qədəri, cəhmi, haruri, rafizi və murciələrin sözlərini rədd etdiniz.Onlar da, bizə sizin dediyiniz sözləri və mənsub olduğunun etiqadı bildirdilər.Ona cavab olaraq deyiləcək: Bizim dediyimiz söz və mənsub olduğumuz etiqad, Rəbbimiz olan Allahın kitabı, Peyğəmbərimiz Muhammədin (salləllahu aleyhi və səlləm) sunnəsi və bizim böyüklərimiz olan səhabə, tabiin və hədis imamlarınından rəvayət olunanlara sarılmaqdır.Biz məhz bunu və Əbu Abdullah Əhməd bin Muhamməd bin Hənbəlin -Allah onun üzünü nurlandırsın, dərəcəsini yüksəltsin və savabını artıqlaması ilə versin- dediyi sözləri deyirik.Onun sözünə müxalif olan sözlər isə haqqa müxalifdir.Çünki o, fəzilətli imam və kamil öndərdir.Allah onun vasitəsi ilə haqqı göstərmiş, zəlaləti dəf etmiş, doğru yolu açıqlamış, bidət əhlinin bidətlərini, qəlblərində əyrilik olanların əyriliyini və şübhə əhlinin şübhəsini puç etmişdir.Allah həmin öndə gedən, möhtərəm, böyük və dərya olan imama rəhmət eləsin. Bir sözlə biz Allahı, Onun mələklərini, kitablarını, peyğəmbərlərini və onların Allah dərgahından gətirdiyini, habelə etibarlı şəxslərin Allahın elçisindən rəvayət etdiklərini iqrar edir və bundan heç bir şeyi rədd etmirik." Daha sonra bir sıra etiqadı məsələləri sadalayıb dedi: "Habelə iman söz və əməldir, artıb azalır.Biz buna dair Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) rəvayət olunan və son

[428] Öncəki mənbə:1/350.

olaraq Peyğəmbərə (salləllahu aleyhi və səlləm) çatan, ədalətli ravinin digər ədalətli ravidən rəvayət etdikləri səhih xəbərləri qəbul edirik."[429]

Habelə demişdir: "Biz deyirik: İslam imandan daha genişdir.Həç də hər bir islam iman deyil."[430]

Onun bu dedikləri Əhli sunnənin məsləkinə müvafiqdir.Onun digər sözünə gəldikdə isə artıq buna dair məlumat Şeyxul-İslamın sözlərində qeyd edilmişdir.Orada deyilir: "Əşari "əl-mucəz" kitabında Salihi və digərlərinin sözünü qeyd edib demişdir: Adlara dair seçdiyim görüş Salihinin sözüdür."[431]

Əşarinin "əl-məqalət" kitabında xəbər verdiyi kimi Salihinin sözü, imanın yalnız Allahı tanıma, küfrün isə yalnız Ondan bilgisiz olmadır.İnsan yalnız Allahı tanımaqla Ona iman gətirmiş olur, habelə yalnız Allah haqqında bilgisiz olmaqla Ona küfr etmiş olur.Habelə: Allah üçlüyün üçüncüsüdür,-sözü küfr deyil.Sadəcə bu söz yalnız kafirdən sadir olur.Çünki Uca Allah bu sözü deyəni təkfir etmiş, müsəlmanlar isə bu sözün yalnız kafirdən sadir olacağına icma etmişlər.Habelə onlar bilginin, Allahı sevmə və Ona boyun əymə olduğunu iddia etmişlər.Onlara görə iman artıb

---

429 əl-İbənə:52,59.

430 Öncəki mənbə:57.

431 Məcmu`əl-fətəva:7/544.Əbul Muin ən-Nəsəfi (hic.508-ci ilində v.e) əs-Salihinin məzhəbini nəql etdikdən sonra demişdir: "Artıq Əşari bəzi kitablarında demişdir: İmana dair seçdiyim görüş əs-Salihinin sahib olduğu görüşdür." (Təbsiratul ədillə:2/799)

azalmır və o, bir xislətdən başqa bir şey deyil.Küfr həmçinin belədir.Bu sözü deyən Əbul Hüseyn əs-Salihidir."[432]

Şeyxul-İslam kitablarının bir çox yerlərində Əşarinin Cəhmin imana dair sözünü müdafiə etdiyini qeyd etmişdir. Bu sözlərdən birində ibn Teymiyyə deyir: "Bu və digər amillər vasitəsilə Cəhm, Salihi və onlara iman məsələsində məşhur görüşlərinin birində tabe olan Əşari, habelə onun əksər əshabı, habelə Məturudi və digərləri kimi Əbu Hanifənin sonraki əshabından bir toplum insanın sözlərinin yararsız olması bəlli olur.Çünki onlar imanın adi təsdiq olduğunu, insanların onda bərabər olduqlarını, onun ya mövcud olacağını yaxud da ki, olmayacağını, onun hissələrə bölünməyəcəyini, habelə məcburiyyətsiz könüllü şəkildə Allahı və Peyğəmbəri söymək və Onlara qarşı küfr sözlər dilə gətirməklə birgə qəlbdə tam imanın mövcudluğunun mümkün olacağını, habelə sahibinin kafir olacağını ifadə edən zahiri sözlərin qəlbdə olan həmin təsdiqin yoxluğunu gərəkli etməsi səbəbilə olacağını, habelə zahirdə edilən saleh əməllərin qəlbdə olan daxili imanın zəruri amili olmayacağını və zahiri əməllər olmadan qəlbdə tam imanın olacağını demişlər.Bu sözlər, bir neçə yöndən yanlışdır..."[433]

Habelə demişdir: "Murciələr üç sinifdir: İman adicə qəlbdə olandır,-sözünü deyənlər.Habelə bunların bir qismi qəlb əməllərini ona daxil edir.Əbul Həsən əl-Əşarinin öz kitabında onlardan gələn sözləri qeyd etdiyi kimi onlar murciə firqələrinin çoxudur. Habelə o, bir çox firqələri qeyd

---

[432] Məqalətul isləmiyyin:1/214.

[433] Məcmu`əl-fətəva:7/582.

etmişdir.Lakin biz onların yığcam sözlərini qeyd etmişik. Onlardan bəzisi isə Cəhm və ona tabe olmuş Salihi və digər insanlar kimi onu (qəlb əməllərini) imana daxil etmirlər. O və onun əksər əshabı məhz bunu müdafiə etmişlər."[434]

İkinci görüş: Bu görüş sahibləri belə deyirlər: O, adicə dil sözüdür. Kərramilərdən öncə bu sözün sahibi bilinməmişdir.

Üçüncü görüş: Qəlb təsdiqi və dil sözü.Məhz bu, onlardan olan fiqh və ibadət əhlindən məşhur bir sözdür."[435]

Habelə Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əbul Həsən əl-Əşari Cəhmin imana dair sözünü müdafiə etmişdir. Bununla bərabər o, imanda istisna edilməsinə dair Əhli sunnənin məşhur sözünü və insanın: İnşallah mən möminəm,-deməsini dəstəkləmişdir.Çünki o, qiblə əhlindən heç kəsin təkfir edilməyəcəyinə, onların əbədi cəhənnəmlik olmayacağına, onlardan şəfaətin qəbul ediləcəyinə və digər məsələlərə dair Əhli sunnənin məzhəbini müdafiə etmişdir.

O daimə hədis əhli ilə digərləri arasında baş verən çəkişməli məsələlərdə hədis əhlinin sözünü müdafiə edir. Lakin o, hədis əhlinin mənbələrini dərindən bilmədiyi səbəbilə təməl qayda olduğunu hesab edərək digərlərindən mənimsədiyi şeyləri müdafiə edirdi.Bunun nəticəsi olaraq, iman məsələsində etdiyi və Cəhmin sözünü müdafiə etməsi ilə birgə istisnaya dair sözü müdafiə etdiyi kimi həm bir tərəfin həm də, digər tərəfin inkar etdiyi ziddiyətə düşürdü.

---

[434] İrəlidə əşarilərin məzhəbinə dair və onlardan olan sonraki alimlərin qəlb əməllərini imana daxil etmələri haqqında açıqlama gələcək.
[435] Məcmu`əl-fətəva:7/195.

Bu səbəbdən onun bir çox əshabı istisna məsələsində ona müxalif olmuş və əshabının çoxu Cəhmin buna dair sözünü müdafiə edərək bu xüsusda məhz ona tabe olmuşlar.

Heç şübhəsiz ki, yalnız kəlam kitablarını oxuyub sələfin və sunnə imamlarının bu mövzuya dair sözlərini bilməyən şəxs onların dediyi sözün Əhli sunnənin sözü olduğunu düşünür.Əslində isə həmin sözü sunnə imamlarından heç kəs deməyib.Üstəlik imam Əhməd bin Hənbəl, Vaki` və digərləri Əbul Həsənin müdafiə etdiyi Cəhmin imana dair sözünü deyən şəxsləri təkfir etmişlər.Bu, onlara görə murciələrin sözündən daha şərlidir."[436]

Habelə demişdir: "Əbu Abdullah əs-Salihi demişdir: "İman adicə qəlb təsdiqi və biliyidir.Lakin onun zəruri amilləri mövcuddur.Həmin amillər yoxa çıxacağı zaman bu, qəlb təsdiqinin olmayacağına dəlalət edəcək.Şəriətin küfr olması barədə bildirdiyi hər bir zahiri söz və əməlin belə olması, qəlb təsdiqinin və biliyinin yoxluğuna göstərici olması səbəbilədir.Lakin küfr yalnız bir xislətdir.İman isə yalnız qəlbdə olan adi təsdiq və bilgidir.

Bu, Əbul Həsən əl-Əşarinin iki məşhur sözündən biridir. Onun Qadı Əbu Bəkr[437] və Əbul Məali[438] kimi əshabı bu görüşdə olmuşlar.

---

[436] Məcmu`əl-fətəva:7/195.

[437] Qadı Əbu Bəkr əl-Bəqilləni (hic.403-cü ilidə v.e).Onun imana dair sözü: "İman Uca Allahı təsdiq etməkdir və o, bilgidir.Təsdiq qəlbdə olur." (təmhidul əvail fi təlxisi-d-dəlail:389-cu səh) Şeyxul-İslam demişdir "7/154": "Qadı Əbu Bəkr kimi imana dair Cəhmin məzhəbini müdafiə edən sonrakılər demişlər."Daha sonra sözlərini qeyd etdi.

Habelə onlar kimi digər insanlar.[439] Bu səbəbdən firqələr barədə yazanlar onları murciələrdən saymışlar.

Onun digər sözü sələf və hədis əhlinə uyğun gəlir: İman söz və əməldir.Bu, onun əshabından bir toplum adamın seçdiyi görüşdür.Bununla bərabər o və onun bir çox əshabı imanda istisna etmək məsələsində hədis əhlinin görüşündə olmuşlar.Onun görüşünə əsasən mütləq iman,"muvafət" amilini ortaya qoyur.Onun görüşünə əsasən (imanda) istisna etmək, kamillik,habelə nöqsan və duruma deyil məhz bu amilə qayıdır."[440]

Dedim: Əşariləri murciələrdən sayanlardan biri də ibn Hazmdır.[441]

---

[438] Abdul-Məlik əl-Cuveyni, Harameyn imamı (hic.478-ci ilində v.e).O, "əl-irşad" da demişdir: "Bizim bəyəndiyimiz görüş, imanın gerçəyinin Uca Allahı təsdiq etmək olmasıdır.Allaha iman gətirən, Onu təsdiq edən şəxsdir.Sonra isə doğru olan, təsdiqin nəfsi kəlam olmasıdır.Lakin o, yalnız elm ilə sabit olur.Artıq biz izah etmişik ki, nəfsi kəlam etiqada uyğun olaraq sabit olur." (əl-İrşad ilə qavatı`l ədillə fi usulil i`tiqad:333-cü səh)

[439] ər-Razi mislində olanlar.Artıq Şeyxul-İslam onun imana dair Cəhmin sözünü dediyini bəyan etmişdir.Şeyxul-İslam demişdir: "İbn əl-Xatıb imana dair Cəhm və əs-Salihinin sözünü dediyi halda onun haqqında (imam Şafiinin məziyyətləri haqqında) təlif yazdığı zaman imam Şafiinin sözləri ona müəmməlı gəlmiş və o, onun sözlərində ziddiyətin olduğunu hesab etmişdir." (məcmu`əl-fətəva:7/511) "mənəqibul iməm əş-Şəfii, ər-Razi:136-cı səh."

ər-Razi "Məhsalu əfkəril mutəqaddimin val mutəəxxirin:567-ci səh" kitabında demişdir: "İmanın (ərəb) dilində əsas mənasının təsdiq olması ixtilafsız məsələdir.Şəriətdə isə, Peyğəmbərin gətirdiyi zəruri olaraq bilinən hər bir şeyi təsdiq etməyi ifadə edir.Bu isə mötəzililərə müxalif görüşdür.Çünki onlar onu itaətlər üçün bir ad etmişlər.Habelə sələfin görüşündən fərqlidir.Çünki onlar demişlər ki, iman, qəlb ilə təsdiq, dil ilə iqrar və əzalar ilə əməl üçün olan addır."

[440] Məcmu`əl-fətəva:7/509.

[441] əl-Fisal:3/227.

Şəhrastani Əşaridən bu sözləri nəql edir: "İman qəlb ilə təsdiqdir.Dil ilə söz və bədən əzaları ilə əməl isə onun şaxələridir.Əgər biri qəlb ilə təsdir edərsə, yəni Uca Allahın təkliyini iqrar edərsə və peyğəmbərləri, onların Allah dərgahından gətirdiyini qəlb ilə təsdiq edərək etiraf edərsə imanı doğru olar.Həmin insan eyni anda öləcəyi halda belə qurtuluşa nail olmuş mömin olacaq və yalnız bu şeylərdən birini inkar etməklə imandan çıxacaq."[442]

## *Sələfə müvafiq gələn əşarilər*:

Əbu Əli əs-Səqafi və Əbul Abbəs əl-Qallənisi kimi bir qism əşarilər iman məsələsində sələfə müvafiq olmuşlar. Şeyxul-İslam demişdir: "Əbul Abbəs əl-Qallənisi, Əbu Əli əs-Səqafi, habelə Qadı Əbu Bəkrin şeyxi və Əbul Həsənin yoldaşı Əbu Abdullah bin Mucahid kimi şəxslər sələfin məzhəbini müdafiə etmişlər.

Habelə ibn Kulləbin özü, Hüseyn bin Fadl əl-Bəcəli və digərləri, Hamməd bin Əbu Süleyman və ona tabe olmuş Əbu Hanifə və digər şəxslər kimi Kufə fəqihlərinin dediyinə uyğun olaraq belə deyirdilər: O, təsdiq və sözdür."[443]

Habelə demişdir: Şəhrastaninin şeyxi Əbul Qasim əl-Ənsari "şərhul irşəd liəbil məali" kitabında əshabının sözlərini qeyd etdikdən sonra demişdir: "Əsər əhli imanın bütün itaətlət, fərzlər və nafilələr olduğu görüşünü seçmiş və bunu Allahın fərz və nafilə olaraq əmr etdiyi şeyləri etmək və haramlıq və ədəb olaraq Allahın qadağan etdikləri

[442] əl-Miləl va-n-nihal:1/88.
[443] Məcmu`əl-fətəva:7/119.

şeyləri tərk etmək kimi ifadə etmişlər.Dedi: Həmçinin qədim əshabımızdan bu görüşü deyənlərdən Əbu Əli əs-Səqafi, Əbul Abbəs əl-Qallənisi olmuşlar.Habelə Əbu Abdullah bin Mucahid bu məzhəbə meyl etmişdir.Dedi: Bu, hicrət diyarının imamı Məlik bin Ənəsin və əksər sələf imamlarının görüşüdür."[444]

İbn Subki demişdir: "Sələfin məzhəbini seçənlərdən, imam Şafii, Malik, Əhməd, Buxari, qədim və sonraki imamlardan bir qism insan, habelə əşarilərdən; şeyx Əbul Abbəs əl-Qallənisi, onlardan olan təhqiqçi alimlərdən Əbu Mansur əl-Bəğdadi, Əbul Qasim əl-Quşeyridir.Həmin şəxslər imanın artıb azaldığını açıq bildirirdilər."[445]

## *Əşarilərin etimad göstərdikləri görüşü*:

Əşarilərin etimad göstərdikləri görüşü deyildiyi zaman əşarilik məzhəbinin təməl qaydalarına və Əşarinin görüşünə yaxud onun qədim əshabının görüşünə diqqət çəkmədən hal-hazırda bir çox universitet və tədris ocaqlarında tədris edilən və onların sonraki alimlərinin kitablarında qeyd edilən görüş qəsd edilir.

Onların etimad göstərdikləri görüş: İman qəlb ilə təsdiqdir. Dil ilə söz isə dünyada əhkamların icra edilməsi

---

[444] Məcmu`əl-fətəva:7/143.Şeyxul-İslam bunu "ət-tis`iniyyə:2/659" kitabında nəql etmiş və ardından demişdir: "Burada məqsəd sələfin və imamların sözlərini və murciələrdən olan cəhmiyyənin şübhəsindən çıxılmaz vəziyyətə düşmələri səbəbilə bunu bildikləri halda sələfə, imamlara və hədis əhlinə imana dair müxalif olmalarına cürət tapmalarını etiraf etməsini qeyd etmək deyil."

[445] Tabəqatu-ş-şafiiyyətil kubra:1/130.

üçün şərtdir. Bədən əməlləri isə imanda kamillik şərtidir. Habelə iman artıb azalır.

Aşağıda onların məzhəbini açıqlayan bəzi məlumatlar nəql edilir:

əl-Cərcəni "əl-məvaqif" kitabında demişdir: "İmanın gerçəyinə dair birinci mətləb: Bil ki, iman ərəb dilində mütləq olaraq təsdiq mənasını daşıyır.Uca Allah Yusufun qardaşları haqqında gələn əhvalatda buyurur: *"Əlbəttə, biz doğru danışsaq da, sən bizə inanan deyilsən"*.Mənası: Sənə danışacağımızı təsdiq edən deyilsən.Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: İman: Allaha, mələklərinə, kitablarına və peyğəmbərlərinə iman gətirməyindir, yəni təsdiq etməyindir. Habelə deyilir: Filankəs filan şeyə inanır, yəni onu təsdiq edir və onu etiraf edir.Şəriətdə isə o, qeyd etdiyimiz əhkamlarla,yəni qeyd edilən təfsilata uyğun savab ilə əlaqəlidir.Bizə görə, yəni şeyx Əbul Həsənin ardıcıllarına görə, habelə Qadı və ustaz kimi əksər imamlara görə, habelə mötəzililərdən Salihi və ibn Ravəndiyə görə, zəruri olaraq Peyğəmbərdən ətraflı gəlməsi bilinən şeyləri ətraflı, yığcam gəlməsi bilinən şeyləri isə yığcam şəkildə təsdiq etməkdir. Bu, şəriətdə varid olan xüsusi təsdiqdir.Habelə deyilmişdir: İman, Allaha yönələn bilgidir.Bu isə, Cəhm bin Safvanin məzhəbidir."[446]

Şeyx İbrahim əl-Ləqqani "cəuharatu-t-təuhid" kitabında demişdir:

İmanın təsdiq olması deyildi

---

[446] Şərhul məvaqif:8/351.Habelə "əl-məvaqif, əl-İci:384" kitabına bax.

Dil ilə söz ixtlaflı edildi

O, əməl tək şərtdir demiş bir qismi

Bəzisi İslamı əməldən etdi

Misal üçün həcc və namazı deyək

Oruc həmçinin zəkatı söyləyək

İmanın artması üstün sayıldı

İtaət artdıqca iman da artdı

İman azalır və əksi deyildi

Bəzisi: İxtilaf yoxdur,-nəql etdi.

Şeyxin oğlu Abdus-Sələm "ithəful murid" adlı şərhində demişdir: "İmana dair gələn açıqlama", yəni əşarilər və matrudilərin cumhuru və digərləri onun şəriətdə "təsdiq" olduğunu vurğulamışlar.O, Peyğəmbərimiz Muhammədin (salləllahu aleyhi və səlləm) gətirdiyi din olması zəruri olaraq bilinən hər bir şeyi təsdiq etməkdir.Yəni, müsəlmanların arasında məşhur olub zərurətlə bilinən elm mislində olan elmə çevrilən şeylərdir.Həmin şeylərin əsası, icad edənin təkliyi, namazların vacibliyi və digər şeylər kimi nəzəri olsada belə adi insanlar həmin şeyləri bilir və araşdırma, habelə əsaslandırmağa ehtiyac duymurlar.Əksər peyğəmbərlərə və mələklərə iman kimi yığcamlığı ilə seçilən məsələlərdə yığcamlıq yetərli olur.Habelə ətraflı bilgini gərəkdirən şeyləri ətraflı bilmək labüddür.Bu isə, bir sıra peyğəmbərlərə və mələklərə, Adəmə, Muhammədə,

Cəbrayıla iman etmək kimi birincidən daha dolğundur. Əgər insan sual zamanı namazın və bu kimi ibadətlərin vacibliyini təsdiq etməzsə kafir olar."[447]

Habelə şeyx şəhadətin dilə gətirilməsinə dair yer alan ixtilafın imkanı olan və qadir şəxsə aid edildiyini bəyan etmişdir.Bunu etməyə aciz olan şəxs isə lal və islama girdikdən dərhal sonra canını tapşıran şəxs mislindədir. Həmin şəxs, xilas olan mömindir.

Daha sonra demişdir: "Əşari, mətrudi və digər təhqiqçilər demişlər: Şəhadəti tələffüz etməyə qadir olan şəxsə onu dilə gətirmək möminlərə aid dünyavi əhkamların icrası üçün şərtdir.Bununla da, həmin əhkamlar öz tətbiqini tapmış olar. Bu, cumhurun anlayışıdır.Bundan irəli gələrək deyiləcək ki, mane olan üzr və boyun qaçırma üzündən olmayacağı təqdirdə əgər biri qəlbi ilə təsdiq edib dil ilə iqrar etməzsə həmin şəxs Allah qatında mömin olacaq.Lakin o, şəriətin qoyduğu dünya əhkamlarında mömin sayılmaz.Ancaq əgər biri dili ilə iqrar edib qəlbi ilə təsdiq etməzsə münafiq mislində olar.Ancaq biz onun daxilinə bələd olduğumuz təqdirdə ona kafir hökmü çıxaracağıq.

İmtina edən şəxs isə həm dünyada həm də, axirətdə kafirdir.Üzürlü isə hər ikisində mömindir.

Habelə deyilmişdir ki, o, imanın səhih olması üçün şərtdir. Bu isə, azlığın anlayışıdır.Dəlillər birinci məzhəbi dəstəkləyir. Uca Allah buyurur: "*Allah onların qəlbinə iman*

[447] İthaful murid, məa haşiyəti ibnil Əmir:89-cu səh.

*salmış".*[448] Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Allahım mənim qəlbimi dinin üzərində sabit elə!".[449][450]

Onların etimad göstərdikləri görüş birincidir.Yəni, dil ilə sözün dünyavi əhkamların icrası üçün şərt olması.Bunu əs-Savi, əl-Beycuri və ibn Əmir bildirmişlər.[451]

Əs-Savi demişdir: "Habelə deyilmişdir ki, imanın səhih olması üçün şərtdir.Etimad göstərilən söz isə birincidir.

Əl-Beycuri şəhadəti dilə gətirməyin səhihlik şərti olduğuna dair görüş haqqında demişdir: Həmin görüş onun yarısı olması haqqında deyilən söz kimi zəif sözdür.Üstün görüş isə onun yalnız dünyavi əhkamların icrası üçün şərt olmasıdır.Əslində isə o, imanın kamillik şərtidir.[452]

*Bildiriş*:

İmtina edən və bu səbəbdən dünya və axirətdə kafir olan şəxs haqqında əşarilərin yuxarıda keçən sözləri, onlara Əbu Talibin təsdiq etməsi səbəbilə mömin olduğunu deməli olduqlarını zorla qəbul etdirən şəxsin yanıldığını göstərir. Beycuri demişdir: "Şəhadətin dilə gətirilməsi tələb olunduğu zaman bunu etməkdən imtina edən şəxsə

---

[448] əl-Mucadilə:22.

[449] İbn Macə:3834.Hədisi Ənəs (r.a) rəvayət etmişdir.Şeyx Albani "səhih ibn Macə" əsərində hədisi səhih saymışdır.

[450] İthaful murid:92-ci səh.

[451] Şərhu-s-Savi aləl cəuharat:132-ci səh.Şərh əl-Beycuri:45-ci səh.Haşiyətu ibnil Əmir alə ithafil murid:92-ci səh. Şərh Ummil bərahin li-Əhməd İsa əl-Ənsari:83-cü səh.

[452] Haşiyətu-l-Beycuri alə mətni-s-sənusiyyəti-s-suğra:57-ci səh.Haşiyətu-ş-Şərqavi alə şərh əl-Hudhudi alə-s-sənusiyyə:136-cı səh.

gəldikdə isə o, qəlbən təslim olarsa belə kafirdir.Bu, ona axirətdə belə fayda verməyəcək."[453]

İmkan və heç bir maneə olmadığı halda şəhadəti dilə gətirməyən şəxsin həm zahirən həm də, daxilən kafir olacağı barədə Əhli sunnənin mövqeyi qeyd edilmişdir. Dil sözü yalnız dünya əhkamlarının icrası üçün şərt deyil həmçinin imanın gerçəyi üçün dayağdır (rükndur).Üstəlik onsuz imanın mövcud olması təsəvvür olunmazdır.İstisna olaraq yalnız lallıq kimi üzr göstərilə bilər və belə olan halda onu (dil ilə sözü) işarə əvəzləyəcək.Qorxu isə onu dilə gətirmək üçün əngəl deyil. Çünki onun gizli dilə gətirilməsi ağır bir iş deyil.

Qısası, insanın qəlbində iman olacağı zaman onun imkan olan yerdə şəhadəti dilə gətirməməsi qeyri-mümkün

---

[453] Şərhu-l-Beycuri aləl cəhuharat "tuhfətul murid:45-ci səh".İrəlidə Əbu Talibin Peyğəmbərin doğru olduğuna boyun əymədən şahidlik etməsinə və kafir olmasına dair əs-Savinin açıqlaması gələcək.Bəzi kəlam əhli və təsavvufçular Əbu Talibin mömin olduğuna dair görüş irəli sürmüş və bu məsələdə çox zəif dəlillərə əsaslanmışlar. Onlar iddia etmişlər ki, Əbu Talibin şəhadəti dilə gətirməkdən boyun qaçırması imtina səbəbilə olmamışdır.Ancaq bu, səhih Buxari və Muslimdə gələn hədislərə ziddir: "...Əbu Talibin son sözləri, onun Abdul-Muttalibin dini üzərə qalması olmuş və o, "lə iləhə illəllah" kəlməsini deməkdən imtina etmişdir.(Buxari:4772.Muslim:24) Habelə Muslim Əbu Hureyradan rəvayət etmişdir "25": Peyğəmbər (salləllahu aleyhi və səlləm) əmisinə: "lə iləhə illəllah" de ki, bunu deməyinə dair qiyamət günü sənə şahid durum,-dediyi zaman əmisi dedi: "Əgər qureyş məni yamanlayıb: Onu bu sözləri deməyə yalnız ümidsizlik sövq etdi,-deməsəydilər səni bu sözləri deməklə sevindirərdim.Uca Allah ardından bu ayələri endirdi: *"Sən sevdiyini doğru yola gətirə bilməzsən, ancaq Allah istədiyini doğru yola gətirir."* "Təfsirçilər icma etmişlər ki, *"Sən sevdiyini doğru yola gətirə bilməzsən, ancaq Allah istədiyini doğru yola gətirir."* ayəsi Əbu Talib haqqında enmişdir.Onların buna dair icmasını əz-Zəccəc və digərləri nəql etmişlər." (şərh Muslim:1/215).Onun bu məqamda doğru yoldan məhrum olub bu hal üzərə olməsi bilindiyi zaman onun xilas olduğunu demək nə dərəcədə doğrudur!?

olacaq.Bu məsələyə dair Cəhm və ona uyan şəxslərin sözləri isə heç bir dəyər daşımır.”

*Onlara görə bədən əməlləri imanın kamilliyi üçün şərtdir.*

“İthaful murid” kitabında demişdir: Onun “əməl kimi” sözü: Şərtliliyin mütləqinə dair bənzətmədir.Bunun mənası: Əhli sunnənin saleh əməllərə dair seçdiyi görüş, onun iman üçün kamillik şərti olmasıdır.Halal saymadan, inadkarlıq etmədən və onun doğru olduğuna şübhə etmədən onu yaxud onun bir qismini tərk edən şəxs kamilliyi əldən vermiş mömindir.Boyun əyərək onu edən şəxs isə ən kamil xislətlərə nail olmuşdur.”[454]

Əs-Savi demişdir: “Əhli sunnənin seçdiyi görüş, saleh əməllərin iman üçün kamillik şərti olmasıdır.”[455]

---

[454] İthaful murid:92.Habelə şərh əl-Beycuri:45,49,51-ci səh.bax.

Demişdir: “Əhli sunnənin seçdiyi görüş...yəni əşarilərin.Şübhə yoxdur ki, onların: Əməl kamillik şərtidir,-demələri əhli sunnəyə müxalif olduqları məsələlərdən biridir.Çünki əməl imanın dayağı və bir hissəsidir və iman onsuz səhih olmur.Buna dair üçüncü bölümdə ətraflı açıqlama gələcək.

[455] Şərhu-s-Savi aləl cəuharat:132-ci səh.Dördüncü bölümün ikinci fəslində əməlin iman üçün kamillik şərti olduğuna dair əşarilərdən digər nəqllər gələcək.Bu, beşinci və altıncı əqli şübhəyə cavab əsnasında qeyd ediləcək.

# İkinci araşdırma:

## Onların imanın artıb azalmasına dair sözləri

Onların üstün saydıqları görüş imanda artma və azalmanı isbat etməkdir.

Əs-Savi demişdir: "Qeyd edilmişdir ki, bədən əməlləri imanın kamilliyindəndir.Bu üzdən, əgər biri qəlbi ilə təsdiq edər, habelə dili ilə tələffüz edər lakin bədən əzaları ilə əməl etməzsə naqis imanlı mömin olar.Onun imanın kamilliyi ilə bağlılığı səbəbilə "əl-cəuhərat" kitabının müəllifi onun əməl ilə artması və azalması haqqında söz açıb demişdir: "Üstün sayılmışdır v.s.". Bu tərcih, əşari və matrudilərin cumhurunun, habelə Malik, Şafii və Əhmədin üstün saydığı görüşdür.Onların bu məsələdə dəlilləri, ağıl və varid olan xəbərlərdir.Birinci ağıldır: Çünki belə olmayacağı təqdirdə, günah və çirkin işlərə baş vurmuş şəxslərdə olan imanın peyğəmbərlər və mələklərin imanı ilə eyni olması zərurəti yaranacaq.Buna dair varid olan xəbərlər isə: Uca Allah buyurur: ***"Onun ayələri** onlara oxunduqda imanları **artar"***.[456]İbn Ömər (r.a) demişdir: Ey Allahın elçisi! İman artıb azalırmı? O, dedi: Bəli, sahibini cənnətə salacaq qədər artır və onu cəhənnəmə salacaq qədər azalır."[457] Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Əgər Əbu Bəkrin imanı bu ümmətin imanı ilə tərəziyə qoyulsaydı

---

[456] əl-Ənfəl:2.

[457] Bu rəvayətə rast gəlmədim.

onun imanı üstün gələrdi."[458] Habelə Ömər Əbu Bəkr haqqında demişdir: "Kaş ki, ömrüm boyu olan əməlim Əbu Bəkrin bir gün və bir gecəsi mislində olardı.Mən isə yalnız onun yaxşı işlərindən biriyəm."[459]Ömər (r.a) burada bir gün və bir gecə ilə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) vəfat etdiyi günü və mağara gecəsini qəsd edir.Belə ki, Əbu Bəkr (r.a) Peyğəmbərin (salləllahu aleyhi və səlləm) mağaradaki yoldaşı olmuş və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) öldüyü gündə çaşqınlığa düşmüş insanları sabit edən şəxs olmuşdur.

Həmçinin insan çoxlu ibadət və zikr edib Allaha üz tutduğu zaman daxilində itaətdən kənar vaxtlarda duymadığı rahatlıq və nurun hasil olduğunu hiss edir."[460]

"İthaful murid" kitabında demişdir: "İmanın artması üstün sayılmışdır".Yəni, bir toplum alimlər imanın artması və artmanın imana daxil olmasını üstün saymışlar. "İnsanın itaətinin artması ilə", yəni itaətin artması səbəbilə olur.Bu, ona əmr ediləni etməsi və qadağalardan çəkinməsi ilə olur. "Onun azalması", yəni iman, xüsusi məqam şərti ilə deyil

---

[458] "əl-Məqasıd əl-hasənə:555-ci səh" kitabında bu rəvayəti İshaq bin Rahuyəyə aid etmişdir.Habelə əl-Beyhaqi "əş-şuab" da Ömərdən səhih isnadla nəql etmişdir.Habelə "əl-fəvaidul məcmua:335-ci səh" kitabında demişdir: "Rəvayətin isnadı məuquf olaraq Ömərə səhih, mərfu` olaraq zəifdir."

[459] «əl-Mustədrək, əl-Hakim:3/6_4268-ci rəqəm"."əd-dələil, əl-Beyhaqi". Muhamməd bin Sirin rəvayət edib demişdir: Ömərin dönəmində bir sıra insanların sanki Öməri Əbu Bəkrdən üstün tutmaları qeyd edilmişdir.Bu xəbər Ömərə çatdığı zaman o, demişdir: And olsun Allaha ki, Əbu Bəkrin bir gecəsi Ömərin ailəsindən daha xeyirlidir.Əbu Bəkrin bir günü Ömərin ailəsindən xeyirlidir.Hakim dedi: "Əgər hədisdə "irsəl" olmasa idi bu hədis, Buxari və Muslimin şərtlərinə əsasən səhih isnadlı olardı.Onlar isə onu təxric etməmişlər." əz-Zəhəbi "ət-təlxis"də demişdir: "Səhih, mürsəl rəvayətdir." (əl-bidəyə va-n-nihəyə:3/180.Kənzul umməl:12/733).

[460] Şərhu-s-Savi:134-136-cı səh.

mahiyyət etibarı ilə belə olur.Peyğəmbərlər və mələklər bura daxil deyil. Çünki icma ilə[461]onların imanı itaətin azalması ilə azala bilməz və bu caiz deyil.Bu, cumhur əşarilərin məzhəbidir..."Habelə deyilmişdir", yəni bir toplum alim və onların ən böyüyü imam Əbu Hanifə, onun əshabı və bir çox kəlam əhli demişlər: İman artıb azalmır.Çünki o, əminlik və təslimçilik həddinə çatmış təsdiqə verilən addır.Bu şeydə isə qeyd edilənin olması təsəvvür edilməzdir."[462]

Ər-Razi ixtilafın ləfzi ixtilaf olduğunu iddia edib demişdir: Əgər biz: O, təsdiqdir,-desək belə olan halda o, artma və azalmanı qəbul etməyəcək. Əgər biz: O, əməllərdir,-desək belə olan halda o, artma və azalmanı qəbul edəcək.[463]

Əşarilərə görə üstün görüş onun həqiqi ixtilaf olması və təsdiqin özlüyündə artıb azalmasıdır.

"Məvaqif" kitabının şərhində demişdir: "Doğru olan, təsdiqin artma və azalmanı qəbul etməsidir."[464]

"İthaful murid" kitabında demişdir: "Çünki ən səhih görüş, gözdən keçirmənin çoxluğu, dəlillərin aydın olması, habelə bunun olmaması səbəbilə qəlb təsdiqinin artıb azalmasıdır. Məhz buna görə siddiqlərin imanı şübhələrdən salamat qalması etibarlı ilə digərlərin imanından daha güclü olur.Buna güc qatan amil, hər bir insanın qəlbində olanın

---

461 Onun "icma ilə" sözlərinə dair ibnul Əmirin haşiyəsində bəyan etdiyi kimi "əl-imənul ənbiyə val mələikə"yə müraciət et.

462 İthaful murid:99-102-ci səh.

463 Məhsalul əfkəril mutəqaddimin val mutəaxxirin:571-ci səh.

464 Şərhul məvaqif:8/360.

fərqli olduğunu və bəzi hallarda digər vaxtlardan daha böyük yəqinliyə və ixlasa malik olduğunu bilməsidir.Təsdiq və bilik həmçinin dəlillərin aşkar olması və çoxluğu nisbəti ilə belə olur."[465]

Bu, sonraki əşarilərin məsləkidir.Onların məzhəbi məhz bu görüşə əsaslanmışdır.Həmçinin imanın artıb azalması görüşünü seçən qədim əşari alimlərindən, Təcuddin əs-Subkinin "ət-tabəqat" kitabında qeyd etdiyi kimi Beyhaqi, Əbu Mənsur Abdul-Qahir əl-Bağdədi, Əbul Qasim əl-Quşeyri, Əmidi daha sonra Nəvəvi, Safiyuddin əl-Hindi və Təqiyuddin əs-Subki kimi şəxslər olmuşlar.[466]

---

465 İthaful murid:105.Habelə şərhu-l-Beycuri aləl cəuharat:51-ci səh.Şərhu-s-Savi:138-ci səh.

466 Tabəqatu-ş-şəfiiyyətil kubra:1/130-133.Habelə "əl-İ`tiqad, əl-Beyhaqi:191-ci səh".Şərhu-n-Nəvəvi alə Muslim:1/148".

# Üçüncü araşdırma:

## Onların imanda istisna etməyə dair sözləri

Əşarilər imanda istisna etmək məsələsində ixtilaf etmişlər. Onlardan bir qismi "muvafət" olması etibarı ilə (insanın onun üzərə öləcəyi halı etibarı ilə) onu caiz görmüşdir.Bununla da onlar imanın, insanın onun üzərə öləcəyi və Rəbbinin hüzuruna onunla çıxacağı bir şey olduğunu qəsd etmişlər.Bunun insana məlum olmaması səbəbilə onda istisna edilir.

Əl-Bağdədi (rahiməhullah) demişdir: "Hədis əhlindən imanın təsdiq olduğunu deyənlər onda edilən istisnaya dair fikirayrılığına düşmüşlər.Onlardan bir qismi istisnanı qəbul edirlər. Bu, şeyximiz Əbu Səhl bin Süleyman əs-Suluki və Əbu Bəkr Muhamməd bin Hüseyn bin Fəurakin seçdikləri görüşdür. Onlardan bir qismi isə onu inkar edirlər.Bu isə əsrimizin bir sıra şeyxlərinin seçdiyi görüşdür.Onlardan: Əbu Abdullah bin Mucahid, Qadı Əbu Bəkr Muhamməd bin Tayyib əl-Əşari, Əbu İshaq İbrahim bin Muhamməd əl-İsfərayinidir.Bütün itaətlərin imandan olmasını deyən hədis əhlinin hamısı onu "muvafət"etibarı ilə demişlər.[467]Habelə demişdir: Rəbbi ilə imana sahib olaraq qarşılaşacaq hər bir şəxs mömindir.Rəbbi ilə sadəcə dünyada aşkar etdiyi imana sahib olmadan qarşılaşacaq şəxsin sonucda heç vaxtı mömin olmaması bilinəcək.Bunlardan biri deyir: İmanımın doğru

[467] Sələfdən heç bir kimsə "əl-muvafət" anlamına dair söz söyləməmişlər.

onun əksinin isə batil olduğunu bilirəm.Əgər mən Rəbbim ilə bu hal üzərə qarşılaşsam həqiqi mömin olaram.Bununla da o, sahib olduğu imanın səhih olmasında deyil özünün mömin olacağı etibarı ilə istisna edir."[468]

Əl-Cuveyni (rahiməhullah) imanın artıb azalmadığını qeyd etdikdən sonra demişdir: "Əgər deyilərsə ki, sizin sələfinizdən imanın məşiətlə bağlı olması və onlardan birinə imanı haqqında sual verildiyi zaman onun: İnşallah mömінəm,- deməsi gəlmişdir.Belə olan halda buradan hansı nəticə çıxır?

Biz deyəcəyik: Heç şübhəsiz ki, iman həmin anda qəti olaraq sabit olmuşdur.Lakin insanın qurtuluş əlaməti və xilas nişanəsi olan iman "muvafət" imanıdır. Bu üzdən sələf ona diqqət ayırmış və onu məşiətlə bağlı etmişlər.Bununla onlar gerçək imanı şübhə altına salmağı qəsd etməmişlər."[469]

Əşarilərin "muvafət" məsələsinə dair dedikləri sözlərdən Qurtubinin növbəti sözlərini qeyd etmək olar: "Alimlərimiz-Allah onlara rəhmət eləsin-demişlər: Mömin iki növ olur: Allahın sevdiyi və Özünə dost bildiyi mömin və Allahın sevmədiyi, Özünə dost tutmadığı, üstəlik ondan xoşlanmadığı və ona ədavət bəslədiyi mömin.Allahın son olaraq iman üzərində öləcəyini bildiyi hər bir şəxs Allah tərəfindən sevilir və Allah onu Özünə dost tutur və ondan razı qalır.Allahın son olaraq küfr üzərində öləcəyini bildiyi hər bir şəxs Allahın bəyənmədiyi, ona qəzəbləndiyi və ona ədavət bəslədiyi şəxsdir.Bu, onun imanından ötrü deyil

---

[468] Usulu-d-din:253-cü səh.

[469] "əl-İrşəd, əl-Cuveyni:336-cı səh".

sadəcə sonucda düşəcəyi küfrü və zəlaləti səbəbilədir.Kafir həmçinin iki növdür: Mütləq cəzasını görəcək kafir və cəza almayacaq kafir.Cəzasına çatacaq kafir küfr üzərində ölən şəxsdir.Uca Allah belə şəxsə qəzəblənir və ona ədavət bəsləyir.Cəzasını almayacaq şəxs isə iman üzərində öləndir. Uca Allah belə şəxsə qəzəblənmir və ona büğz etmir, əksinə Uca Allah onu sevir və onu Özünə dost bilir.Bu, onun küfründən ötrü deyil sadəcə sonucda sahib olacaq imanı səbəbilədir.İnsanın aşağıdaki sözləri ümumiləşdirib belə deməsi caiz deyil:

Beşinci: Mömin savab, kafir isə cəza almağa layiqdir. Bunu yalnız "muvafət" anlamı ilə bağlamaq gərəkdir. Bundan ötrü deyəcəyik: Ömər (r.a) bütlərə ibadət etdiyi vaxtlarda Uca Allah ondan razı olmuş və ona savab vermək və onu cənnətə daxil etmək istəmişdir.Ancaq bu, onun bütlərə ibadət etməsi səbəbilə deyil və yalnız sonucda iman üzərə öləcəyi səbəbilə olmuşdur.Habelə iblis Allaha ibadət edərkən Uca Allah ona qəzəbli olmuşdur.Bu isə sonucda onun kafir olacağı səbəbilə idi.

Qədərilər bu məsələdə müxalif olub demişlər: "İblis Allaha ibadət etdiyi zaman Uca Allah ona qəzəbli olmamış, habelə Ömər bütlərə ibadət etdiyi zaman Allah ondan razı olmamışdır. Bu, yaramaz görüşdür.Çünki Uca Allah, Allahın lənətinə gəlmiş iblisin sonucda hansı aqibətlə üzləşəcəyini və Ömərin sonucda hansı aqibətlə üzləşəcəyini bilirdi.

Bununla da, Allahın iblisə (Allah ona lənət eləsin) olan qəzəbi Ömərdən (r.a) isə razılığı sabit olmuşdur.”[470]

Şeyxul-İslam “muvafət” məsələsinə dair sözü, Əşari və ibn Fəurakə nisbət etmiş və “əl-imənul kəbir” kitabında buna dair geniş danışmışdır.Şeyxin buna dair dediyi bəzi sözləri: “İstisnanı vacib görənlərin iki yanaşması vardır: Birinci: İman, insanın onun üzərə öləcəyi anlamdır.İnsanın Allah qatında mömin və kafir olması sonucda hasil olacaq aqibət və Allahın əzəli elmində onun üzləşəcəyi halı etibarlı ilə olur.Bundan öncə olanların isə heç bir dəyəri yoxdur.Onlar demişlər: Son olaraq küfr ilə bitən və sahibinin kafir olaraq öləcəyi iman ümumiyyətlə iman deyil.Buna misal, tamamlanmadan sahibi tərəfindən pozulan namaz, günəş batandan öncə sahibi tərəfindən pozulan oruc və.s.Uca Allah həmin şəxsin hansı hal üzərə öləcəyini bildiyi üçün o, Allah qatında kafirdir.Onlar küfr barədə də belə demişlər.Bu görüş, sunnə və hədis əhlindən məşhur olan: İnşallah mən möminəm,-sözünü müdafiə etmək istəyən və eyni zamanda imanın fərqlilik qəbul etmədiyini isbat etmək istəyən kulləbilər və digərlərindən olan bir çox sonrakilərin yanaşmasıdır.Onlar deyirlər ki, insan onda mövcud olan barəsində deyil sadəcə gələcəkdə olacaq barədə şübhə edir. Buna əlavə olaraq onlar demişlər: Allahın sevgisi, rizası, qəzəbi, büğz etməsi qədimdir.Sonra bu qeyd edilənlər, istəkdir yoxsa digər sifətlərdir? Onların buna dair iki görüşü vardır...

[470] Təfsiru-l-Qurtubi:1/239.

Onlar demişlər: "Uca Allah bir şəxsin mömin olaraq öləcəyini bildiyi zaman onu, kafir olarkən belə əzəldən sevir.Səhabələrdən bəzisi uzun müddət bütlərə ibadət etsələr belə Allah onları daimə sevmişdir. İblis kafir olmamışdan öncədə belə Allah onu sevmirdi.Bu, onlara aid olan iki görüşdən biridir. Razılıq və qəzəb istəyə qayıdan amillərdir.İstək isə elmə uyğun gəlir.Buradan çıxan məna isə: Uca Allah əzəldən bunları sahib olacaqları imandan sonra mükafatlandırmağı, iblisi isə sahib olacağı küfrdən sonra cəzalandırmağı istəyirdi.Bu, səhih mənadır.Çünki Uca Allah yaradacağını bildiyi hər bir şeyi yaratmaq istəyir.Onu digər sifətlər olaraq isbat edənlər isə deyirlər: "Onun sevgisi həmçinin bir şəxsi mükafatlandırmaq istəyinə tabedir.O, mükafatlandırmaq istədiyi hər bir şəxsi sevir.Habelə O, əzab vermək istədiyi hər bir şəxsə büğz edir.Bu isə elmdən irəli gəlir. Bunlara görə Uca Allah hər hansı bir şəxsə qəzəbli olduqdan sonra ondan razı qalmır.Habelə qul, Ona tövbə etdikdən sonra Allah onun tövbəsinə sevinmir.Çünki O, əzəldən onun tövbəsinə sevinir. Onlara görə sevinc sifəti ya istək, ya da ki razılıq mənasındadır.Bunun mənası: Uca Allah əzəldən onu mükafatlandırmaq istəyir yaxud da ki, mükafatlandırmaq istədiyi şeydən razı qalır.Həmçinin onlara görə Allah öncə qəzəblənmədiyi halda qiyamət günü qəzəblənmir.Çünki Onun qəzəbi qədimdir.Bu isə onlara görə ya istək mənasını yaxud da ki, digər mənanı daşıyır.

Bunlar deyirlər: "Bir şəxsin kafir olaraq öləcəyi bilindiyi zaman, bəlli olur ki, Allah daimə onu əzaba düçar etmək istəyirmiş.Onda olmuş həmin iman isə batil və faydasızdır.

Üstəlik onun varlığı yoxluğu kimidir.Həmin şəxs ümumiyyətlə mömin deyil.Habelə bir şəxsin mömin olaraq öləcəyi bilindiyi zaman, bəlli olur ki, Allah daimə onu mükafatlandırmaq istəyirmiş.Onun etdiyi küfrün varlığı isə yoxluğu kimidir və onlara görə həmin şəxs ümumiyyətlə kafir olmamışdır.

Bunlar bu yanaşmaya istinad edərək imanda istisna edirlər. Həmçinin Əbu Mənsur əl-Məturudi kimi onların bəzi təhqiqçiləri küfrdə istisna edirlər.Onların qeyd etdikləri, həmin iki məsələdə ümumi qaydadır.Lakin imamlarının çoxu küfrdə istisna etməyi doğru hesab etmirlər. Onda istisna etmək heç bir sələfdən bilinməyən bidətdir. Lakin o, onlar üçün zəruri amildir...".

Nəhayət demişdir: "Bu sözü ibn Kullabin əshabından olan bir çox kəlam əhli demişlər.İmamların bir çox ardıcılları isə bu məsələdə onlara müvafiq olmuşlar.Lakin bu, sələfdən heç kimin demədiyi sözdür.Bunu nə dörd imam nə də ki, digərləri deməmişlər.Habelə imanda istisna edən sələfdən heç kəs, nə imam Əhməd nə də ki, ondan öncəkilər bu kimi əsaslar gətirməmişlər."[471]

Habelə demişdir: "Kəlam əhlindən bir çoxu müdafiə etdikləri şeylərin çoxunda İslam dininin həmin məsələyə dair gerçəyindən, habelə varid olan sunnədən və sələfin yolundan xəbərsiz olurlar.Həmin şəxslər onların üzdə olan sözlərini götürür və onların gerçək anlamını tərk edib bidət əhlindən mənimsədikləri digər anlamdan yapışırlar.Bunun

[471] Məcmu`əl-fətəva:7/429-432.

nəticəsi olaraq onların sözlərində ziddiyət, anlaşılmazlıq və yanlışlıq üzə çıxır.Sələf isə bu cür sözləri və onu deyənləri qəti olaraq pisləmişlər.Sələfin bu kimi sözləri pisləməsinə dair sözləri çoxdur.Pislənən sözlər Quran və sunnəyə müxalif gələndir.Quran və sunnəyə müxalif gələn hər bir şey batil və yalan, habelə şəriətə və ağıla ziddir. *“Rəbbinin sözü düzgün və ədalətli şəkildə tamam oldu”*.[472]

Bunlar Əhli sunnənin imanda istisna etdiyini gördüyü, habelə imanın yalnız insanın onun üzərə öləcəyi və Rəbbi ilə onun üzərə qarşılaşacağı bir şey olduğunu hesab etdiyi zaman düşünmüşlər ki, sələfə görə iman məhz budur. Nəticədə onlar həmin şeyi sələfdən xəbər verməyə başlamışlar. Əslində isə sələfdən heç kəs bu sözü söyləməmişdir.Lakin bunlar öz sözlərinin yalnız bu əsasa sığdığını gördükləri zaman öz düşüncələrinə uyğun olaraq bunu onlardan xəbər vermişlər.Onlar Cəhmin imana dair qoyduğu əsası müdafiə edib bunun hədis əhlindən olan təhqiqçi və araşdırıcıların görüşü olduğunu iddia etmişlər.”[473]

Şeyxul-İslam “əl-irşəd” kitabının şərhçisi Əbul Qasim əl-Ənsaridən nəql edir ki, Əbu İshaq əl-İsfərayini Əbul Həsən əl-Əşarinin və onun əshabının sözünü qeyd edib onun (imanın) qəlb təsdiqi olduğunu dorğu hesab etdikdən sonra demişdir: “Əshabımızdan bəzisi “muvafət” görüşünü demiş və gerçək imanın şərti olaraq insanın ona sahib olaraq Rəbbi ilə qarşılaşacağını və onun üzərə öləcəyini göstərmiş-

---

[472] əl-Ənam:115.

[473] Məcmu`əl-fətəva:7/435.

lər.Onlardan bir qismi isə onun hazırki anda iman üçün şərt olmadığını seçmişlər."

Daha sonra demişdir (yəni, əl-Ənsari): Təhqiqçilərin seçdiyi görüş isə, imanın təsdiq olmasıdır.Artıq biz "muvafət" etiqadına və onun imanın səhihliyi üçün şərt olmasına, habelə onun hazırki anda imanın gerçəyi olmasına və Allah qatında məhz həmin an dəyərli olmasına, habelə onun hökmünə dair onların fikirayrılığını qeyd etmişik. Onun iman üçün şərt olduğunu deyənlər, onun hazırki ana aid edilməsini istisna edirlər.Onlar tövhid və biliyin gerçəyinə dair şübhə etmir və yalnız belə deyirlər: "Biz, hal-hazırda sahib olduğumuz imanın Allah qatında dəyərli olub olmadığını bilmirik.Yəni, biz sonucda onun faydasını və bəhrəsini görəcəyimizi bilmirik."[474]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Muvafət" etiqadına gəldikdə isə sələfdən hər hansı birinin istisnaya dair bunu əsas gətirdiyini bilmirəm.Bununla belə, sonrakilərin bir çoxu bu məsələdə Əbul Həsən əl-Əşari və onun əksər əshabı və tədqiqçilərə istinad etdikləri kimi həmçinin Əhməd, Malik, Şafii və digər imamların əshabından olan hədis əhlinə istinad edirlər.Lakin bu, hədis əhli sələfin görüşü deyil."[475]

Habelə demişdir: "Bunlar deyirlər ki, Allahın sevməsi, büğz etməsi, rizası, qəzəbi, Onun dostluq və ədavəti yalnız "muvafət" anlamı ilə əlaqədardır.Allah, mömin olaraq öləcəyini bildiyi şəxsi sevir, ondan razı qalır, onu qədim

[474] Öncəki mənbə:7/437.

[475] Məcmu`əl-fətəva:7/439.

sevgisi ilə və qədim dostluğu ilə Özünə dost tutur.Habelə deyirlər: Ömər kafir olarkən belə Allahın dostu olmuşdur. Bu, ibn Kulləb və ona tabe olmuş Əşari və digərlərinin məşhur görüşüdür.

Firqələrin çoxu bu məsələdə onlara müxalifdirlər.Onlar deyirlər ki, insanın Allahın düşməni olub daha sonra Allahın dostuna çevrilməsi mümkündür.Habelə Allahın bir şəxsə büğz edib daha sonra onu sevməsi mümkündür.Bu, fəqihlərin və əksər müsəlmanların görüşüdür.Habelə bu, bütün mötəzilə, kərramiyyə, hənəfilərin və qədim maliki, şafii və hənbəlilərin görüşüdür.

Qurani Kərim məhz buna dəlalət edir.Uca Allah buyurur: *"De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin"*.[476] Habelə: *"Əgər şükür etsəniz, buna görə sizdən razı qalar"*.[477] Habelə buyurur: *"Şübhəsiz ki, iman gətirib sonra kafir olan, yenə iman gətirib sonra kafir olan"*.[478]Uca Allah onları imandan sonra küfr ilə, habelə küfrdən sonra iman ilə vəsf etmiş və küfr içində olanların kafir olduqlarını və bundan əl çəkəcəkləri təqdirdə öncə etdiklərinin bağışlanacağını xəbər vermişdir.Uca Allah demişdir:*"Onlar Bizi qəzəbləndirdikdə onlardan intiqam aldıq"*.[479] Habelə buyurur: *"Bu ona görədir ki, onlar Allahın qəzəbinə səbəb olan şeyə uydular və Onun razı qaldığı şeyə nifrət etdilər. Buna görə də (Allah) onların əməllərini boşa*

---

[476] Ali İmran:31.
[477] əz-Zumər:7.
[478] ən-Nisa:137.
[479] əz-Zuxruf:55.

*çıxartdı."*[480] Buxari və Muslimin səhih əsərlərində varid olan şəfaət hədisində peyğəmbərlər deyirlər: "Həqiqətən də, Rəbbim öncə heç vaxtı qəzəblənmədiyi və sonralar heç vaxtı qəzəblənməyəcəyi kimi qəzəblənmişdir."[481][482]

İbn Hazm (rahiməhullah) demişdir: "Onların: Uca Allah razı qaldığına qəzəblənməz, habelə qəzəbləndiyinə razı qalmaz,- demələri batil və yalandır. Üstəlik Uca Allah yəhudilərə şənbə gününə və piylərin haramlığına riayət etməyi əmr etmiş, bunu onlar üçün bəyənmiş və onların buna zidd hərəkət etmələrinə qəzəbini bildirmişdir.Habelə Uca Allah İslamın qısa bir dönəmində bizə şərabı icazəli etmiş və bizim üzərimizə namaz qılıb oruc tutmaq öhdəliyini buraxmamışdır.Habelə Allah bizə şərab içməyi, Ramazanın günortası qida qəbul etməyi və namaz qılmamağı bəyənmiş və heç şübhəsiz ki, vaxtından öncə bunun haram edilməsinə qəzəblənmişdir. Uca Allah buyurmuşdur: *"Onun (ayələrinin) vəhyi sənə tamamlanmayınca Quranı oxumağa tələsmə".*[483] Daha sonra O, bizə namazı və orucu fərz edib şərabı bizə haram etmişdir.Habelə O, bizim namazı tərk etməyimizə, Ramazanın günortası qida qəbul etməyimizə və şərab içməyimizə qəzəblənib bizə bunun tam əksini bəyənmişdir.Bunu heç bir müsəlman danmır. Uca Allah bizə müəyyən zaman kəsiyində halal edəcəyi şeyi halal edəcəyini, ondan razı qalacağını daha sonra onu haram edib ondan xoşlanmayacağını, habelə bir müddətdən sonra haram edib ondan

---

480 Muhamməd:28.
481 Buxari:4712.Muslim:194.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.
482 Məcmu`əl-fətəva:16/582.Habelə:11/62.
483 Ta-hə:114.

xoşlanmadığı şeyi haram edəcəyini, daha sonra onu halal edib ondan razı qalacağını əzəldən bilir.Uca Allah müəyyən zaman kəsiyində həyat verdiyinə can verəcəyini, habelə müəyyən zaman kəsiyində izzət verdiyinə izzət verəcəyini daha sonra onu alçaldacağını əzəldən bilir.Habelə aləmdə olan hər bir şey onun yaradıcılığının izləridir.Bu, ən aşağı duyğuya sahib olan şəxsə gizli deyil.Həmçinin bəzən mömin mürtəd kimi ölür, bəzən də, kafir müsəlman kimi ölür.Uca Allah kafirin, küfr dönəmində olan əməlinə qəzəblənəcəyini daha sonra həmin şəxs İslamı qəbul edəcəyi zaman Allahın ondan razı qalacağını əzəldən bilir.Habelə Uca Allah müsəlmanın əməllərindən və gözəl əməllərdən razı qalacağını daha sonra həmin şəxs mürtəd olub fasiqə çevriləcəyi zaman onun əməllərinə qəzəblənəcəyini əzəldən bilir.Həmçinin Qurani Kərim buna şahidlik edir.Uca Allah buyurur: *"O, qullarının kafirlik etməsinə razı olmaz. Əgər şükür etsəniz, buna görə sizdən razı qalar."*[484] Bununla da, tam aydın olur ki, həmin əhvalların bir insanda baş verməsinin necəliyindən asılı olmayaraq Uca Allah Ona şükür edənin edəcəyi şükürünü bəyənir və küfr edənin küfrünü, küfr edəcəyi zaman, kafir olacağı vaxtda bəyənmir."[485]

Bununla da, sələfin son aqibət və hal dəyişkənliyindən qorxmalarından ötrü istisna etmələri ilə[486] əşarilərin məzhəbi olan "muvafət" haqqında bəhs edən söz arasında fərq üzə

---

[484] əz-Zumər:7.

[485] əl-Fisal, ibn Hazm:4/48.Burada həmin məsələyə dair əşarilərə güclü cavab vardır.

[486] Bu, Əhli sunnənin istisnaya dair yanaşmalarından biridir.Artıq yuxarıda bu qeyd edilmişdir.

çıxır. Qeyd edildiyi kimi onlar "muvafət" dedikləri zaman imanın, qulun öləcəyi zaman sahib olacağı bir şey olduğunu qəsd edirlər.Habelə onlara görə insanın Allah qatında mömin yaxud kafir olması "muvafət" etibarı ilə və Allahın onlar haqqında əzəli elmi etibarı ilə olur.Bundan öncə olanların isə heç bir dəyəri yoxdur.Habelə onlar iddia edirlər ki, Allahın sevgisi, Onun büğz etməsi, rizası, qəzəbi, dostluğu və ədavəti yalnız "muvafət" ilə əlaqəlidir.

Şeyxul-İslamın açıqladığı kimi məsələnin sirri, əşarilərin, insanın ixtiyarına bağlı əməlləri inkar edib iradə mənasını kəsb edən qədim razılıq və sevgini isbat etmələridir.Onlara görə Allah bir şəxsə qəzəbləndikdən sonra heç vaxtı ondan razı qalmır, habelə qul tövbə edəndən sonra onun tövbəsinə sevinmir.Lakin Əhli sunnə nassların dəlalət etdiyi kimi Allahın istədiyini istədiyi zaman sevdiyini, istədiyindən istədiyi zaman razı qaldığını, istədiyinə istədiyi vaxt qəzəbləndiyini isbat edirlər.Onun sevgisi, rizası və qəzəbi Onun məşiəti ilə əlaqəli olan sifətlərdir.

Bir sözlə imanın "muvafət" olması, yəni insanın Rəbbi ilə qarşılaşacağı zaman sahib olacağı iman olması və istisnanın bu əsas üzərə qurulması haqqında bəhs edən söz heç bir dəlilə dayanmayan ixtira edilmiş bidət sözdür.Artıq sələfin istisnaya dair sözlərində əsas tutduqları yanaşmalar qeyd edilmişdir.

# Dördüncü araşdırma:

## Əşarilərin təsdiqi ilə Cəhmin bilgisi arasında olan fərq

Artıq qeyd edilmişdir ki, Şeyxul-İslam imanın bilgi yaxud təsdiq olması sözünü Cəhm adlı şəxsə nisbət etmiş və qeyd etmişdir ki, qəlb bilgisi ilə boyun əymədən kənar olan adi təsdiq arasında olan fərq çox incə məqamdır və ağıl sahiblərinin çoxu onu inkar edirlər.

Həmçinin Şeyxul-İslam Əşarinin, görüşlərin birində, habelə Bəqilləni, Cuveyni və Razinin adını çəkərək onun əshabının çoxunun Cəhmin imana dair sözünü müdafiə etdiklərini vurğulamışdır.

Lakin bu sözün sonraki əşarilərə nisbəti doğrudurmu? Həmçinin onlar qəlb əməllərindən kənar adicə təsdiqi isbat edirlərmi?

Doğrusu onların sonraki alimlərinin kitablarını gözdən keçirən şəxs onların qəlb əməllərindən kənar adicə təsdiqi isbat etmədiklərini görə bilər.Çünki onlar təsdiqə əlavə olaraq itaət, tabeçilik, qəbul etmə və razılıq kimi sifətləri daxil edir və bununla Cəhmin isbat etdiyi bilgi arasında fərq qoyurlar.Habelə onlar haqqı bilib ona boyun əyməyən bir çox müşriklərin və kitab əhlinin kafir olduqlarını vurğulayırlar.

## *Onların təsdiq sözünün tərifinə dair bəzi sözləri*:

“İthaful murid” kitabında demişdir: “O, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) din olaraq gətirdiyi zəruri surətdə bilinən hər bir şeyi təsdiq etməkdir.Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təsdiq etməyin mənası: Təkəbbürlük və inadkarlığı tərk edərək onun gətirdiyini razılıqla qəbul etmək və əməlləri bu əsas üzərə qurmaqdır.İnsanın ona olan itaətkarlığı və onu qəbul etməsi olmadan onu adicə qəlbi ilə təsdiq etməsi kifayət deyil.Çünki belə olacağı təqdirdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) nübuvvətinin və onun gətirdiyi dinin doğru olduğunu bilən bir çox kafirlərin imana sahib olmalarına dair hökm vermək gərəkli olacaq. Ancaq onlar buna boyun əyməmiş, bunu qəbul etməmiş və saleh əməlləri bu əsas üzərə qurmamışlar.Məhz bu səbəbdən onlar gerçək mənasında olduğu kimi təslimiyyət adına yiyələnməmişlər.”[487]

Əl-Beycuri (rahiməhullah) demişdir: “Peyğəmbəri (salləllahu aleyhi və səlləm) bu məsələdə təsdiq etmək deyildikdə, ona itaət edib onu qəbul etmək qəsd edilir.Burada ona olan itaətkarlıq və onun qəbul edilməsi hasil olmadan qəlbdə ona yönələn təsdiqin yer alması qəsd edilmir.Çünki belə olacağı təqdirdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) nübuvvəti və risalətinin gerçəyini bilən bir çox kafirlərin imana sahib olmalarına hökm vermək gərəkli olacaq.Buna təsdiq olaraq Uca Allah buyurur: *“Kitab verdiyimiz kimsələr onu öz*

[487] İthaful murid:87-91-ci səh.İbnul Əmir haşiyəsində onun sözlərinə əlavə edərək demişdir: (Əməlləri onun üzərinə qurmaqdır) Faydalardan biri də, gerçəyin əsası bundan asılı deyil.Əgər onun üzərinə qurmaq etiqadına aid edilərsə öncəkinə heç bir əlavə gətirmiş olmaz.”

*oğullarını tanıdıqları kimi tanıyırlar."*[488] Abdullah bin Səlləm demişdir: "Mən onu gördüyüm an oğlumu tanıdığım kimi tanıdım.Əslində isə mən Muhammədi daha çox tanıyırdım ."[489]

Əd-Dərdir "əl-xaridə" kitabının şərhində demişdir: "Peyğəmbəri təsdiq etmək sözü ilə: Təkəbbürlük və inadkarlıq olmadan təslimiyyət adının doğru olacağı surətdə onun gətirdiyi dinə itaət edib onu qəbul etmək qəsd edilir. Burada ona olan itaətkarlıq və onun qəbul edilməsi hasil olmadan qəlbdə ona yönələn təsdiqin yer alması qəsd edilmir.Çünki belə olacağı təqdirdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) nübuvvəti və onun gətirdiyi dinin gerçəyini bilən bir çox kafirlərin imana sahib olmalarına hökm vermək gərəkli olacaq.[490]Çünki onlar təslimiyyət adlanacaq surətdə ona boyun əyməmiş və onu qəbul etməmişlər.Buna əsasən deyiləcək ki, şər`i iman, biliyə bağlı olan nəfs sözüdür, yəni qəti idrakdır. Təqlidçinin imanının səhih olacağına dair səhih görüşü əsas götürərək deyiləcək ki, boyun əymə, qəbul etmə, təsdiq etmə və təslimiyyət, bir şey haqqında xəbər verən ifadələrdir.Bu isə qeyd edilən nəfs sözüdür.Belə olan təqdirdə iman, nəfsin fellərindən bir fel olub elm və biliklər növündən olmur.Bəzilərinin sözlərindən bunun üstün görüş olması sezilir." Daha sonra o, Təftəzani və bir çox təhqiqçilərin görüşünə əsasən təsdiqin

---

[488] əl-Bəqərə:146.

[489] Şərhu-l-Beycuri:43-cü səh.

[490] əs-Savi haşiyəsində demişdir: «Əbu Talib mislində.Belə ki, o, itaətsizlikdən məhrum olduğu halda peyğəmbərin doğru olduğuna şahidlik edirdi." (haşiyətus-Savi alə şərhil xaridə:72-ci səh)

məhz idrakın özü olduğunu və bununla da, onun elm və biliklər növündən olduğunu qeyd etmişdir.[491]

"Əl-məvaqif" kitabının şərhinə əs-Səyaləkutinin haşiyəsində təsdiqin qazanc nəticəsində və ixtiyarı surətdə hasil olduğunu qeyd etdikdən sonra demişdir: "Şər`i imanın birincidən olması vacibdir.Belə ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) nübuvvət iddiası ilə çıxış etdiyi və möcüzələr göstərdiyi zaman ixtiyar amili aid edilmədən müəyyən bir şəxsin qəlbində zəruri olaraq onun doğru olması hasil olmuşdur.Ərəb dilində isə belə şəxs haqqında: Onu təsdiq etdi,-sözləri deyilməz.Belə olan halda o, şər`i iman olmur. "Əl-məqasıd" kitabının şərhində məzh bu cür gəlmişdir. Əslində isə bu məsələ, araşdırma tələb edir.Belə ki, əgər bir şəxs təsdiqin tələbinə uyğun əməl edəcəyi zaman ixtiyarı surətdə olmadan təsdiqə yiyələnərsə yekdilliklə imana sahib olar.Ancaq əgər biri Peyğəmbərin (salləllahu aleyhi və səlləm) möcüzələrini görüb onu ixtiyarı surətdə təsdiq edər lakin onun tələbinə əsasən əməl etməzsə, üstəlik inadkarlıq edərsə yekdilliklə kafir olar.Bununla da, məlum olur ki, şər`i imanda mötəbər olan, təsdiqin özündə deyil təsdiqin tələbinə uyğun əməl etməkdə ixtiyarın hasil olmasıdır.Bəzi

---

[491] Şərhul xaridə-l-bəhiyyə, əd-Dərdid:72-ci-səh.ət-Təftəzəni bilgi ilə təsdiq arasında fərqin olmasına dair "şərhul aqaidi-n-nəsəfiyyə:82-ci səh" kitabında demişdir ki, hesaba alınan təsdiq, təsdiq edənin ixtiyarı ilə sabit olan əldə olunmuş bir işdir.Bilgi isə fərqlidir.Çünki o, bəzən bir insanın gözünün bir şeyə sataşdığı və nəticədə həmin şeyin divar yaxud daş olması haqqında bilginin hasil olması mislində adi hal olaraq hasil olur.

möhtərəm insanların təsdiqə əlavə bir şey hesab etdikləri təslimiyyət məhz budur.Buna diqqət yetir!”.[492]

Bir sözlə, əşarilər iman üçün itaət, tabeçilik, qəbul etməni və inadkarlıq və təkəbbürlüyün tərk edilməsini şərt görürlər.Lakin onlar bunu “təsdiq”in özü edir daha sonra ”bilgi” ilə “təsdiq” arasında olan fərqi ortaya çıxartmaq üçün özlərini çətinə salırlar.Əgər onlar: Təsdiq olan yerdə itaət, tabeçilik və qəbul etmə vacibdir,-desəydilər məsələ asan olardı.Ancaq onlar bilirlər ki, bu, onların əməli imandan çıxartmalarını üzərində qurduqları təməli puç edir.Onların təməli isə, imanın ərəb dilində gələn mənanı şamil etdiyini, habelə şəriətin təsdiq mənasını ifadə edən mənanı dəyişmədiyini, habelə ona düzəliş gətirmədiyini və imanın bir şey olduğunu iddia etmələridir.

Bu səbəbdən, Şeyxul-İslam onların bəziləri haqqında bu sözləri nəql etmişdir: “Onlar adın səhih olması üçün onun təsdiq edilməsi anlamına daxil olmayan şeylərin əlavə edilməsi məsələsində ixtilaf etmişlər.Bu şeylərdən, peyğəmbəri öldürməkdən əl çəkmək, ona aziyyət verməmək, bütlərin təzim edilməsini tərk etmək.Bu, tərk etmə qəbilindən olan şeylərdir. Əməllərdən isə: Peyğəmbəri müdafiə etmək, onu dayaq olmaq. Onlar demişlər: Bütün bu məsələlərin hamısı şəriət baxımından təsdiq anlamına əlavə edilir.Digərləri isə demişlər: Bu, böyük günahlardandır və insan bu işdə müxalif olmaqla imandan çıxmır.”

---

[492] Haşiyətu-s-Səyələkuti alə şərhil məvaqif:8/352.Şərhul xaridə, Hüseyn Abdul-Kərim Məkki:64-cü səh.

Daha sonra Şeyxul-İslam buna əlavə edərək demişdir: “Dedim: Bu iki söz, Cəhmin sözləri deyil.Əslində bunu deyən insan artıq imanın adicə qəlb təsdiqi olmadığını və onun bir şey olmadığını etiraf etmiş olur.O, belə demiş olur: Şəriət ona düzəliş vermişdir.Bu söz onların təməlini çökdürür.Bu səbəbdən Cəhm, Salihi, Əbul Həsən və Qadı Əbu Bəkr kimi bunların daha geniş biliyə malik olanları insandan iman adının yalnız qəlbdə olan elmin yoxa çıxması ilə yoxa çıxacağını demişlər.”[493]

Həmçinin “əl-irşəd” kitabının şərhçisi Əbul Məali əl-Cuveynidən və Əbul Qasim əl-Ənsaridən imanın qəlb təsdiqi olduğunu ifadə edən sözləri nəql etmişdir.Buna rəğmən şəriət, inadkarlığı tərk etməyi vacib etmiş və Muhammədin (salləllahu aleyhi və səlləm) nübuvvətini bilən yəhudiləri təkfir etməsi bu növdən olmuşdur, yəni onlar inadkarlıq, zülm və həsəd səbəbilə kafir olmuşlar.

Şeyxul-İslam (rahiməhullah) demişdir: Bu məzhəbdə Əbul Həsən, Qadı və onlardan öncə Cəhmin ardıcıllarından olanlar kimi ən səriştəli şəxslər bunun təməli pozan ziddiyət olduğunu bilmişlər.Onlar demişlər: İnsan yalnız qəlbində olan təsdiq gedəcəyi zaman kafir olur.Onlar şəriətin kafir hökmü çıxardığı hər bir şəxsin qəlbində Allahı və Peyğəmbəri tanımadığını əsas olaraq tutmuşlar.Bu səbəbdən bir çox dərrakəli insan onların bu sözünə irad tutaraq demişlər: Bu, inadcıllıq və boşboğazlıqdır.”[494]

---

[493] Məcmu`əl-fətəva:7/145.

[494] Məcmu`əl-fətəva:7/146.

## *Qəlb əməlini təsdiqin özü edənin məzhəbinin batilliyi*:

Artıq qeyd edilmişdir ki, sonraki əşarilər qəbul etmə, tabeçilik və itaətçilik kimi qəlb əməlini isbat etmiş lakin onu təsdiqin özünə daxil etmişlər.Əd-Dərdirin sözündə gəldiyi kimi: "İtaətçilik, qəbul etmə, təsdiq etmə və təslimiyyət bir şey haqqında xəbər verən ifadələrdir." Habelə vurğulanmışdır ki, bu, Əbul Həsənin və Salihinin məzhəbidir və Şeyxul-İslam bu sözün yararsız söz olduğuna əminlik ifadə edib onu açıq-aydın zəlalət hesab etmişdir.O, demişdir: "Murciələr zahiri əməli imandan çıxarmışlar. Onlardan qəlb əməllərini çıxartmağı qəsd edərək onu adi təsdiq edənlərin sözü açıq-aydın zəlalətdir."[495] Qəlb əməlinin təsdiqə daxil edilməsi bir çox səbəbə görə batildir. Bu səbəblərdən ən qabarığı isə bunun nəticəsində bu sözün ortaya gəlməsidir: Əgər biri iblis, firon və Muhammədin (salləllahu aleyhi və səlləm) nübuvvətini bilən yəhudilər tək qəlb əməlinin yoxluğu yönündən kafir olarsa bu, qəlbdə təsdiqdən heç bir şeyin olmayacağı üzündən olacaq.Çünki əgər qəlb əməli təsdiqin özü olarsa onun yoxluğu təsdiqin yoxluğunu ifadə edəcək və bundan irəli gələrək qeyd edilən həmin şəxslərin təsdiq etmədiklərini və bir şəxsdən iman adının yalnız qəlbdə olan bilgi və təsdiqin yox olacağı zaman yox olacağını demək gərəkli olacaq.Bu məzhəbdə Əbul Həsən və Qadı Əbu Bəkr kimi səriştəli insanlar məhz buna etimad etmişlər.

---

[495] Öncəki:7/554.

Sonrakilər isə Şeyxul-İslamın işarə etdiyi ziddiyətə düşərək bir çox müşriklərin və kitab əhlinin elm və təsdiqə sahib olmalarını isbat etmiş və onlardan itaət və tabeçilik sifətlərini inkar etmişlər.Bununla bərabər onlar demişlər: Təsdiq, itaətçiliyin və tabeçiliyin özüdür.

Əslində bunların belə deməsi gərəkdir: Qəlbdə olan vacib iman iki şeydir: Təsdiq və əməldir və bəzən əməlsiz təsdiq mövcud olur.Lakin bu söz, onların öz məzhəblərini üzərində qurduqları təməli pozur.Bu isə imanın adicə təsdiq olması, onun bir şey olması və şəriətin ona heç bir düzəliş gətirməməsini deməkdir.

Bu qarışığlıq, Quran və sunnədən üz çevirib kəlam elmi üzərində qurulan görüşlərdə və məntiq elminə dayanan qaydalarda doğru yol axtaranların cəzasıdır.

Bütün bunlar əşarilərə görə küfrün anlamı mövzusunda həmçinin üzə çıxacaq.

# Beşinci araşdırma:

## Əşarilərə görə küfrün anlamı

Əşarilər küfrün Uca Allahı təkzib etmə yaxud Onun haqqında bilgisizlik olduğunu və bütə səcdə etmə və göy cisimlərinə ibadət etmə kimi icma ilə küfr olması bilinən şeylərin özlüyündə deyil sadəcə küfrün bir əlaməti olduğunu hesab edirlər.Onlara görə bunu edənin daxilən mömin olması caizdir.Onlardan bəzisi deyir: Şəriət bu işləri təkzib etmənin əlaməti etmişdir. Bununla da həmin şəxs, onu edənin qəlbində təkzibin mövcud olmasına və təsdiqin yoxluğuna hökm verir.

Bəqilləni demişdir: "Küfrün mənasına dair söz bölümü: Əgər biri: Sizə görə küfr nədir?-deyərsə, ona deyiləcək: İmanın əksidir.Bu isə insanın qəlbini Allah haqqında elmə yiyələnməyə mane olan, Uca Allah haqqında bilgisizlik və Onu təkzib etmədir.Həmin şəxsin qəlbi sanki haqqa dair bilgidən pərdəlidir.Bəzən də küfr, təkzib etmə, danma və inkar etmə mənasında olur.Belə deyilmişdir: "كفرني حقي : kəfərani haqqi", yəni haqqımı dandı.

Asiliklərdə qeyd etdiyimizdən savayı küfr yoxdur.Lakin bəzən küfr üçün əlamət edilən şeyin küfr adlanması caiz olur. Buna misal, göy cisimlərinə və oda ibadət etmək, haramları halal saymaq, peyğəmbərləri öldürmək və həmin şeylərin yalnız Allaha küfr edən, Onu təkzib edən və danan

şəxs tərəfindən hasil olacağına dair dəlillərin varid olub icmanın səhih olduğu digər şeylər."[496]

Bağdadi demişdir: "Əbul Həsən demişdir: İman, Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) xəbər verdiklərini təsdiq etməkdir. Bu təsdiq isə yalnız bilik ilə olur.Buna görə də küfr, təkzib etmədir.İbn Ravəndi və Hüseyn bin Fədl əl-Bəcəli həmçinin bu görüşü seçmişlər."[497]

Habelə demişdir: "Küfrə dəlalər edən əməllərin bəyan edilməsinə dair bu təməldən çıxan onuncu məsələ: Əshabımız demişlər: Zərurətsiz və qorxu halı olmadan donuz ətini yemək, məcburiyyət olmadığı halda müsəlman diyarlarında kafirlərin geyimlərini aşkar geyinmək, günəşə və bütə səcdə etmək və bu qəbildən olan şeylər, qəlbdə küfrün etiqad edilməyəcəyi təqdirdə özlüyündə küfr olmasa belə küfrün əlamətlərindəndir.Bu üzdən əgər biri bundan bir şeyi edərsə biz onun daxilən kafir olduğunu bilməsək belə ona küfr hökmünü icra edəcəyik."[498]

Əl-İci demişdir: "Üçüncü məqsəd: Küfrə dairdir: O isə, imanın əksidir.Bizə görə o, Peyğəmbərin gətirdiyi zəruri olaraq bilinən şeylərin bəzisini təsdiq etməməkdir.Əgər: Öz ixtiyarı ilə xaçpərəstlərə aid olan kəməri belinə bağlamış kafir olmur,-deyilərsə, cavab olaraq biz ona deyəcəyik: Biz həmin şeyi təkzibin əlaməti edib həmin şəxsə buna əsasən hökm veririk."[499]

---

[496] Təmhidul əvail:392-394-cü səh.

[497] Usulu-d-din, əl-Bəğdədi:247-ci səh.

[498] Öncəki mənbə:266-cı səh.

[499] əl-Məvaqif:201.

Bir sözlə, əşarilər küfrün yalnız qəlb təkzibi və cəhaləti ilə olacağını hesab edir və əməlin yaxud sözün özlüyündə küfr olduğunu düşünmürlər.Habelə onlar, bir şəxsə küfr hökmü çıxarılacağı zaman bunun qəlbdən təsdiqin getməsi səbəbilə olduğunu hesab edirlər.Yaxud deyilir: O, zahirən kafirdir.Onun daxilən mömin olması istisna edilmir.Onlar öncə qeyd edildiyi kimi bu qaydada Cəhmin sözünə müvafiq gəlirlər."

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Buradan Cəhm bin Safvan və onun ardıcıllarının yanlışlığı üzə çıxır.Belə ki, onlar imanın adicə qəlb təsdiqi və bilgisi olduğunu düşünmüş və qəlb əməllərini imandan etməmişlər. Onlar düşünmüşlər ki, insan Allahı və Peyğəmbəri söymək, Allaha və Peyğəmbərə ədavət bəsləmək, Allahın dostlarına ədavət bəsləyib Allahın düşmənləri ilə dostluq etmək, peyğəmbərləri öldürmək, məscidləri sökmək, Quran yazısına sayğısızlıq etmək, kafirlərə son dərəcə ehtiram nümayiş etdirmək, möminləri isə son dərəcə alçaltmaq kimi əməllər ilə bərabər insan kamil imana sahib olan mömin ola bilər.Onlar demişlər: Bütün bunlar qəlbdə olan imana zidd gəlməyən asiliklərdir.İnsan daxilən Allah qatında mömin olduğu halda bu kimi şeyləri edir.Habelə demişlər: Ona sadəcə dünyada kafirlərin əhkamları sabit olur.Çünki bu sözlər, iqrar və şahidlərdə olduğu kimi zahirə uyğun hökm verilməsi üçün küfrün nişanəsidir.Çünki bəzən insan daxilən iqrar etdiyi şeyin, şahidlər isə şahidlik etdikləri şeyin tam əksinə olurlar.Onlara qeyd edilən şəxslərdən birinin məhz həmin səbəbə görə kafir olub axirətdə əzaba

düçar olacağına dair Quran, sunnə və icma gətirildiyi zaman deyirlər: Bu, onun qəlbində təsdiq və elmin yoxluğunu göstərir.Onlara görə küfr bir şeydir ki, o da cəhalətdir. Habelə onlara görə iman bir şeydir ki, o da elm yaxud qəlbin təkzib və təsdiq etməsidir.Onlar qəlb təsdiqinin elmdən savayı bir şey olduğuna yoxsa onun həmin şey olduğuna dair ixtilaf etmişlər.Bunun imana dair deyilən ən yaramaz söz olmasına rəğmən kəlam əhlindən və murciələrdən bir çoxu bu görüşü seçmişlər."[500]

Habelə demişdir: "Cəhm və Salihinin sözünü deyən bu şəxslər Allahı və Peyğəmbəri söyməyin, üçlük sözünü dilə gətirməyin və küfr olan hər bir söz danışmağın daxilən küfr olmadığını və yalnız zahirdə küfrün olmasına dəlil olduğunu iddia etmişlər.Onlara görə həmin söyən və təhqir edən şəxsin daxilən Allahı tanıyan, Onu təkləşdirən və Ona iman gətirən şəxs olması caizdir."[501]

İbn Hazmın əşarilərə bu məsələdə rəddiyə məzmunlu sözləri öz mətanəti ilə seçilir.Onun sözlərindən bəzisi:

"Biz cəhmilər və əşarilərin bu sözlərinə dair deyirik: (Siz deyirsiniz ki) Uca Allahı danmaq, Onu təhqir etmək və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) danmaq kimi bütün bu şeylər dil ilə olacağı zaman küfr deyil sadəcə qəlbdə küfrün olmasına bir dəlil olacaq.Bizə qeyd etdiyiniz həmin dəlil haqqında xəbər verin görək.Siz onun qəlbən rübubiyyəti və nübuvvəti dandığını qəti bilir, yəqinliklə bunu isbat edir və bunda heç şübhə etmirsiniz yoxsa onun şübhə yeri qoyanvə

---

[500] Məcmu`əl-fətəva:7/188.

[501] Məcmu`əl-fətəva:7/557.

olmaması caiz olan dəlil olduğunu və qəlbdə küfrün yoxluğunun mümkün olduğunu hesab edirsiz? Bunlardan birinin olması labüddür.Əgər onlar: O, bizim qəti bilmədiyimiz və yəqinliklə isbat etmədiyimiz dəlildir,- desələr, biz onlara deyəcəyik: Belə olan halda sizə nə gəlib ki, zənn üzərində qurulmuş fikirlərə əsaslanırsınız. Artıq Uca Allah demişdir: *"Sadəcə olaraq zənnə qapılırlar. Zənn isə əsla həqiqət ola bilməz."*[502][503]

Habelə demişdir: "Onlar demişlər: Uca Allahı təhqir etmək küfr deyil.Həmçinin Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təhqir etmək eynilə küfr deyil.Bu,əsassız iddiadır. Çünki Uca Allah demişdir: *"Allaha and içirlər ki, (nalayiq sözlər) deməyiblər. Onlar küfr sözünü demiş, İslamı qəbul etdikdən sonra kafir olmuşlar".*[504]Uca Allah sözlərdən bəzisinin küfr olduğunu vurğulamışdır.Habelə Uca Allah buyurur: *"(Allah) Kitabda sizə nazil etmişdir ki, Allahın ayələrinin inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman, (günahkarlar) başqa bir söhbətə keçməyincə onlarla bir yerdə oturmayın. Yoxsa siz də onların tayı olarsınız."*[505]Uca Allah Onun ayələrinə dair bəzi sözlərin özlüyündə eşidilən bir küfr olduğunu vurğulamışdır. Habelə buyurur: *"Onlardan soruşsan: "Biz ancaq söhbət edib zarafatlaşırdıq (əylənirdik)", -deyə cavab verərlər. De: "Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz?" Üzrxahlıq etməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz."*[506]Uca Allah burada Allaha yaxud Onun ayələrinə yaxud peyğəmbərlərindən birinə istehza etməyin

---

[502] ən-Nəcm:28.
[503]əl-Fisal:3/259.
[504] ət-Təubə:74.
[505] ən-Nisa:140.
[506] ət-Təubə:65-66.

imandan çıxaran küfr olduğunu vurğulamış və buna dair: Mən onların qəlbində küfrün olduğunu bilmişəm,-deməmişdir.Əksinə O, məhz istehza səbəbilə onları kafir etmişdir.Bundan başqasını iddia edənlər isə Allahın demədiyi sözü Onun adına yazır və Allahın adından yalan danışırlar."[507]

Habelə demişdir: "Əşarilər demişlər: İslamı izhar edən birisinin Allahı və Peyğəmbəri ən çirkin söyüşlə söyməsi, habelə təqiyyə və xəbər vermə olmayacağı halda dil ilə onları təkzib etdiyini elan etməsi və bunu etiqad etdiyini iqrar etməsi kimi şeylərdən heç biri küfr deyil.Lakin onlar islam əhlinin iradına tuş gələcəklərindən qorxduqları zaman belə dedilər: Lakin bu, onun qəlbində küfrün olmasına bir dəlildir.Biz də onlara deyirik: Siz, dəlalət edən bu dəlilin səhihliyinə qəti əminsinizmi? Onlar isə: Xeyir!-deyə cavab vermişlər."[508]

Habelə demişdir: "Uca Allahı söymək məsələsinə gəldikdə isə demək lazımdır ki, cəhmilər və əşarilərdən savayı yer üzündə elə bir müsəlman yoxdur ki, onun özlüyündə küfr olmasına müxalif olsun.Həmin iki tayfanın isə dedikləri dəyərsizdir. Onlar açıq deyirlər ki, Uca Allahı söymək, küfrü elan etmək küfr deyil.Onların bəzisi demişdir: Bu, onun Allahı söyməsi ilə yəqin olaraq kafir olmasını ifadə etmir və sadəcə onun küfrü etiqad etməsinə dəlildir.Onların bu məsələdəki təməli, islam əhlinin icmasından kənar olan yaramaz bir təməldir.Belə ki, onlar deyirlər: İnsan, təqiyyə və xəbər vermə olmadan könüllü

---

507 əl-Fisal:3/244.

508 əl-Fisal:5/75.

şəkildə küfrü elan edəcəyi və bütlərə ibadət etdəcəyi halda belə iman yalnız qəlb ilə təsdiqdir.Əbu Muhamməd dedi: Bu, xalis küfrdür.Çünki bu, ümmətin icmasına və Allahın, Peyğəmbərin (salləllahu aleyhi və səlləm), səhabələrin və onlardan sonra gələnlərin hökmünə müxalifdir.Çünki heç bir kimsə, istər kafir olsun istərsə də mömin, bu Quranın Muhamməd (salləllahu aleyhi və səlləm) tərəfindən gətirildiyinə və onun Allahdan gələn vəhy olduğunu xəbər verdiyinə müxalif olmamışdır. Doğrudur, rafizilərdən bir tayfa Quranda nöqsanın və təhrifin olduğunu iddia etsələr belə onun ümumən qeyd etdiyimiz kimi olmasına və orada küfr adının müəyyən şəxslərə şamil edilməsinə və məlum sözləri dilə gətirənlərə qəti olaraq küfr hökmünün çıxarılmasına dair ixtilaf etməmişlər.Uca Allah buyurur: *“Şübhəsiz ki: “Allah Məryəm oğlu Məsihdir!”- deyənlər kafir oldular.”*[509] Habelə buyurur:*“(And olsun ki) onlar küfr sözünü demiş, islamı (zahirən) qəbul etdikdən sonra kafir olmuşlar.”*[510]Bununla da, küfrün söz ilə olması öz təsdiqini tapmışdır.

Artıq Uca Allah iblisə kafir hökmünü çıxartmışdır.İblis isə Allahın onu oddan Adəmi isə palçıqdan yaratdığını bilirdi. Allah ona Adəmə səcdə etmək əmrini vermiş və Adəmi ondan üstün etmişdi.İblis isə Allahdah qiyamətəcən möhlət istəmişdi.

Sonra onlara belə deyiləcək: Sizə görə Uca Allahı söymək küfr deyil.Siz onun küfrə dəlil olduğunu haradan deyirsiniz? Əgər onlar: Çünki həmin sözü deyənə küfr hökmü

[509] əl-Maidə:72.

[510] ət-Təubə:74.

çıxarılmışdır,-desələr, onlara deyiləcək: Doğrudur! Ancaq onlara yalnız Uca Allahın bildiyi gizli etiqadları səbəbilə deyil məhz sözün özünə görə hökm çıxarılmışdır.O, yalnız onun sözünə əsasən ona küfr hökmünü çıxartmışdır.Onun sözü küfrdür.Əgər biri bunun həmin şəxsin daxili etiqadına bağlı olduğuna dair qətiyyət ifadə edərsə bilsin ki, artıq Uca Allah bir tayfa haqqında belə xəbər vermişdir: *"Onlar qəlblərində olmayan şeyi dilləri ilə deyirdilər."*[511]Onlar, Peyğəmbərin (salləllahu aleyhi və sələm) nübuvvətinin doğru oluğunu öz övladlarını tanıdıqları kimi tanıyan, bununla belə küfr sözü elan etmələri səbəbilə qəti və yəqin olaraq kafir olan yəhudilər kimi buna görə kafir olmuşlar."[512]

[511]Ali İmran:167.

[512] Muxtəsaru-l-isal, mulhaq bil muhallə:12/435.

# BEŞİNCİ FƏSİL

## Maturudiyyə firqəsinə dair açıqlama

**İki araşdırmadan ibarətdir:**

**1-Onların imana dair sözləri.**

**2-Maturudilərə görə küfrün anlamı.**

# Birinci araşdırma:

## Onların imana dair sözləri

Həmin firqənin şeyxi olan Əbu Mansur əl-Məturidi imanın təsdiq olması görüşünü seçib, dil ilə sözün yalnız dünyavi əhkamların icrası üçün şərt olduğunu, imanın artıb azalmadığını, habelə onda istisnanın edilməyəcəyini demişdir.

Maturidi demişdir: "Quranın dəlilləri və iman əhlinin dedikləri sözləri ilə imanın təsdiq olması sabit olmuşdur."[513]

Habelə demişdir: "Bizim təməlimiz, imana dair sözdə qətiyyətli olub qeyd şərtsiz "iman" adını insana şamil etmək və ona dair istisnanı tərk etməkdir.Çünki bütövlüklə olacağı zaman imanı tamamlayan hər bir məna imanda istisna ediləcəyi təqdirdə səhih olmur."[514]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əbu Mənsur əl-Məturidi və onun kimi Əbu Hanifənin sonraki əshabından bir toplum insan təməl məsələsinə dair bu sözə bənzər görüş seçmişlər.Onlar demişlər: İman qəlbdə olandır.Zahiri söz isə dünya əhkamlarının sabit olması üçün şərtdir."[515]

Mullə Əli əl-Qari demişdir: "Təhqiqçilərin cumhuru imanın qəlb ilə təsdiq olduğunu demiş və iqrarın yalnız

---

[513] ət-Təuhid, əl-Məturudi:332-ci səh.Habelə "əl-musəmərə alə-l-musəyəra:274-ci səh" kitabına bax.
[514] ət-Təuhid:388-ci səh.
[515] Məcmu`əl-fətəva:7/510.

dünya əhkamlarının icrası üçün şərt olduğunu qeyd etmişlər.

Habelə bu, şeyx Əbu Mənsur əl-Məturidinin seçdiyi görüşdür."[516]

Məturudilərin öz şeyxi olan Maturidinin qoyduğu əsaslar üzərə getmələrinə rəğmən onlardan bir qismi dil ilə sözü imanın dayağlarından biri etmiş, bir qismi isə imanın artıb azalmasını isbat etmişlər.Üstəlik bu, sabit olmasa belə onların cumhuruna nisbət edilir.Habelə onlar təsdiq üçün itaətçilik və qəbul etməni şərt qoymuşlar.Onlardan bir qismi isə istisnanı caiz görmüşlər.

Təftəzəni demişdir: "Təsdiqin gerçəyi, itaətçilik və qəbul etmə kənar, qəlbdə xəbərin yaxud xəbər verənin doğru olması nisbətinin hasil olması deyil.Çünki təsdiq, təslimiyyət adının sabit olacağı surətdə həmin şeydə itaətçilik və qəbul etmənin hasil olmasıdır."[517]

Nəsəfi demişdir: "İman, Peyğəmbərin Uca Allah qatından gətirdiyini təsdiq və iqrar etməkdir." Onun şərhçisi demişdir: "Onun imanın təsdiq və iqrar olmasına dair qeyd etdiyi sözlər bəzi alimlərin məzhəbidir.Habelə bu, imam Şəmsu-l-əimmə Fəxrul-İslamın seçdiyi görüşdür."[518]

---

[516] Şərhul fiqhil əkbər:125-ci səh.Şərhul aqaidi-n-nəsəfiyyə, ət-Təftəzəni:79-cu səh.
[517] Şərhul aqaidi-n-nəsəfiyyə:78.
[518] Öncəki mənbə:78.

Məturudi firqəsinə mənsub olan Nəsəfi burada fəqih murciələrin görüşünü seçərək iqrarı imandan bir hissə etmişdir.

Bədən əməllərinə gəldikdə isə maturudilər onu imandan çıxarmışlar.Onlardan bir qismi isə onun imanın kamilliyindən olduğunu demişlər.

Mullə Əli əl-Qari demişdir: "Bədən əzaları ilə edilən əməl imanın kamilliyi və ihsanın gözəlliyindəndir."[519]

*Onların imanın artıb azalmasına dair sözləri*:

Belə ki, əs-Savi "şərhu-l-cəuhəra" kitabında məturudilərin cumhuruna imanın artıb azalmasını nisbət etmişdir.[520]

Əslində isə onların cumhuru bunun tam əksini deyir.Belə ki, "əl-aqaid ən-nəsəfiyyə" kitabında demişdir: "İman artmır və azalmır."[521]

Əbul Muin ən-Nəsəfi demişdir: "İmanın təsdiq olması və özlüyündə artmanı qəbul etməməsi sabit olduğu zaman imanın artıb azalmadığı bəlli olur.İman, ona birləşən itaətlər ilə artmır və işlədilən günahlar ilə azalmır.Çünki hər iki halda olan təsdiq öncə olduğu kimi qalır."[522]

*Onların istisna etməyə dair sözləri*:

---

519 Şəruhl fiqhil əkbər:103-cü səh.
520 Şərhu cəuharati-t-təuhid:134.
521 əl-Aqaidu-n-nəsəfiyyə, Əbu Hafs ən-Nəsəfi məa şərhihə li-t-Təftəzəni:80-cı səh.
522 ət-Təmhid, ən-Nəsəfi:102.Təbsıratul ədillə, Əbu Muin ən-Nəsəfi:2/809. Haşiyətul Qasim bin Qatləbuğə əl-Hənəfi aləl musəməra:308,310.

Məturudilərin bir qismi istisna etməyin caiz olduğunu seçmişlər.Lakin onlar bunu “xiləful əulə” daha üstün görüşün əksi etmiş və sahib olduqları görüşdə “muvafət” anlamına dair əşarilərə müxalif olmuşlar.

Təftəzəni Əbu Hafs ən-Nəsəfinin sözlərini şərh edərkən demişdir: “Onun belə deməsi gərəksizdir: İnşallah mən mömінəm.Çünki əgər bu şübhə üzündən olarsa onun küfr olması qaçılmaz olacaq.Əgər ədəb və işlərin Allahın məşiətinə qaytarılması səbəbilə edilərsə yaxud hal-hazırki duruma deyil sonuc və aqibətə dair şübhə səbəbilə edilərsə yaxud Uca Allahı zikr etməklə təbərrük səbəbilə edilərsə yaxud nəfsi təmizə çıxartmaq və hazırki durumdan qürrələnməkdən uzaq durmaq səbəbilə edilərsə, belə olan hallarda onu tərk etmək daha məsləhətli və məqsədəuyğun olar.Çünki bu, şübhənin olması təəssüratını yaradır.Bu səbəbdən o: Gərəksizdir,-deyib: Olmaz,-deməmişdir. Çünki əgər bu, ortaya gələn şübhə səbəbilə olmazsa onun caizliyini inkar etməyin heç bir mənası olmaz.Habelə artıq sələfin çoxu hətta səhabə və tabiinlər bu görüşü seçmişlər.”

Nəhayət demişdir: “Bəzi əşarilərdən nəql edilir ki, insanın: İnşallah mən mömінəm,-deməsi, iman, küfr, xoşbəxtlik və bədbəxtliyin sonuca əsasən hesaba alınması səbəbilə doğrudur. Belə ki, xoşbəxt mömin, bütün ömrünü küfr və asilik içində keçirmiş olsa belə məhz iman üzərində öləndir.Habelə bədbəxt kafir, bütün ömrünü təsdiq və itaət üzərində keçirmiş olsa belə küfr üzərində öləndir.(Nəsəfi) bunun batil olmasını aşağıdaki sözləri ilə ifadə etmişdir: “Xoşbəxt bəzən bədbəxtə çevrilir”, yəni insan iman

gətirdikdən sonra islamdan çıxıb mürtəd olur. Habelə “bədbəxt bəzən xoşbəxtə çevrilir”, yəni küfrdən sonra imana gəlir.”[523]

[523] Şərhu-l-aqaidi-n-nəsəfiyyə:84-cü səh.Əbu Hafs ən-Nəsəfi: Ömər bin Muhamməd ən-Nəsəfi əs-Səmərqandi.Hicrətin 537-ci ilində vəvat etmişdir. Hicrətin 508-ci ilində vəfat etmiş Əbu Muin ən-Nəsəfi Meymun bin Muhamməd isə digər şəxsdir.Nəsəf, Amudərya çayı ilə Səmərqənd arasında yerləşən şəhərdir.

# İkinci araşdrma:

## Maturudilərə görə küfrün anlamı

Maturudilər küfrün tərifinə, onun təkzib etmə olduğuna və şəriətin əməllərdən və sözlərdən bəzisini təkzib etməyə əlamət edib onu edənə küfr hökmünün çıxarılacağına dair əşarilərdən fərqlənmirlər.

Ən-Nəsəfi demişdir: "Küfr təkzib etmə və danmadır. Onlar isə qəlb ilə olur."[524]

Təftəzəni demişdir: "Əgər deyilərsə ki: İnsan Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bütün gətirdiklərini təsdiq edəcəyi halda belə şəriətə və ya şəriət sahibinə sayğısızlıq edərsə yaxud Quran yazısını murdar yerlərə atarsa yaxud könüllü şəkildə xaçpərəstlərin kəmərini taxarsa icma ilə kafir olar, belə olan halda biz deyəcəyik: Əgər iman üçün dəyərli təsdiqin küfr olması bilinən həmin şeylərlə bir arada gəlməsi öz təsdiqini taparsa, şəriət sahibinin bəzi şər`i qadağaları təkzib etməyə əlamət etməsi caiz olacaq.Beləliklə də, həmin şeyləri edən şəxsdə təkzibin varlığı və təsdiqin yoxluğu səbəbilə ona kafir hökmü çıxarılacaq."[525]

---

[524] ət-Təmhid:100-cü səh.Təbsıratul ədillə:2/208.

[525] Şərhul məqasıd:5/225.

# ALTINCI FƏSİL

## Fəqih murciələrin məzhəbinə dair açıqlama

İki araşdırmadan ibarətdir:

**1-Onların imana dair sözləri.**

**2-Əhli sunnə ilə fəqih murciələrin ixtilafı həqiqidir yoxsa ləfzi ixtilafdır?**

# Birinci araşdırma:

## Onların imana dair sözləri

Fəqih murciələr deyildiyi zaman, fəqihlərdən Hammad bin Əbu Süleyman, Əbu Hanifə və onların ardıcılları kimi irca fikrinə nisbət edilən şəxslər qəsd edilir.

Belə ki, onlar imanın qəlb ilə təsdiq və dil ilə söz olduğunu seçib əməli onun dairəsindən çıxarmışlar.Habelə onlar iddia etmişlər ki, iman artıb azalmır və onda istisna edilmir.Bununla belə onlar, Əhli sunnə vəl cəmaatda varid olan görüş tək böyük günah sahibinin təhdidə məruz qalıb Allahın məşiəti altında olduğunu demişlər.

Əbu Hanifə (rahiməhullah) ona nisbət edilən "əl-vasiyyə" kitabında demişdir: "İman, dil ilə söz və qəlb ilə təsdiqdir. Təkcə iqrar isə iman deyil.Çünki əgər o, iman olsa idi bütün münafiqlər mömin olardılar.Habelə təkcə bilik, yəni təsdiq iman ola bilməz.Çünki əgər o, iman olsaydı bütün kitab əhli mömin olardı.Uca Allah münafiqlər haqqında buyurur: *"Allah həm də münafiqlərin xalis yalançı olduqlarına şəhadət verir."*[526] Yəni, onlar təsdiqə sahib olmadıqları səbəbilə iman iddiasında yalançıdırlar.Habelə Uca Allah kitab əhli haqqında buyurur: *"Kitab verdiyimiz kimsələr onu öz oğullarını tanıdıqları kimi tanıyırlar."*[527][528]

---

[526] əl-Munəfiqun:1.

[527] əl-Bəqərə:146.

[528] əl-Vasiyyə, Əbu Hanifə.əl-Fiqhul əkbər kitabının şərhindən nəql edilmişdir, Mullə Əli əl-Qari:124-cü səh.Bu kitabın Əbu Hanifəyə nisbətinin sabit olması

Habelə ona nisbət edilən "əl-fiqhul əkbər" kitabında demişdir: "Həmçinin biz heç bir müsəlmanı, halal saymayacağı təqdirdə böyük olarsa belə etdiyi günaha görə təkfir etmir, ondan iman adını sılmir və onu sözün həqiqi mənasında mömin adlandırırıq.Onun kafir deyil fasiq mömin adını daşıması isə caizdir."

Daha sonra demişdir: "Biz: Günahlar möminə zərər vermir,-demirik.Habelə biz: O, cəhənnəmə girməyəcək,-demirik.Habelə biz: O, fasiq olarsa belə dünyadan mömin olaraq çıxandan sonra atəşdə əbədi qalacaq,-demirik.Habelə biz murciələr  dediyi kimi: Yaxşılıqlarımız məqbul pisliklərimiz isə bağışlanmışdır,-demirik.Ancaq biz deyirik: Kim bütün şərtləri ilə və onu pozan nöqsanlardan və batil edən mənalardan kənar halda bir yaxşılıq edər sonra onu küfr yaxud mürtədlik amili ilə pozmayıb dünyadan mömin olaraq çıxarsa Uca Allah onun yaxşılığını zay etməz, əksinə onu qəbul edər və onun mükafatını verər. Şirk və küfrdən aşağı olan pisliklər edib ondan tövbə etmədən mömin olaraq ölən şəxs isə Uca Allahın istəyi altında olur.Allah istərsə ona atəş əzabı verər istərsə onu bağışlayar və ümumiyyətlə ona heç bir əzab verməz."

Nəhayət demişdir: "Göy və yer əhlinin imanı, iman edilən cəhətindən artıb azalmır.Lakin o, yəqinlik və təsdiq

---

mübahisəli məsələdir.Çünki ona isnad edilən kitabın raviləri məchul şəxslərdir.Habelə həmin kitabda Əhli sunnə val cəmaatın məzhəbinə müxalif olan bir çox məsələlər mövcuddur. "Bəraətu-l-əimməti-l-ərbaa min məsəilil mutəkəllimin ə-l-mubtədia, Abdul-Əziz bin Əhməd əl-Humeydi:76-79-cu səh" kitabına bax.

cəhətdən artıb azalır.Möminlər iman və tövhiddə bərabər, əməllərdə isə bir-birindən üstündürlər."[529]

Habelə "əl-vasiyyə" kitabında demişdir: "İman artıb azalmır.Çünki imanın artması yalnız küfrün azalması ilə təsəvvür edilə bilər.İmanın azalması isə yalnız küfrün artması ilə təsəvvür edilə bilər.Bir şəxsin eyni vaxtda mömin və kafir olması necə ola bilər? Belə mömin həqiqi mömin deyil. Kafirin küfründə şübhə olmadığı kimi möminin imanında həmçinin şübhə olmur."[530]

Habelə demişdir: "Əməl isə iman deyil.Habelə iman əməl deyil.Belə ki, bir çox vaxtlarda müəyyən əməllərin möminin üzərindən qalxması buna dəlalət edir.Belə olan halda: Onun üzərindən iman qalxır,-demək doğru olmazdı.Heyzli qadının üzərindən namaz qalxır, ancaq onun üzərindən imanın qalxmasını yaxud Allahın ona imanı tərk etməyi əmr etməsini demək doğru olmaz."[531]

Tahavi, Əbu Hanifə və onun iki əshabına aid olduğunu qeyd etdiyi məşhur əqidəsində demişdir: "İman dil ilə iqrar və qəlb ilə təsdiqdir.Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) sabit olan şəriət və bəyandan hər bir şey haqqdır.İman birdir və onun əhli imanın özəyində bərabərdirlər.Onların bir-

---

[529] Şərhul fiqhil əkbər, Mullə Əli əl-Qari:102-129.Həmin əl-fiqhul əkbər kitabının Əbu Hanifəyə nisbəti səhih deyil.Artıq Abdil-Əziz bin Əhməd əl-Humeydi "Bəraətu-l-əimməti-l-ərbaa min məsəilil mutəkəllimınə-l-mubtədia:46-71" kitabında bunu bəyan etmişdir.Lakin "irca" məzmunlu söz Əbu Hanifədən sabit olmudur.Onun müasirləri və ondan sonra gələnlər bunu təsdiq etmişlər.Həmin mənbə:2077-212.

[530] əl-Vasiyyə, Əbu Hanifə.Şərhul fiqhil əkbər kitabından nəql edilmişdir:127c-səh.

[531] Öncəki mənbə:130.

birindən üstünlüyü qorxu, təqva, nəfsi istəklərə müxaliflik və daha məqsədəuyğun şeylərə sarılmaqla ölçülür."[532]

Firqələr haqqında yazanlar Əbu Hanifə və onun əshabını, onların əməli iman anlamından çıxarıb onun artıb azaldığını inkar etmələri səbəbilə murciələrdən saymışlar. Habelə sələf bu məsələdə onlara qarşı çox sərt mövqe tutmuşdur.

Əşari "əl-məqalət" kitabında murciələrin firqələrini qeyd etdiyi sırada demişdir: "Murciələrdən olan doqquzuncu firqə: Əbu Hanifə və onun əshabıdır.Onlar iddia etmişlər ki, iman Allahı tanımaq, Allahı iqrar etmək, habelə Peyğəmbəri tanımaq və onun Allahdan gətirdiyi şeyləri açıqlamasız yığcam şəkildə iqrar etməkdir."[533]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İmanın qəlb təsdiqi və dil sözü olduğunu, əməllərin isə ondan olmadığını deyən murciələrın arasında Kufə fəqihlərindən və abidlərindən bir toplum insan olmudşur.Lakin onların sözü Cəhmin sözü mislində olmamışdır.Onlar, insanın bacardığı halda iman kəlməsini dilə gətirməyəcəyi təqdirdə mömin olmayacağını anlamışlar. Habelə onlar iblis, firon və digərlərinin qəlbləri ilə təsdiq etmələrinə rəğmən kafir olduqlarını bilmişlər. Ancaq əgər onlar qəlb əməllərini imana daxil etməsələr bu zaman onların Cəhmin sözünü demələri qaçılmaz olacaq. Onlar onu imana daxil etsələr, belə olan halda bədən əməllərini həmçinin ona daxil etmələri qaçılmaz olacaq.

[532] Şərhu mətni-t-tahaviyyə,İbn Əbul İzz:331-ci səh.

[533] Məqalətul isləmiyyin:1/219.əl-Fisal, ibn Hazm:3/227.əl-Miləl va-n-nihal, əş-Şəhrastəni:1/144.Məcmu`əl-fətəva:7/194.

Çünki bədən əməlləri qəlb əməllərinin zəruri amilidir. Lakin məsələnin onlara qaranlıq qalmasına səbəb həmin şəxslərin müəyyən şər`i dəlillərə sahib olmalarıdır."[534]

Habelə demişdir: "Hamməd bin Əbu Süleyman və ona tabe olanlar imanda fərqliliyi, əməllərin imana daxil olmasını və onda istisnanın edilməsini inkar etmişlər.Bunlar fəqih murciələrdir.Küfə əhlinin imamı, Hamməd bin Əbu Süleyman və onun mislində olanların şeyxi İbrahim ən-Nəxai, habelə ondan öncəki Alqamə və əl-Əsvəd kimi ibn Məsudun əshabı murciələrə müxalif olmaq məsələsində ən sərt insanlardan olar və imanda istisna edərdilər.Lakin Hamməd bin Əbu Süleyman öz sələfinə müxalif olmuşdur.Ona bir qism insanlar bu məsələdə tabe olmuş və Kufə əhlindən və onlardan sonra gələn bir sıra insanlar bu fikri mənimsəmişlər.Sələf və imamlar isə onlara sərt iradlar tutmuş, onları bidətdə ittiham etmiş və onlara sərt münasibət göstərmişlər.Lakin onlardan kiminsə həmin şəxsləri təkfir etdiyini bilmirəm.Üstəlik onlar həmin şəxslərin bu məsələyə görə təkfir edilməyəcəyinə dair yekdil olmuşlar.Artıq imam Əhməd və digər imamlar həmin murciələrin təkfir edilməyəcəyini vurğulamışlar.İmam Əhməddən yaxud digər imamlardan bunların təkfir ediləcəyini yaxud onların həmin şəxslərin təkfir edilməsi ixtilafı olan bidət əhlindən etdiklərini nəql edən şəxs böyük xətaya yol vermişdir."

Nəhayət demişdir: "Hamməd bin Əbu Süleyman, Əbu Hanifə və Kufə fəqihlərindən olan digər insanlar dil sözünü

[534] Məcmu`əl-fətəva:7/194.

və qəlb etiqadını imandan edirdilər. Bu, habelə Muhamməd bin Kulləb və onun mislində olanların sözüdür.Onların bu məsələdə sözləri müxtəlif olmamış və onlardan: İman adicə qəlb təsdiqdir,-demələri nəql edilməmişdir."[535]

Habelə demişdir: "İkinci dəstə[536] tövhid əhlindən heç kəsin əbədi cəhənnəmlik olmayacağına dair Əhli sunnəyə müvafiq olmuşlar.Ancaq onlar imanın hissələrə bölünmədiyini etiqad etmələri səbəbilə bunun yalnız imanın kamilliyi ilə olacağını düşünmüşlər.Onlar demişlər: "Hər bir fasiq kamil iman sahibidir.İnsanların imanı isə bir-birindən fərqli deyil əksinə bir-birinə bənzərdir.Fərqlilik isə imanda deyil yalnız əməllərdə olur. Habelə demişlər: Əməllər imandan deyil.Çünki Allah Öz kitabında iman ilə əməllər arasında fərq qoymuşdur. Sonra bu görüş sahiblərindən olan mötəbər fəqihlər demişlər: İman qəlb təsdiqi və dil sözüdür. Bu, Hamməd bin Əbu Süleyman və ona müvafiq gələn Əbu Hanifə kimi şəxslərdən nəql edilir."[537]

*Bir sözlə fəqih murciələrin sözləri aşağıdaki kimidir*:

1-İman, qəlb təsdiqi və dil sözüdür.

2-Zahiri əməlin iman anlamından çıxarılması.

3-İman hissələrə bölünmür və artıb azalmır.

---

535 Məcmu`əl-fətəva:7/507.

536 Yəni, imanın hissələrə bölünmədiyini və fərqlənmədiyini deyənlər.Birinci dəstə isə xəvaric və mötəzililərdir.

537 Məcmu`əl-fətəva:18/271.

4-İman əhli, imanın özəyində bərabərdirlər və fərqlilik yalnız imandan başqa şeylərdə hasil olur.

5-İmanda istisna edilmir.

6-Onların sözlərindən çıxan anlam, qəlb əməllərinin imandan olmamasıdır.Belə ki, firqələr haqqında yazanların onlar haqqında sözləri bunu ifadə edir.Artıq Şeyxul-İslamın buna dair sözləri qeyd edilmişdir: "Ancaq əgər onlar qəlb əməllərini imana daxil etməsələr bu zaman onların Cəhmin sözünü demələri qaçılmaz olacaq.Onlar onu imana daxil etsələr, belə olan halda bədən əməllərini həmçinin ona daxil etmələri qaçılmaz olacaq.Çünki bədən əməlləri qəlb əməllərinin zəruri amilidir."

Habelə demişdir: "Murciələr üç növdür: İman adicə qəlbdə olandır,-sözünü deyənlər.Bunlardan bəzisi qəlb əməllərini ona daxil edir.Əbul Həsən əl-Əşarinin öz kitabında onların sözlərini qeyd etdiyi kimi onlar əksər murciə firqələridir. O, bir çox firqələr qeyd etmişdir.Lakin biz onların yığcam sözlərini qeyd etmişik.Onlardan bir qismi, Cəhm və Salihi kimi ona tabe olanlar mislində onu imana daxil etmirlər.Məhz bu görüşü o və onun əksər əshabı müdafiə etmişlər.

İkinci görüş: Bu görüş sahibləri belə deyirlər: O, adicə dil sözüdür.Kərramilərdən öncə bu sözün sahibi bilinməmişdir.

Üçüncü görüş: Qəlb təsdiqi və dil sözü.Məhz bu, onlardan olan fiqh və ibadət əhlindən məşhur bir sözdür. Bunlar bir neçə cəhətdən yanlışlığa yol vermişlər.Birincisi:

Onlar Allahın qullarına fərz etdiyi imanın qullara nisbətdə bənzər olduğunu və bir şəxsə vacib olan imanın tam mislində bütün digər şəxslərə vacib olduğunu düşünmüşlər."[538]

Nəhayət geniş söhbətdən sonra demişdir: "Murciələrin yanlışlığına dair ikinci cəhət: Onlar qəlbdə olan imanın qəlb əməllərindən kənar yalnız bir təsdiq olduğunu düşünmüşlər. Artıq bu, cəhmiyyə murciələri haqqında qeyd edilmişdir.

Üçüncü cəhət: Onlar əməllərdən heç bir şey olmayacağı halda belə qəlbdə tam imanın olduğunu düşünmüş və buna görə də əməlləri, səbəbin səbəbi icad edənlə olan halı mislində imanın bəhrəsi və onun tələbi etmişlər.Ancaq onlar onu imanın zəruri amili etmirlər.Doğru olan isə qəlbdə olan tam imanın ona uyğun şəkildə zahiri əməlin olmasını gərəkdirməsidir.Zahiri əməl olmadan qəlbdə tam imanın yer alması isə qeyri-mümkündür."[539]

Şeyxul-İslam burada cəhmilərin qəlb əməllərini imandan çıxardığını açıq bildirmişdir.Bunu o, bir neçə yerdə qeyd edir. Ancaq onun burada fəqih murciələrin bu məsələdə olan sözünə dair əminlik ifadə etmədiyini görə bilərsən.Bununla belə ibn Teymiyyə digər yerdə belə deyir: "Cəhmilərə görə iman adi qəlb təsdiqi və biliyidir.Bu, Cəhm və Salihinin görüşüdür.Bu, habelə Əşari və onun əksər əshabından gələn məşhur görüşdür.Fəqih murciələr isə deyirlər ki, iman, qəlb təsdiqi ilə birgə dil sözüdür.Sahib

538 Məcmu`əl-fətəva:7/195.

539 Məcmu`əl-fətəva:7/204.

olduqları iki görüşdən birinə əsasən onlara görə qəlb əməlləri bədən əməlləri kimi imandan deyil.Belə olan halda, bir insanın dili və qəlbi ilə təsdiq etməsi ilə bərabər Allahın nazil etdiyinə nifrət bəsləməsi mümkün olur."[540]

Habelə demişdir: "Məhz bu yöndən cəhmilər və murciələr yanlışlığa düşüb imanı söz qəbilindən etmişlər.Onlar onu ya qəlb bilgisi olan qəlb sözü yaxud bəzilərinin dediyi kimi elm mənasını ifadə etməyən bir məna etmişlər.Bu cəhmiyyənin və əksər əşarilər və bəzi sonraki hənəfilər tək onlara tabe olanların sözüdür.Yaxud murciələrdən nəql olunan məşhur görüşdə olduğu kimi onu qəlb və dil sözü etmişlər.Onlar Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) sevmək, habelə Allahdan qorxmaq kimi qəlb əməllərini imandan etməməklə həmin təməl qaydada yanlışlığa düşmüşlər."[541]

Onların qəlb əməllərini imana daxil etmədiyinə dair güc qatan dəlillərdən yuxarıda qeyd edilən Tahavinin sözləridir. Tahavi imanın bir olduğunu və möminlərin imanın özəyində bərabər olduqlarını, onların arasında olan fərqliliyin isə qorxu və təqvada hasil olduğunu demişdir. Şübhə yoxdur ki, qorxu və təqva qəlb əməllərindəndir. Həmin xislətlər imandan olmadığı üçün ona fərqlilik daxil olmuşdur.

Habelə Şeyxul-İslamın onlar haqqında sözləri qeyd edilmişdir: "İnsanların imanı bir-birinə bənzərdir və

540 Minhəcu-s-sunnəti-n-nəbəviyyə:5/288.

541 Cəmiul məsəil, Şeyxul-İslam ibn Teymiyyə:5/246.Təhqiq: Muhamməd Əziz Şəms.

fərqlilik cəhəti ilə seçilmir.Fərqlilik yalnız imandan kənar olan əməllərdə olur.Habelə demişlər: Əməllər imandan deyil.”

Onlar qəlb əməllərində fərqliliyin hasil olduğunu isbat etdikləri zaman qəlb əməllərinin onlara görə iman anlamından xaric olduğu bilinmişdir.

# İkinci araşdırma:

## Əhli sunnə ilə fəqih murciələr

## arasında olan ixtilaf həqiqidir yoxsa ləfzi ixtilafdır?

Bu məsələdə ortaya gələn çəkişmənin mənbəyi, murciələrin əməli imandan çıxarmaları, onda artma və azalmanı inkar etmələri və onda istisna edilməyəcəyini ifadə edən sözlər demələri olmasına rəğmən, onlar səhih hədislərdə gəldiyi kimi Allahın böyük günah sahiblərini atəşdə əzaba düçar edəcəyinə daha sonra şəfaət sayəsində onları oradan çıxaracağına, habelə insanın imana sahib olması üçün onu dilə gətirməsinin labüd olmasına, fərz əməllərin vacib olmasına və onu tərk edənin irad və cəzaya layiq olmasına dair digər Əhli sunnə ilə yekdil olmuşlar."[542]

Bu səbəbdən elm əhlindən bir qismi onlarla Əhli sunnə arasında olan ixtilafın hökmdə deyil ad və ləfzdə olan ixtilaf olduğunu qeyd etmişlər.Digərləri isə ixtilafın ad, ləfz və hökmü şamil edən həqiqi ixtilaf olduğunu bildirmişlər.

*Şeyxul-İslamın bu məsələyə dair görüşünə baxış*:

Bəzi tədqiqçilər Şeyxul-İslamın Əhli sunnə ilə murciələr arasında olan ixtilafın, bəzi sözlərindən anlaşılan mənaya əsasən ləfzi ixtilaf olduğunu hesab etməsi haqqında fikir irəli sürmüşlər.

---

[542] Məcmu`əl-fətəva:13/38.

Doğru görüş, Şeyxul-İslamın bu məsələyə dair müxtəlif ifadələr işlətməsidir:

1-Bəzən o, əməllərə dair ixtilafın olması, onun imandan olması, habelə istisna və digər məsələlər haqqında: Bu, məsələlərin çoxunda ixtilaf ləfzidir,-deyir.

2-Bəzən isə deyir: Bu bidət, bidətlər içində ən yüngül olandır. Çünki həmin məsələdə olan ixtilafın çoxu hökmdə deyil ad və ləfzdə olan ixtilafdır."[543]

3-Bəzən isə bunun etiqadı deyil sözlü və əməli bidətlərdən olduğuna eyham vurur. Şeyxul-İslam (rahiməhullah) demişdir: Bu səbəbdən fəqihlərin irca fikrinə ümmətin nəzərində elm və din əhlindən olan bir toplum insan daxil olmuşdur.Bu üzdən sələfdən heç biri (fəqih murciələrdən) hər hansı bir şəxsi təkfir etməmiş və bunu etiqadı bidətlərdən deyil sadəcə söz və əməl bidətlərindən etmişlər.Belə ki, bu məsələdə ixtilafların çoxu ləfzidir.Lakin məhz Quran və sunnəyə uyğun gələn ləfz doğrudur.Heç bir şəxs Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözünə zidd söz danışmalı deyil.Xüsusən qeyd edilməlidir ki, artıq bu, murciələr və qeyrilərindən olan kəlam əhlinin bidətlərinə və günahların çoxalmasına yol açmışdır.Ləfzdə olan bu yüngül xəta etiqad və əməllərdə olan böyük xətaya səbəb olur.Bu üzdən irca fikrinə böyük iradlar tutulmuşdur. Hətta İbrahim ən-Nəxai (rahiməhullah) belə demişdir: Onların, yəni murciələrin bu ümmətə olan fitnəsi Əzariqanın

[543] Məcmu`əl-fətəva: 13/38.

fitnəsindən daha qorxuludur.Daha sonra murciələrin pislənməsinə dair bir sıra əsərlər qeyd etmişdir."[544]

Həmin üç yerdə varid olan sözlər arasında heç bir ziddiyat yoxdur.Çünki orada həmin ixtilafın bəzisinin həqiqi bəzisinin isə ləfzi olması etiraf edilir.Şübhəsiz ki, ikinci daha çoxdur.[545]

4-Bəzən isə Şeyxul-İslam bədən əməllərinin qəlb imanı üçün zəruri olduğunu və ləzim (zahiri əməl) olmayacağı zaman məlzumun (daxili əməlin) yox olacağını iqrar edənlərlə baş vermiş ixtilafın yalnız ləfzi olduğunu bəyan edir.

Şeyxin bunu bir sıra yerlərdə qeyd etməsinə rəğmən bu, bir çox tədqiqatçının diqqətindən yayınmışdır.

Həmin yerlərdən birində deyir: "Zahiri əməllərin iman adına girməsinin məcaz olduğunu deyənlərə: Sizin ixtilafınız ləfzidir,-deyiləcək.Çünki sən bunun qəlbdə olan vacib imanın zəruri amilləri və gərəkli ünsürləri olduğunu qəbul edəcəyin zaman bəlli olacaq ki, ləzimin (zahiri əməllərin) yoxluğu məlzumun (daxili əməllərin) yoxluğunu

---

[544] Öncəki mənbə:67/394.

[545] Ancaq şeyx bir sıra yerlərdə həmin ixtilafın bir çoxunun mənanı şamil etdiyini bildirmişdir.O, demişdir: "Daha sonra insanlar mömin və iman adina dair çoxlu ixtilaf etmişlər.Onun bəzisi ləfzi bəzisi isə mənanı şamil edəndir. Fəqihlərin imamları, bəzisi digərindən dini daha yaxşı bilsə və daha doğru səmtdə olsa belə qeyd etdiyimiz əhkamlardan heç bir şeydə ixtilaf etməmişlər.Lakin onlar imanın artıb azalmasına və onda istisna edilib edilmədiyinə, əməllərin imandan olub olmamasına və müsəlman fasiqin kamil imanlı olub olmamasına dair ixtilaf etdikləri kimi adlarda ixtilaf etmişlər."(Məcmu`əl-fətəva:7/504) Bunu isə iman məsələsinə dair insanlar arasında baş vermiş ümumi ixtilafa aid etmək mümkündür.Bununla da, bura cəhmiyyə, xəvariclər və mötəzililərin ixtilafı daxil olur.Şübhəsiz ki, belə olan halda ixtilafın çoxu mənanı şamil edən ixtilaf olur.

gərəkdirəcək.Həmin zahirin yoxluğu isə daxilin yoxluğunu vacib edir.Bunu etiraf edəcəyin zaman ixtilafın ləfzi olduğu üzə çıxacaq.Əgər sən, Cəhm və onun ardıcılarının dediyi kimi küfrü aşkar etmək və bütün zahiri vacibləri tərk etməklə yanaşı qəlbdə tam və vacib imanın bərqərar olduğunu deyərsənsə, cavab olaraq sənə deyiləcək: Bu, sənin: Zahir onun zəruri amili və onun gərəkli ünsürüdür,-dediyin sözə zidd gələcək.Üstəlik deyiləcək: Sənin sözündən çıxan gerçək məna budur: Bəzən zahir daxilə bağlı olur bəzən isə ondan ayrı olur və o, onun zəruri amili, gərəkli ünsürü və nəticəsi deyil.Lakin o, olacağı zaman daxilin olmasına dəlalət edən, olmayacağı zaman isə yoxluğu ilə yoxluğa dəlalət etməyən dəlildir.Bu, sənin sözünün gerçəyidir."[546]

Habelə demişdir: "Bu, zahiri əməllərin daxili imanın zəruri amilləri olmadığını deyən hər bir şəxs üçün vacib olur.Əgər biri: O, onun zəruri amillərindən biridir və daxili iman saleh zahiri əməli qaçılmaz edir,-deyib ardından: Həmin əməllər iman anlamının zəruri amilləri yaxud onun bir hissəsidir,-deyərsə, qeyd edildiyi kimi bu ləfzi ixtilaf olacaq."[547]

Habelə demişdir: "Burada, Əbul Həsənin "əl-mucəz" kitabında qeyd etdiyi cəhmilərin sualı vardır.Belə ki, Qurani Kərim aşağıda qeyd edilən şəxslərdən savayı insanlardan imanı inkar edib demişdir: *"Möminlər ancaq o kəslərdir ki,*

---

[546] Məcmu`əl-fətəva:7/577.
[547] Məcmu`əl-fətəva:7/584.

*Allah anıldığı zaman onların qəlbi qorxuya düşər”.*[548]Uca Allah bu əməllərin imandan olduğunu deməmişdir.Onlar demişlər: Biz deyirik: Kim bu əməlləri etməzsə mömin olmaz.Çünki onun yoxluğu qəlbdə olan elmin yoxluğuna dəlildir.Buna bir neçə yöndən cavab veriləcək:

*Birinci*: Siz həmin əməllərin qəlb imanının zəruri amili olduğunu qəbul etdiniz.Belə olan halda onun yoxa çıxması qəlbdə imanın qalmayacağını ifadə edir.Məqsəd məhz budur.Bundan sonra onun zəruri amil yaxud onun bir hissəsi olması məsələsi ləfzi ixtilafdır.

*İkinci*: Nasslar onun imanın bir hissəsi olduğunu açıq bildirir.Məsələn Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “İman altmış və bir neçə şöbədən yaxud yetmiş və bir neçə şöbədən ibarətdir.”[549][550]

Habelə demişdir: “Murciələr zahiri əməli imandan çıxartmışlar.Onlardan qəlb əməllərini həmçinin çıxartmağı qəsd edib onu təsdiq edənlərin sözü açıq-aydın zəlalətdir. Zahiri əməli imandan çıxartmağı qəsd edənlərə deyiləcək: Zahiri əməl daxili əməlin zəruri amilidir və ondan ayrılmazdır.Zahirin yoxluğu isə daxilin yoxluğunu göstərir. Yerdə qalan çəkişmə,zahiri əməlin “tədammün” yolu ilə (bir hissəsi olması etibarı ilə) dəlalət edən iman anlamının bir hissəsi yaxud iman anlamının zəruri amili olmasıdır.

---

[548] əl-Ənfəl:2.

[549] Buxari:9.Muslim:35.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.

[550] Məcmu`əl-fətəva:7/202.

Doğru olan isə adın ayrı və birləşik halda gəlməsi etibarı ilə onun bəzən iman adına daxil olması bəzən isə iman anlamının zəruri amili olmasıdır."[551]

Habelə demişdir: "Qəlb imanının zahirdə gərəkli ünsürləri olduğu zaman zahir, isbat və inkar etbarı ilə qəlb imanının dəlili olmuşdur.Uca Allah buyurur: *"Allaha və Axirət gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrəbaları olsalar belə – dostluq etsinlər."*[552]Habelə buyurur: *"Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana iman gətirsəydilər, müşrikləri özlərinə dost tutmazdılar."*[553]Habelə digər dəlillər.Bütün bunlardan sonra imanın ərəb dilində tələbləri xaric olmaqla adicə təsdiqə verilən ad olması yaxud hər ikisini şamil edən ad olması onu ləfzi ixtilafa çevirir.Deyilə bilər ki, dəlalət etmə, adın ayrı və birləşik gəlməsi etibarı ilə fərqli olur.İnsanlardan bəzisi deyir: İmanın ərəb dilində əsas mənası təsdiqdir.Daha sonra deyir: Lakin təsdiq həm dil ilə həm də, bədən əzaları ilə olur.Söz həmçinin təsdiq adlanır.Əməl həmçinin təsdiq adlanır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Gözlər zina edir.Onların zinası isə baxışdır. Qulaq da zina edir. Onun zinası isə eşitmədir.Əl də zina edir. Onun zinası isə toxunuşdur.Ayaq da zina edir. Onun zinası isə (zinaya) getməkdir.Qəlb arzulayır və istəyir cinsiyyət üzvü isə bunu ya təsdiq edir yaxud da ki, təkzib edir."[554] Həsən əl-Bəsri

---

[551] Məcmu`əl-fətəva:7/554.
[552] əl-Mucadilə:22.
[553] əl-Maidə:81.
[554] Yuxarıda keçmişdir.

demişdir: İman boş xülyalar və arzular deyil.Ancaq o,qəlbə yerləşən ve əməllərin təsdiq etdiyi bir şeydir!”[555]

Onlardan bəzisi deyir: İman, iqrar etməkdir.O, təsdiq etmə sözünə həmmәna söz deyil.Əslində fəqih murciələrin camaatla olan ixtilafı yüngül ixtilafdır.Hətta onun bəzisi ləfzidir.Fətva əhlindən olan məşhur imamlar arasında bundan savayı ixtilafın olması bilinmir.Bu, Hamməd bin Əbu Süleyman və onun yoldaşı Əbu Hanifə, habelə Əbu Hanifənin ardıcıları kimi Kufə fəqihlərindən olan bir top-lum insanların dediyi sözdür.”[556]

Habelə demişdir: “Ayrılıqda qeyd edildiyi zaman bu təsdiqin, onun anlamına daxil olan zəruri amilləri olur. Çünki“ləzim”in (zahiri əməllərin) yoxluğu “məlzum”un (daxili əməllərin) yoxluğunu tələb edir.Belə olan halda, ixtilaf ləfzi olaraq qalır; iman əmələ “tədammün” (əməlin onun bir hissəsi olması) yoxsa “lüzum” (zəruri amil olması) etibarı ilə dəlalət edir?

Bilmək lazımdır ki, Əhli sunnə arasında bu məsələyə dair ixtilaf ləfzi ixtilafdır.Çünki bu sözü ilk deyən Həmməd bin Əbu Süleyman və ona tabe olan Kufə əhli və digərləri kimi imanın söz olduğunu deyən fəqihlər bütün sunnə alimləri ilə yekdil olmuşlar ki, günah sahibləri qınaq və təhdid altına daxildirlər. Onlar: Həmin şəxslərin imanı Cəbrayılın[557] imanı kimidir,-desələr belə, camaatın dediyi

---

[555] əl-Musannəf:30351,35211-ci rəqəm, ibn Əbu Şeybə.

[556] Şərhul əsfahəniyyə:181-ci səh.

[557] Bəzi hənəfilər Əbu Hanifədən bu sözləri nəql etmişlər: “İmanım Cəbrayılın imanı kimidir.Ancaq mən: Cəbrayılın imanı mislindədir,-demirəm.Onlar buna, Cəbrayılın imanının müşahidə nəticəsində olması etibarı ilə sifətdə artdığını,

kimi bu cür deyirlər: Fərz edilən əməlsiz, habelə haramların edilməsi ilə birgə iman, sahibini qınaq və cəzaya məruz qoyur.Habelə onlar, camaatın dediyi kimi böyük günah sahiblərindən bəzisinin cəhənnəmə girəcəyini deyirlər.Əhli sunnədən, fasinin mömin adlanmayacağını deyənlər onun əbədi cəhənnəmlik olmadığına yekdildirlər.Bilmək lazımdır ki, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi şəriəti, habelə ondan mütavatir olaraq gələn xəbərlərə əsasən böyük günah sahiblərinin təhdid altında olduqlarını, habelə

---

nəticədə qəlb xətircəmliyində artmanın hasil olduğunu, bununla da yaxınlıq və məqamda artmanın hasil olduğunu əsas gətirmişlər.Onlardan bəzisi isə ondan bunu bəyənmədiyini nəql etmişlər.İbn Abidin demişdir: Lakin burada imamdan nəql edilənlər onun seçdiyi sözə müxalifdir:Əbu Hanifə demişdir: Bir kişinin: Mənim imanım Cəbrayılın imanı kimidir,-deməsini bəyənmirəm.Lakin belə desin:Cəbrayılın iman gətirdiyinə iman gətirdim." Bitdi.Həmçinin Əbu Hanifə "kitəbul alim va-l-mutəallim"də demişdir: "Bizim imanımız mələklərin imanı mislindədir.Çünki biz Uca Allahın təkliyinə, rübubiyyətinə və qüdrətinə, habelə Allah dərgahından gələnlərə mələklərin iqrar etdiyi və peyğəmbərlər və elçilərin təsdiq etdiyi mislində iman gətirmişik.Bu üzdən bizim imanımız mələklərin imanı mislindədir.Çünki biz mələklərin öz gözləri iləUca Allahın möcüzələrini görüb iman gətirdiyi hər bir şeyə görmədən iman gətirmişik.Daha sonra onlar imana və bütün ibadətlərə görə savab almaqda bizdən üstün cəhətlərə sahibdirlər."(haşiyətu ibn Abidin:3/274.əl-Bəhru-r-raiq:3/310).

Dedim: İbn Adiyy "əl-Kamil:7/9" kitabında Ğassən bin Fədldən gələn isnad vasitəsilə rəvayət edib demişdir: Həmməd bin Zeyd bizə təhdis edib dedi: Mən Əbu Hanifəyə dedim ki, Cabir, yəni əl-Cu`fi səndən rəvayət edir ki, sən: İmanım Cəbrayılın imanı kimidir,-demisən.O, dedi: "Mən bunu deməmişəm.Bunu deyən bidətçidir." Mən rəy sahibi olan Muhamməd bin Həsənə Həmməd bin Zeydin sözünü qeyd etdiyim zaman o, dedi: Həmməd doğru söylədi. Həqiqətən də, Əbu Hanifə bunu deməyi bəyənməzdi.Habelə Əli bin Ca`d rəvayət edib demişdir: Əbu Yusufun belə dediyini eşitdim: Əgər biri: İmanım Cəbrayılın imanı kimidir,-deyərsə o, bidət sahibidir." (əl-kəmil?7/145).Şeyxul-İslam demişdir: "Əbu Hanifənin əshabından bu mövzuya dair yazanlardan bəzisi qeyd etmişlər ki, Əbu Hanifə, Əbu Yusuf və Muhamməd, insanın: İmanım Cəbrayılın və Mikayılın imanı kimidir,-deməsini bəyənməmişlər. Muhamməd demişdir: "Çünki onlar yəqinlik baxımından daha fəzilətlidirlər.İmanım Cəbrayılın imanı kimidir yaxud imanım Əbu Bəkrin imanı kimidir yaxud bunun imanı kimidir sözünün əvəzinə belə desin: Cəbrayılın və Əbu Bəkrin iman gətirdiyinə iman gətirmişəm".(Məcmu`əl-fətəva:13/41)

Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) xəbər verdikləri kimi, onlardan bir qisminin cəhənnəmə daxil olacağını lakin onlardan heç kəsin orada əbədi qalmayacağını, mürtəd və qanı halal olmayacağını həm daxilən həm də zahirən iqrar edən böyük günah sahiblərinə dair islam ümmətinin fəqihləri arasında heç bir ixtilaf yoxdur."[558]

Bu nəqllərdən aydın olur ki, Şeyxul-İslam zahir ilə daxil arasında olan bağlılığı iqrar edən, habelə "ləzim"in yox olacağı təqdirdə "məlzum"un olmayacağını ifadə edən surətdə zahiri əməlin daxili imanın zəruri amili və ayrılmaz hissəsi olduğunu iqrar edənlə olan ixtilafın ləfzi ixtilaf olduğunu hesab edir. Lakin əməli bəzən daxil ilə bağlı bəzən isə ondan ayrı olan imanın səmərəsi görən şəxsə gəldikdə isə, heç şübhəsiz ki bu, Cəhmin sözünü deyənin görüşüdür.Onunla olan ixtilaf da heç şübhəsiz ki, həqiqidir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Onların camaatla olan ixtilafı yüngül bəzən isə ləfzi olur." Habelə demişdir: "Əhli sunnə arasında bu məsələyə dair olan ixtilafın çoxu ləfzi ixtilafdır." Habelə şeyxin digər sözləri.Murciələr təlazum fikrini desələr belə, bütün bu sözlər fəqih murciələrlə olan ixtilafın bəzi məsələlərdə həqiqi olduğunu göstərir.Bəzən şeyx onların istisnaya dair sözlərinə yaxud onlara görə ən fasiq insanın: İmanım Cəbrayılın imanı kimidir,-deməsinin caiz olduğuna işarə edir.

Onların istisnaya dair sözləri nəticəsində yaramaz məzhəb ortaya çıxmışdır.Bu da, istisna edənin imanında

---

[558] Məcmu`əl-fətəva:7/297.Habelə:7/575,18/271.

şübhə etməsi əsası ilə təkfir edilməsidir.Bu səbəbdən bəzi hənəfilər istisna edənlə evlilik həyatı qurmağı qadağan etmişlər.Lakin onlardan olan təhqiqçilər fərqli görüşdədirlər.

İbn Nuceym demişdir: "Rustəğfəni dedi: Əhli sunnə ilə mötəzilələr arasında evlilik etmək caiz deyil.əl-Fədl dedi: İnşallah mən möminəm,-deyənlə evlilik bağlamaq caiz deyil, çünki o, kafirdir.Nəticə etibarı ilə şafiilərlə evlilik bağlamaq qadağan edilmişdir.Bu məsələdə bu cür ixtilaf edilmişdir. Bəziləri: Caizdir,-demiş, bəziləri: Onlardan qız almaq olar ancaq qız vermək olmaz,-demişlər."əl-Bəzəziyyə"də bunu əsaslandırmağa çalışıb demişdir: "Onları kitab əhli məqamına endirmək məqsədilə olar." Artıq biz "vitr və nafilələr bölümü"ndə bu məsələni izah edib: İnşallah mən möminəm,-deyən şəxsi təkfir etməyin yanlış olduğunu bildirmişik.Onların kafir olduqlarına dair sözləri imanında şübhə edib bu sözləri deyən şəxslərə aid etmək gərəkdir.Şafiilər isə heç də bunu demirlər.Bu səbəbdən, hənəfilər ilə şafiilər arasında evlilik bağlamaq heç şübhəsiz ki, caizdir.Mötəzililərə gəldikdə isə təməl olaraq onlarla evlilik qurmaq halaldır.Çünki doğru olan, qiblə əhlinin təkfir edilməməsidir.Artıq biz bunu imamlıq bölümündə imamlardan nəql etmişik."[559]

---

[559] əl-Bəhru-r-raiq, şərhu kənzi-d-dəqaiq:3/110.Fəthul qadir, ibn Huməm:3/231. Haşiyətu ibn Abidin:3/46. Maturudi məzhəbinin yayılmasından sonra hənəfilərin sözlərinin maturudilərin sözləri ilə qarışıq salındığına diqqət etmək gərəkdir.Nəticədə onların iman və küfr mövzusunda qeyd etdikləri furu` məsələlərin məhz ilk murciələrin dediyi sözlər olduğunu müəyyənləşdirmək çətin olur.

***Bir sözlə fəqihlərin irca təzahürü iki məsələni ehtimal edir*:**

***Birinci*: Zahir ilə daxil arasında olan bağlılığın isbat edilməməsidir.Bunu deyən şəxsin Əhli sunnə ilə olan ixtilafı həqiqi və əsaslı ixtilafdır.**

*İkinci*: **Zahir ilə daxil arasında olan bağlılığın isbat edilməsi və "ləzim"in yoxluğunun "məlzum"un yoxluğuna dəlalət etməsinin qəbul edilməsidir.Bunu deyən şəxsin Əhli sunnə ilə olan ixtilafının çoxu ləfzi ixtilafdır.Onun bidəti isə əməli iman anlamından çıxartmasıdır.Lakin bu etiqadı bidət deyil sadəcə söz və fe`l bidətidir.**

**Bu, kitablarının bir çox yerində apardığım araşdırma nəticəsində Şeyxul-İslamın bu məsələyə dair məzhəbinə dair qənaətə gəldiyim görüşdür.**

**Əhli sunnə ilə fəqih murciələr arasında ixtilafın formal olduğunu deyənlərdən biri də:**

**Tahaviyyənin şərhçisi ibn Əbul İzz əl-Hənəfidir.Belə ki, ibn Əbul İzz (rahiməhullah) demişdir: "Əbu Hanifə ilə Əhli sunnədən olan digər imamlar arasında olan ixtilaf formal ixtilafdır.Bədən əməllərinin qəlb imanının zəruri amili yaxud imanın bir hissəsi olması, eyni zamanda böyük günah sahibinin imandan çıxmayacağına və həmin şəxsin Allahın məşiəti altında olacağına, istəsə onu əzaba düçar edəcəyinə istəsə bağışlayacağına dair yekdilliyin olması: Etiqadın fəsada uğraması ilə nəticələnməyən ləfzi ixtilafdır."[560]**

---

[560] Şərhu-t-tahaviyyə:2/508.

Bu sözlər, bədən əməllərinin qəlb imanının zəruri amili olduğunu iqrar edəcəkləri təqdirdə həmin murciələrlə ixtilafın ləfzi olacağına dair Şeyxul-İslamın qeyd etdiyinə tamamilə uyğun gəlir.

Habelə onlardan biri: Hafiz əz-Zəhəbidir.O, demişdir: "Mə`mər dedi: "Mən Hamməd̆ə dedim: Sən əshabın içində başçı və imam olmusan.Sonralar onlara müxalif olub ardıcıllardan birinə çevrildin.O, dedi: Haqqın ardıcılı olmağım mənə batildə başçı olmağımdan daha xeyirlidir.

Dedim: Mə`mər burada fəqih murciələrin ircasına keçdiyinə işarə edir.Onlar isə namazı və zəkatı imandan saymırlar.Onlar deyirlər: "İman, dil ilə iqrar və qəlb ilə yəqinlikdir.Buna dair, ixtilaf inşallah ləfzi ixtilafdır. Murciəlikdə aşırıya varanlar yalnız bunu deyən şəxslərdir: Tövhid olan yerdə fərzlərin tərk edilməsi zərər verməz. Allahdan salamatlıq diləyirik."[561]

## *Bəzi alimlər ixtilafın həqiqi və əsaslı oduğunu bildirmişlər:*

Şeyx ibn Bəz (rahiməhullah) məşhur əqidəsində Tahavinin sözünə əlavə edərək demişdir: (İman, dil ilə söz və qəlb ilə təsdiqdir.) "Bu tərif, mübahisəli və qüsurludur.Əhli sunnə vəl cəmaatın, üzərində olduğu doğru görüş imanın söz, əməl və etiqad olması, habelə itaətlə artıb asiliklə azalmasıdır. Quran və sunnədən buna dair dəlillər çərçivəyə salınmayacaq qədər çoxdur.Artıq kitabın şərhçisi ibn Əbul İzz bir sıra dəlilləri qeyd etmişdir.İstəsən müraciət edə

[561] Siyəru ə`ləmi-n-nubələ:5/233.

bilərsən.Əməlin imandan çıxarılması isə murciələrin sözüdür.Onlarla Əhli sunnə arasında olan ixtilaf ləfzi deyil, həm ləfzi həm də mənanı şamil edən ixtilafdır.Əhli sunnə və murciələrin sözlərini götür qoy edən şəxs bilir ki, bunun nəticəsində bir çox əhkamlar ortaya çıxır. Vallahul mustəan".[562]

Şeyx Albani (rahiməhullah) Tahavinin sözlərinə əlavə edərək demişdir: "Bu, sələfin və Malik, Şafii, Əhməd, Əuzai və digərləri kimi imamların cumhuruna müxalif olan hənəfi və maturudilərin məzhəbidir.Çünki bunlar (sələf alimləri) iqrar və təsdiqə bədən əzaları ilə əməli əlavə etmişlər.

Əslində isə şərhçinin etiqad etdiyi kimi iki məzhəb arasında olan ixtilaf formal ixtilaf deyil.Onun əsası gətirdiyi isə, hər iki məzhəbin böyük günah sahibinin imandan çıxmayacağına və Allahın istəyi altında olacağına, istəsə əzab verəcəyinə istəsə isə bağışlayacağına yekdil olmalarıdır.Bu yekdillik doğrudur. Ancaq əgər hənəfilər cumhur alimlərə, əməlin imandan olmasını inkar etməklə həqiqi müxalif olmasaydılar imanın artıb azalmasına, onun itaətlə artmasına və asiliklə azalmasına dair onlarla yekdil olardılar.Çünki buna dair Quran, sunnə və sələfi əsərlərdən bir çox dəlillər vardır.Artıq şərhçi onlardan bir sıra gözəl dəlilləri qeyd etmişdir.Ancaq hənəfilər imanın artıb azalmasına dair bu açıq-aydın dəlillərə müxalif olan sözün üzərində israrla durmuş və həmin dəlilləri yozmaqda aşkar, üstəlik deyərdim ki, batil sün`ilik nümayiş etdirmişlər.

---

[562] ət-Tə`liq alə-t-tahaviyyə, dımnə məcmu`əl-fətəva va məqaləti-ş-şeyx ibn Bəz:1/265.

Şərhçi buna nümunə göstərib xəbər vermişdir ki, Əbu Muin ən-Nəsəfi bir çox hədis imamı üçün hüccət olan "iman yetmiş və bir neçə şöbədən ibarətdir" hədisinin səhihliyini şübhə altına qoymuşdur.Hədis imamlarından: Buxari və Muslim səhih kitablarında həmin hədisi qeyd etmişlər. Habelə bu hədis "əs-sahiha:1769" kitabında nəql edilmişdir. Buna səbəb isə yalnız bu hədisin onların məzhəbi ilə ziddiyət təşkil etməsi olmuşdur.

Belə olan halda, qeyd edilən ixtilafın formal olduğunu demək nə dərəcədə doğrudur? Onlar ən günahkar birisinin: Mənim imanım Əbu Bəkr əs-Siddiqin, üstəlik peyğəmbərlər və elçilər, Cəbrayıl və Mikayılın imanı kimidir,-deməsini caiz görürlər.Onlar həmin bu məzhəblərinə əsasən hətta ən fasiq və günahkar birisi olsa belə insanın: İnşallah mən möminəm,-deməsini caiz görmür və onun: Mən həqiqi möminəm,-deməsini vacib görürlər.Uca Allah buyurur: *"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar, yalnız öz Rəbbinə təvəkkül edər, namaz qılar və Bizim onlara verdiyimiz ruzidən (Allah yolunda) xərcləyərlər.Həqiqi möminlər onlardır".*[563] *"Sözündə Allahdan daha doğruçu kim ola bilər?"*[564]

Bütün bunların nəticəsində onlar təəssübkeşlikdə həddi aşıb qeyd etmişlər ki, əgər biri imanında istisna edərsə kafir olar. Habelə bu qaydaya əsasən hənəfinin şafiilərlə evlilik həyatı qurmasının caiz olmadığını demişlər.Onlardan bəzisi

---

563əl-Ənfəl:2-4.
564ən-Nisa:122.

bir qədər yumşaqlıq göstərib iddia etmişdir ki, onlardan qız almaq olar əksi isə qadağandır.Bunu deyənlər isə onları kitab əhlinin məqamına endirmişlər.Hənəfi şeyxlərindən bir şəxsi tanıyıram.Belə ki, şafii şeyxlərindən biri onun qızına elçi düşdüyü zaman o, qızını ona verməkdən imtina edib belə demişdir: "Hayıf ki, sən şafiisən." Məgər bundan sonra ixtilafın həqiqi olması haqqında şübhə yeri qala bilərmi? Bu məsələni geniş öyrənmək istəyən şəxs Şeyxul-İslam ibn Teymiyyənin "əl-İmən" kitabına müraciət etsin.Çünki həmin kitab bu mövzuya dair yazılan ən xeyirli təlifdir."[565]

[565] əl-Aqidətu-t-tahaviyyə, şərh va tə`liq:42-ci səh.Şeyxul-İslamın bu məsələyə dair məzhəbi az öncə qeyd edilmişdir.

# YEDDİNCİ FƏSİL

## Müasir irca fikrinin xüsusiyyətləri

Üç araşdırmadan ibarətdir:

1-Murciələrə nisbət olunan sözə dair: İmanla birgə günah zərər verməz.

2-Sələfdən bəzisinin dediyi sözə dair: Hər kim imanın söz və əməl olduğunu, habelə artıb azaldığını deyərsə ircadan uzaqlaşmış olar.

3-Əsrimizdə deyilən irca məzmunlu sözlər.

# Birinci araşdırma:

## Murciələrə nisbət olunan sözə dair:

## İmanla birgə günah zərər verməz

Bir çox insanların dilində məşhurlaşan sözlərdən biridə, murciələrin növbəti sözləri deyən firqə olmasıdır: Küfr ilə birgə itaət fayda vermədiyi kimi həmçinin imanla birgə günah zərər verməz.Bu sözlər Yunusiyyə[566] kimi bəzi murciələrə nisbət olunsa belə elm əhlindən bu sözləri deyən və bu görüşdə olan şəxs məlum deyil. Bu sözün Muqatil bin Süleymana nisbət edilməsi isə onun adından deyilən yalandır.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Aşırıya varmış murciələrin növbəti sözləri demələri qeyd olunur : "Tövhid əhlindən heç kəs atəşə girməyəcək." Ancaq biz elmə mənsub olan məşhur şəxslərdən kiminsə bu sözləri deməsini və həmin sözlərin ondan qeyd edilməsini bilmirik."[567]

Habelə demişdir: "Ola bilsin ki: Tövhid əhlindən heç kəs atəşə girməyəcək,-sözləri, aşırıya varmış murciələrin sözü olsun.Ancaq mən müəyyən bir şəxsdən bu sözlərin nəql edildiyini bilmirəm.İnsanlar yalnız bunu kitablarda xəbər verir, ancaq onu deyəni qeyd etmirlər.Ola bilsin ki, bu sözlər, ümumiyyətlə Allah qatında heç bir payı olmayan şəxs tərəfindən deyilsin.Çünki bir çox fasiq və münafiqlər

---

[566] Şərhul məvaqif, əl-Cərcani:4/428.

[567] Məcmu`əl-fətəva:7/486.

deyirlər: İman yaxud tövhidlə birgə günah zərər verməz. Murciələrə rəddiyə verənlər, bəzi sözlərində onları bu tərzdə vəsf etmişlər."[568]

Bu sözün rəvac tapmasında gizli olan təhlükə, bir çox insanın bu sözdən özünü kənar tutacağı təqdirdə ircadan kənar qalacağını zənn etməsidir.Habelə bəziləri zənn etmişlər ki, Quranı oxuyan, sunnəyə nəzər yetirən və təhdid nassları ilə müəyyən tanışlığı olan hər hansı bir şəxsin irca şübhəsinə düşməsi mümkün deyil və irca fikri batilliyi aşkar olan çox zəif bir sözdür.Çünki tövhid əhlinin günah səbəbilə atəşə girməsi istisna olunmur və bu, zəruri elmi ifadə edən mütavatir xəbərlərdə varid olmuşdur.

Heç şübhəsiz ki, əgər irca bu zəif söz çərçivəsindən kənar çıxmasaydı Talq bin Habib, Zərr bin Abdullah, Hamməd bin Əbu Süleyman, Əbu Hanifə bin Numan, iki görüşün birində Əbul Həsən əl-Əşari, Əbu Mansur əl-Məturidi və onlara tabe olan əşari və maturudilər kimi bir çox abidlər, zahidlər, fəqih və tədqiqçilər bu görüşü seçməzdilər.Habelə onların arasında bir çox hənəfi, maliki, şafii və bəzi hənbəlilər vardır.

İrcanın gerçəyi və onun sözlərindən bilgisiz olmaq onun yayılıb geniş vüsət almasına və bir çox sonrakilərin bu sözü mənimsəməsinə gətirib çıxarmışdır.Murciələrin bəzi sözlərini müdafiə etməsinə rəğmən onların sözlərindən uzaq olduqlarını bildirən öncəkilər tək hazırki zamanda hədis və

[568] Məcmu`əl-fətəva:7/181.Şərhu-l-Əsfahaniyyə:182-ci səh.

sunnəyə mənsub olan bəzi şəxslər həmçinin murciələrin şübhələrinə tutulmuşlar.

Qeyd etdiklərimi əsaslandırmaq üçün aşağıda göstərilən bəzi sözləri oxucunun diqqətinə çatdırıram:

1-Mullə Əli əl-Qari Əbu Hanifəni müdafiə edərək demişdir: "Bidət əhlindən olan yaramaz murciələr qədərilərdən deyillər.Onlar bu sözləri deyən tayfadır: Küfr ilə itaət fayda vermədiyi kimi həmçinin imanla birgə günah zərər verməz. Onlar müsəlmanlardan hər hansı birinin böyük günahlardan ötrü heç bir şeyə görə cəzalanmayacağını iddia etmişlər.Elə isə haradadır bu irca? Əbu Hanifənin sözləri Quranın nassına tamamilə uyğundur. Uca Allah buyurur: *"Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa (günahları) isə dilədiyi kimsəyə bağışlayar."*[569]Bu isə, küfrdən savayı günahları Allahın məşiəti altında etməyən murciələrin sözlərinə müxalifdir. Sonra bil ki, murciələrin məzhəbinə görə cəhənnəm əhli cəhənnəmə girəcəkləri zaman, balıq suda qaldığı kimi orada əzab çəkmədən qalacaqlar.Bu işdə kafir ilə mömin arasında yeganə fərq isə mömінin cənnətdə yeyib içib həzz almasıdır, atəş əhlinin isə yeyib içib həzz almamasıdır.Bu söz, Quran, sunnə, Əhli sunnə vəl cəmaatdan və bidətçilərdən olan ümmətin icması ilə batildir."[570]

---

[569] ən-Nisa:48.Müəllif burada demək istəyir ki, Əbu Hanifə böyük günah sahibinin işini Allahın istəyinə buraxması səbəbilə murciə adlandırılmışdır. Bunu həmçinin bu sözlərdən bir neçə sətir öncə əl-Qunəvi nəql etmişdir.

[570] Şərhul fiqhil əkbər:104-cü səh.

2-Əbul Bəqa əl-Kəfavi demişdir: "Murciələr böyük günah sahibinin ümumiyyətlə əzaba düçar edilməyəcəyinə hökm verən firqədir.Onlara görə əzab kafirlər üçündür. Mötəzililər isə qəti şəkildə cəzanın hasil olmasını deməyib işi Uca Allaha həvalə etmişlər.Haqq əhlinin görüşünə uyğun olaraq Allah istəsə "irca" etibarlı ilə onları bağışlayar.Bu işdə "irca", yəni işin təxirə salınması və savab yaxud cəzanın olmasına qəti əmin olmamaqdır.Məhz bu əsasla Əbu Hanifə murciələrdən hesab edilmişdir."[571]

Dedim: Sunnəyə müxalif etiqadın olmasına rəğmən bu zənn, həmin şəxsləri Əbu Hanifəni ircadan uzaq tutmağa sövq etmişdir.Əbu Hanifə isə imanın yalnız iqrar və təsdiq olduğunu və imanın artıb azalmadığını açıq bildirmişdir.

3-Şeyxul-İslam ibn Salahın sözlərinə əlavə edərək demişdir: "Habelə iman adı, bu hədisdə açıqlanan islamı və digər itaətləri imanın özəyi olan daxili təsdiqin səmərəsi, habelə gücləndirən, tamamlayan və qoruyan amilləri olması etibarı iləşamil edir."

Bir şəxs: "İtaətlər daxili təsdiqin səmərəsidir",-dediyi zaman iki şey qəsd edilir:

Onun zəruri amilləri olması qəsd edilir.Bu halda daxili iman olacağı zaman o, həmçinin olacaq.Bu, sələf və Əhli sunnənin məzhəbidir.

Habelə bu sözlə daxili imanın bəzən səbəb olması qəsd edilir.Bəzən o, mövcud olmadığı halda daxili iman tam və

---

[571] əl-Kulliyyət:350.

kamil olur.Bu, cəhmiyyə və qeyrilərindən olan murciələrin sözüdür.Artıq qeyd etmişik ki, onlar üç yöndən yanlışlıq etmişlər...”

Nəhayət demişdir: “Sonrakıların bir çoxu sələfin məzhəbi ilə murciə və cəhmilərin sözlərini ayırd edə bilmirlər.Buna səbəb iman məsələsinə dair daxilən cəhmilər və murciələrin görüşündə olan bir çoxlarının öz sözlərində bir sözü digəri ilə qarışıq salmalarıdır.Həmin şəxs sələfi və hədis əhlini yüksək tutur və düşünür ki, o onların sözlərini bir yerə toplayır yaxud özü kimilərin sözləri ilə sələfin sözləri arasında cəm edir.”[572]

Bu isə, qarışıqlıq baş verməsin deyə murciələrin sözlərini araşdırmağın və onu Əhli sunnənin sözlərindən ayırd etməyin önəmini bəyan edir.

---

[572] Məcmu`əl-fətəva:7/361-364.

# İkinci araşdırma:

## Sələfdən bəzisinin dediyi sözə dair:

## Hər kim imanın söz və əməl olduğunu, habelə artıb azaldığını deyərsə ircadan uzaqlaşmış olar

Bu, çox faydalı, sələfi ifadədir.Bu sözlər bir sıra imamlardan nəql edilmişdir.Onlardan biri Əbu Abdullah Əhməd bin Hənbəldir.Xalləl İsmail bin Səiddən belə rəvayət etmişdir: Mən Əhməddən: İman artır və azalır,-deyən şəxs haqqında soruşdum.O, cavab olaraq dedi: Beləsi ircadan uzaqdır."[573]

Bərbahəri (rahiməhullah) demişdir: "Hər kim, iman söz və əməldir, habelə artır və azalır deyərsə əvvəli və sonu daxil olmaqla bütövlüklə ircadan çıxmış olar."[574]

Lakin iman və küfr mövzusuna dair sələfin sözü ilə murciələrin sözləri arasında qarışıqlıq salan bəzi saxta elm tələbələri bu ifadə ilə qürrələnmişlər.Belələri imanın söz və əməl, habelə artıb azaldığını iddia etdikdən sonra demişlər: İnsan söz yaxud əməl ilə, habelə əməli tərk etməklə kafir olmaz.Bu, sələfin sözünə qarşı olan ən böyük müxaliflikdir.

Heç şübhəsiz ki, adı çəkilən ifadə doğrudur.Lakin onun doğru olması həmin ifadəni deyənin anlayışına uyğun şəkildədir.Belə ki, əməl, söz və etiqad imanın dayağlarıdır

---

573 əs-Sunnə, əl-Xalləl:3/582_1009-cu rəqəm.

574 Şərhu-s-sunnə, əl-Bərbəhəri:123-cü səh.

və onlardan biri digərsiz yetərli deyil.Qaldı ki, bu sözləri deyib bədən əzaları ilə əməli imanın dayağı görməyən yaxud bunu deyib küfrü təkzib etmə və halallaşdırma amilləri çərçivəsinə salan şəxsə, beləsi sələfin imanın tərifinə dair dediyi sözü sələfin qəsd etmədiyi şəkildə dilə gətirmişdir.Məhz bu səbəbdən elm əhli, görüşlərini imanın söz və əməl olması, habelə artıb azalması üzərinə qurmalarına rəğmən irca məzhəbinə çağıran bəzi kitablardan çəkindirmişlər."[575]

Araşdırmanın müqəddiməsində bidətlərin tərəqqisinə, habelə sonraki əşarilərin məzhəbində olduğu kimi bəzi murciələrin imanın artıb azaldığını və əməlin imanın kamillik şərti olduğunu deməsinə və eyni zamanda küfrü danma və təkzib etmə çərçivəsinə salmasına toxunmuşam. Məgər kimsə imam Əhməddən yuxarıda nəql edilən sözləri dəlil gətirib həmin şəxslərin ircadan uzaq olduqlarını deyə bilər?[576]

Daha aydın olması üçün belə deyiləcək: Murciələrdən belə deyənlər tapılmışdır: İman söz və əməldir!

İmam Harb əl-Kirmani (rahiməhullah) demişdir: "İshaqın belə dediyini eşitdim: İddia etmişlər ki, irca sözünü danışan ilk şəxs Həsən bin Muhamməd bin Hanəfiyyə olmuşdur. Bunun ardından murciələr aşırıya varıb belə demişlər: Bir

---

[575] Mulhaqu-l-vasitiyyə, şeyx Ulvi bin Abdul-Qadir əs-Səqqaf:365-ci səh.Şərhul vasitiyyəlil-Harras kitabı ilə birgə çap edilmişdir.Habelə "təhziru əhlil ilm minəl kutubi-d-dəiyəti lil-irca"ya bax.

[576] Murciələrdən bəzisi demişdir: İman hissələrə bölünür və iman əhli bir-birindən iman cəhətdən üstün olurlar." Bu, Muhamməd bin Şəbibin əshabının məzhəbidir.(məqalətul isləmiyyin:1/218.məcmu`əl-fətəva:7/546)

tayfa belə deyir: Əgər biri fərz namazlarını, Ramazan orucunu, zəkatı, həcci və bütün fərzləri, həmin şeyləri danmadan tərk edərsə biz onu təkfir etməyəcəyik və onun işi Allaha aid olacaq.Çünki həmin şəxs iqrar edir.Heç şübhə yoxdur ki, bunlar murciələrdir.Onlar isə bir neçə növdür:

Onlardan bir qismi: Biz qəti olaraq möminik,-deyir və bunun Allah qatında olduğunu demirlər.Habelə onlar imanın söz və əməl olduğunu hesab edirlər.Bunlar murciələrin ən nümunəvi firqəsidir.

Onlardan bir tayfa belə deyir: İman sözdür, əməl isə onu təsdiq edir.Lakin əməl imandan deyil.Bununla belə əməl fərzdir, iman isə sözdür.Onlar deyirlər: Bizim yaxşı işlərimiz məqbuldur və biz Allah qatında möminik.Bizim imanımız və Cəbrayılın imanı birdir.Bunlar hədisdə gəldiyi kimi peyğəmbərlərin dili ilə lənətlənmiş murciələrdir."[577]

Murciələrdən olan bu tayfa: İman söz və əməldir,-deyirdilər, lakin bu onları ircadan çıxartmadı.

İmanın söz və əməl olduğunu demək, yəni hər iki şeyi isbat etmək məsələsində Əhli sunnə arasında heç bir ixtilaf yoxdur.

*Birinci*: Əməl olmadan söz səhih və yetərli olmur.Bunu sələf imamları açıq bildirmişlər.Habelə bu məsələyə dair icma vardır.Üçüncü bölümdə buna dair izah gələcək.

[577] Məsəilul iməm Əhməd bin Hənbəl va İshaq bin Rahuyə.Harb əl-Kirmaninin rəvayəti:377-ci səh.

*İkinci*: Küfr, etiqad və tərk etmə ilə olduğu kimi söz və əməl ilə olur.Artıq bu məsələ dəlilləri ilə bəyan edilmişdir.

Buna yaxud bunun bəzisinə müxalif olan şəxs, əksini iddia etsə belə Əhli sunnəyə müxalif murciələrə isə müvafiq olacaq.

Bu, növbəti sözləri deyən şəxslər haqqında deyilə bilər: İman söz və əməldir, habelə o, artır və azalır.Daha sonra həmin şəxs müsəlmanları təkfir edib onların qanı və malını halal edir. Beləsi, əksini iddia etsə belə xəvariclərə müvafiq Əhli sunnəyə isə müxalif olur.Bu mövzuda sunnəyə uyğun sözlərə tabe olmaq vacib olsa belə əsas tutulan ləfz və ifadələr deyil həqiqətlər və mənalardır."[578]

İshaqın murciələrin aşırıya varmasına və onların bütün fərz əməllərini tərk edənin müsəlman olduğunu iddia etmələrinə dair qeyd etdiyi sözləri, günümüzdə bəzi müasirlərin ağız dolusu danışdığı və bunun sələfin görüşü olduğunu iddia etdiyi məsələdir.

Əslində isə bəzi insanlar Əhli sunnənin sözü ilə digərlərin sözləri arasında qarışıqlıq salmışlar.Onlar ordan-burdan sözləri qapıb iki təzadlı fikiri cəm etməyə çalışır və hikmətsiz şəkildə sözlər arasında qarışıqlıq salırlar.Bunun nəticəsində onlar bu cür sözlər ortaya qoymuş olurlar:

1-İman dil ilə söz, qəlb ilə etiqad və bədən əzları ilə əməldir. Lakin küfr bədən ilə deyil yalnız qəlb ilə olur.

---

[578] Yuxarida qeyd edilmişdir.

2-İman söz və əməldir.Əməli qüdrət və imkan olan yerdə bütövlüklə tərk edən şəxs müsəlman və tövhid əhlidir.

3-İman söz və əməldir.Küfr həmçinin söz və əməl ilə olur.Lakin müəyyən şəxs yalnız küfrü etiqad edəcəyi yaxud qəsd edəcəyi yaxud halal sayacağı zaman kafir olacaq, habelə elm və sunnə əhlinin yoluna müxalif olan cəhalət və saxta elmdən doğan digər sözlər.

Şeyx Salih əl-Fəuzan (hafizahullah) Əhli sunnənin sözü ilə başqalarının sözləri arasında qondarılmış bu saxtalığa toxunaraq demişdir: " Həmçinin günümüzdə peydə olan beşinci firqə vardır.Onlar deyirlər ki, əməllər imanın vacib kamilliyi yaxud müstəhəb kamilliyi üçün şərtdir."[579]

Habelə şeyx demişdir: "Bu isə növbəti sözləri deyənin batilliyini göstərir: Əgər biri küfr söz deyər yaxud küfr əməl edərsə dediyini və etdiyini qəlbi ilə etiqad etməyincə kafir olmaz.Habelə: Cahil, soruşmaq və öyrənmək imkanı əldə edərsə belə mütləq şəkildə üzürlüdür,-deyən şəxs.Bu, zamanımızda özlərini elm və hədisə nisbət edən bəzi şəxslər tərəfindən ortaya atılan sözdür."[580]

Habelə şeyxə sual verib demişlər: Bu söz duğrudurmu: Əgər biri: İman söz, əməl və etiqaddır və o, artıb azalır,-deyərsə küfrün yalnız etiqad və danma ilə olacağını desə belə murciəlikdən bütövlüklə kənar olacaq?

Şeyx cavab verib demişdir: "Bu, zidiyyətdir.Çünki əgər bir şəxs: Küfr yalnız etiqad yaxud danma ilə olur,-deyərsə

[579] ət-Tə`liqul muxtəsar aləl qasıdəti-n-nuniyyə:2/647.
[580] Şərhu kəşfi-ş-şubuhat:55-ci səh.

bu, onun iman dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməldir sözü ilə ziddiyyət təşkil edəcək.

Çünki imanın dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməl olması, habelə imanın itaətlə artıb günahlarla azalması, əməlləri birdəfəlik tərk edənin mömin olmayacağını ifadə edir. Çünki iman bu şeylərin toplumudur və onun sadəcə bir qismi kifayət etmir.Habelə küfr danma ilə məhdudlaşmır.Danma yalnız onun növlərindən biridir.Küfr dil, əməl, etiqad və şübhə ilə olur. Alimlər bunu məhz belə qeyd etmişlər.Buna dair fiqh kitablarında mürtədin əhkamları bölümünə bax."[581]

[581] Məsəilu fil imən.Sual-cavabları toplayan: Abdur-Rahmən Muhamməd əl-Hərafi: 23-cü səh.

# Üçüncü araşdırma:

## Əsrimizdə deyilən irca məzmunlu sözlər

Bidətlərin tərəqqi etdiyinə və onun azğınlığa aparan müxtəlif yeni forma və surətlər ortaya çıxartdığına dair yuxarıda qeyd edilənlərə əlavə olaraq, şeytanın oyuncağına çevrilmiş murciələrin sözlərindən iman əhlini çəkindirmək arzusu ilə mən, yaşadığımız dönəmdə elm əhlinin, həmin sözlərin Əhli sunnəyə müxalif olan murciələrin sözlərindən olduğuna əminlik ifadə etdikləri bəzi irca məzmunlu sözləri nəql edəcəm:

1-İman təsdiq və iqrardır.Bu, fəqih murciələrin məzhəbidir. Maturudilər və əşarilərdən bir qrup insan bu görüşü seçmişlər. Habelə bu, bir çox tədris ocaqları və universitetlərdə tədris edilir.

2-İman yalnız təsdiqdir. Dil ilə söz isə dünya əhkamlarının icrası üçün şərtdir. Əgər biri qəlbi ilə təsdiq edər lakin imtina etmədiyi halda heç bir əməl etməzsə mömin və Allah qatında xilas olanlardan olar.Bu, əşari və maturudilərin etimad göstərdikləri görüşdür.Bu, fəqih murciələrin sözündən daha yaramaz sözdür.Doğrusu bu, Cəhmin məzhəbidir.Ancaq onların sonraki alimləri itaət və boyun əymə kimi qəlb əməllərini isbat edir və bunu təsdiqin mahiyyətinə daxil edirlər.

3-İman, bədən əzalarını çıxmaqla qəlb ilə təsdiq və qəlb ilə əməldir.Şeyxul-İslamın qeyd etdiyi kimi bu, Cəhm və ona müvafiq gələnlərdən başqa bütün murciələrin sözüdür.

4-İman artmır və azalmır.Bu, ilk murciələrin sözüdür. Günümüzdə olan maturudilərin çoxu bu sözü deyir.

5-Küfr, təkzib etmə və danmadır.Sözlər və əməllərdən heç bir şey isə özlüyündə küfr deyil.Sadəcə şəriət bəzi söz və əməlləri küfrün əlaməti etmişdir.Bu, Əbul Həsən, Salihi, ibn Ravandi və Bişr əl-Mirrisinin görüşüdür.Habelə bu, qeyd edildiyi kimi əşari və maturudilərin sözüdür.[582]

Bundan daha yaramaz olanı isə bəzi müasirlərin küfr söz deyən yaxud küfr əməl edənin kafir olmayacağını deməsidir. Çünki birincilər belə deyirdilər: Əməl və söz küfrün əlaməti olur və bundan irəli gələrək həmin şəxslərə etdikləri əməl yaxud dedikləri söz müqabilində axirət əhkamlarında deyil dünya əhkamlarında küfr hökmü çıxarılır.Sonrakilər isə beləsinə nə axirət nə də ki, dünya əhkamlarında küfr hökmü vermirlər. Bu isə mürtədlik cəzasını ləğv etməyi ifadə edir.Lakin digər yöndən həmin sonrakilərin sözü qədim murciələrin sözlərindən daha yüngüldür.Çünki bunlar əməli mütləq iman anlamına daxil edirlər.Qədim murciələr isə əməli mütləq iman anlamına daxil etmirdilər."[583]

6-Küfr yalnız qəlbdə olur.Lakin o, təkzib etmə ilə məhdudlaşmır.Ora həmçinin təkəbbürlük, itaətsizlik,

---

[582] Məqalətul isləmiyyin:1/214,222.

[583] Haqiqətul imən va bidəul irca fil qadim val hadis,Sa`d bin Nasir əş-Şisri:23-cü səh.

sayğısızlıq, düşmənçilik, nifrət kimi qəlb əməlinə zidd olan şeylər daxil olur.Bu, Yunus əs-Səmri və Əbu Muaz ət-Tuməninin ardıcılları mislində olan bəzi murciələrin sözüdür.[584]

7-Küfr yalnız etiqad ilə olur.Onlar etiqad dedikdə: Təkzib etmə və halal saymanı qəsd edirlər.Bu isə, əşari və maturudilərin öncə qeyd edilən sözünə qayıdır.Habelə bu, aşırıya varmış sufilərin sözlərindən olub onların növbəti sözləri ilə vəhdət təşkil edir: Ölülərə dua etmək, qurban kəsmək və nəzr vermək, yalnız onların müstəqil şəkildə fayda və zərər verdikləri etiqad ediləcəyi zaman küfr olur.

8-Küfr söz və əməl ilə olur.Lakin müəyyən şəxs yalnız küfrü etiqad edəcəyi zaman təkfir edilə bilər.Bu, təkfirdə etiqadı şərt qoymaq üçün aşkar hiylədir.Bu sözlə küfrün yalnız etiqad ilə olacağını deyən söz arasında heç bir fərq yoxdur və bu, qeyd edildiyi kimi murciələrin məzhəbidir. Çünki küfrü etiqad etmək özlüyündə küfrdür.Əgər müxalifə görə söz yaxud əməl küfr olsaydı o, başqa kafirlik amilinin varlığına ehtiyac duymazdı.Çünki həmin şəxsin onu şərt qoyduğu halda onu qeyd etməsi önəmsiz söz olardı.

9-Əgər biri Uca Allahı yaxud Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söyərsə yalnız bunu halal görəcəyi təqdirdə kafir olacaq.Bu, Qadı Əbu Yalə kimi bəzi fəqihlərin görüşüdür. "Bu çuxura düşənlər, yalnız sonraki kəlamçılardan olan tayfanın, ilk cəhmiyyənin məzhəbindən tutunan şərəfsiz cəhmiyyələrin bəzi sözlərini mənimsəməsi səbəbilə ora

[584] Məqalətul isləmiyyin:1/214,222.

düşmüşlər.Onlar demişlər ki, dil sözü ilə bir arada gəlməyəcəyi, habelə qəlbdə və bədən əzalarında əməli tələb etməyəcəyi halda belə iman, qəlbdə olan adi təsdiqdir."[585]

10-Allahı söymək, bütə səcdə etmək və ölülərə dua etmək kimi sözlü və əməli küfr işlərə görə təkfir etmək məsələsində halallaşdırmanı şərt qoymaq.Bu sözün gerçəyi, küfrü etiqad çərçivəsinə salmaqdır.Bunun açıqlaması isə, əgər biri bunu deyərsə küfr olan söz və əməlləri, zina və şərab içmək kimi asiliklər məqamında etmiş olacaq və onun varlığını təkfirdə təsirsiz edəcək.Təsir edici qüvvə isə onun halal olduğunu etiqad etməkdir.Nəticədə bu iş, küfrü etiqad çərçivəsinə salmağa gətirib çıxarır.

11-Hər hansı bir şəxs küfrü qəsd edib, onu istəməyincə və ona razı olmayınca kafir olmur.Bu, qeyd edildiyi kimi Quran, sunnə və icmaya müxalif sözdür.Nəticədə bu, küfrü qəlb çərçivəsinə salmaqdır.Bu, murciələrin məzhəbidir. Onların bir qismi isə belə deyir:

12-Küfr, söz və əməl ilə olur lakin küfrün şərtlərindən: Küfrü qəsd etməkdir.Heç şübhəsiz ki, həmin sözü deyən öncə deyilən sözə qayıdır.Çünki əgər söz özlüyündə küfr olsaydı digər küfr amilinə, yəni küfrü qəsd etməyə yaxud istəməyə ehtiyac olmazdı.

13-Küfr, söz və əməl ilə olur lakin əgər biri bunu tamah yaxud dünya mənfəəti səbəbilə edərsə kafir olmaz.Bu, öncəkinin mislindədir.Çünki onun gerçəyi, küfrü etiqad etməyi yaxud onu qəsd etməyi şərt qoyması və bunu təkfiri

585 əs-Sarimul məslul:3/960.

vacib edən amilə çevirməsidir.Artıq bu sözün batilliyi bəyan edilmişdir.

14-Bütövlüklə zahiri əməli tərk etmək küfr deyil.Bu, Sufyan və İshaqın bildirdikləri kimi murciələrin sözüdür. Onların bu sözü, zahir ilə daxil arasında olan bağlılığı inkar etməsi və bədəndə izləri üzə çıxmadan imanın qəlbdə bərqərar olmasını zənn etməsi üzərində qurulmuşdur.Bu məsələyə dair geniş söhbət açılacaq.Artıq fətvalar üzrə daimi komitə, bütün zahiri əməlləri tərk edənin müsəlman olması hökmünü verən bəzi kitablardan çəkindirmiş və bunu əməli imanın gerçəyindən çıxartması kimi qəbul etmiş, habelə bunun murciələrin məzhəbi olduğunu hesab etmişdir. Həmin sözlərdən misal olaraq onların belə deməsidir:

15-Bədən əzaları ilə əməl, imanın dayağı yaxud hissəsi yaxud səhihlik şərti deyil imanın kamillik şərtidir.Qeyd edildiyi kimi bu, əşarilərin məzhəbidir.

16-Bədən əzaları ilə əməl, imanın dayağıdır lakin onu heç bir üzr olmadan bütövlüklə tərk edən Allahın məşiəti altında olan müsəlmandır.Bu və bundan öncəki söz arasında yalnız ləfz fərqliliyi vardır.Artıq daimi komitə, görüşünü bu sözlər üzərində qurmuş bəzi kitablardan çəkindirmiş və həmin kitabların yaramaz murciələrin məzhəbinə çağırdığını hesab etmişdir.

17-Namazı tərk etmək küfr deyil.Çünki küfr, bədən əməli deyil sadəcə qəlb əməlidir.Çünki küfr yalnız qəlbdə olur.Bu, murciələrin sözüdür.Ancaq küfrün söz və əməl ilə olduğunu qəbul etməsi ilə bərabər nəzər yetirdiyi dəlillərə

etimad göstərərək namazı tərk edəni təkfir etməyən şəxs isə murciə deyil.[586]

*Bildiriş:*

Murciələrin sözləri haqqında qeyd edilənlər, bəzi hallarda irca fikrini bəyənməməsi və murciələri yamanlaması ilə birgə bir qism insanlara qaranlıq qalır yaxud elmə mənsub olan bəzi insanların həmin xətalara düşdüyü səbəbilə həmin şəxslər onlara təqlid edirlər.Bu səbəbdən qeyd edilən şeylərdən hər hansı birini etiqad edən hər bir şəxsin mütləq şəkildə murciə olduğunu demək olmur.Lakin deyilə bilər ki, həmin söz murciələrin sözüdür və onu deyən şəxs müəyyən şeylərdə murciələrə müvafiq olur yaxud o, irca şübhəsinə tutulmuşdur.Həmin şəxs ictihad yaxud təvil etdiyinə görə üzürlü olarsa Allah onu bağışlayar. Əgər insan hüccəti qalxmayan cahil olarsa bidət yaxud fasiqlikdə ittiham edilməz.Ona yalnız doğru olan bəyan edilər və həmin şəxs haqqa çağırılar.Bizi buna, əmr olunduğumuz insaf və ədalət çağırır.Buna görə də, bildiyimiz elm əhlindən heç kəs Qadı Əbu Yalə əl-Hənbəlinin murciələrə müvafiq gəlməsi səbəbilə murciə adlandırmamışdır.Belə ki o, görüşlərin birində Allahı söyənin kafir olması üçün halal saymanı şərt qoymuşdur. Alimlər bunu yalnız yaramaz xəta və böyük yanlışlıq olaraq qəbul etmişlər.[587]Allah onu bağışlasın!

---

[586] Mulhaqul vasitiyyə, şeyx Ulvi əs-Səqqaf:263.

[587] əs-Sarimul məslul:3/960.

Məlumdur ki, fəzilətli insanın düşdüyü xəta səbəbilə yaxşı işləri diqqətsiz buraxılmır.Buna ən bariz nümunə imam əz-Zəhəbinin Əbu Zur`adan  qeyd etdiyi rəvayətdir: "Mən Əhməd bin Hənbəlin hüzurunda idim.O, İbrahim bin Tahmən adlı şəxsi xatırladığı zaman söykənmişdi.Bu zaman o, əyləşib dedi: Saleh insanlar xatırlandığı zaman söykənmiş halda olmaq doğru deyil.Habelə Əhməd demişdir: O, cəhmilərə qarşı sərt olan murciə olmuşdur."[588]

[588] Siyəru ə`ləmi-n-nubələ:7/381.

# Üçüncü bölüm

## Əməlin imanla olan əlaqəsi

**Ora daxil olan məsələlər:**

***Birinci fəsil:*****Zahir ilə daxil arasında olan bağlılıq.**

***İkinci fəsil:*****Bütövlüklə zahiri əməli tərk etməyin imanı pozan amil olduğuna dair dəlillər.**

***Üçüncü fəsil:*****Bədən əməllərinin məqamı və onu tərk edənin hökmünə dair elm əhlindən nəql edilən xəbərlər.**

# BİRİNCİ FƏSİL

## Zahir ilə daxil arasında olan bağlılıq

Dörd araşdırmadan ibarətdir:

1-Tələzum anlamı.

2-Murciələrin tələzumu inkar etmələri.

3-Zahir ilə daxil arasında olan bağlılığa dair dəlillər.

4-Üz çevirmə küfrü.

Birinci bölümün araşdırmalarında həmin "tələzum" anlamına dair qısa işarə edilmişdir.[589] Burada məqsəd, onun anlamını, dəlillərini və onu deyənləri, habelə onun Əhli sunnə ilə murcilələr arasında olan fərqləndirici amillərdən biri olduğunu bəyan etməkdir.

---

[589] Orada imanın özəyi və şaxəsi, habelə qəlb sözü və əməli arasında olan əlaqə haqqında söhbət açılmışdır.

# Birinci araşdırma:

## Təlazum anlamı

Burada təlazum deyildiyi zaman zahir ilə daxil arasında olan bağlılıq və hər birinin digərinə təsiri qəsd edilir.Belə ki, bu bağlılıq və təsir nəticəsində daxili imanın gərəkli ünsürü və tələbi söz və əməl olaraq bədən əməllərində üzə çıxmayacağı tədirdə daxildə doğru imanın olması ağılasığmaz olacaq.Əksinə, imanın daxildə olması bədənin mümkün qədər əzalarda öz əksini tapan əməllərlə hərəkətə gəlməsini labüd edir.Zahiri əməl daxili imanın zəruri amilidir və ondan ayrılmazdır.“Ləzim”in (zahiri əməllərin) yoxluğu“ məlzum”un (daxili imanın) yoxluğuna dəlalət edir.Zahiri əməlin bütövlüklə mövcud olmaması daxilin fəsada uğramasına aşkar dəlildir.

Şeyxul-İslam “təlazum” məsələsini açıqlayaraq demişdir: “Əgər qəlbdə Onun təsdiqi və Ona olan sevgi yer alarsa bunun nəticəsi olaraq bədənin zahiri sözlər və əməllər ilə hərəkətə gəlməsi qaçılmaz olacaq.Bədəndə üzə çıxacaq söz və əməllər qəlbdə olanın gərəkli ünsürü, zəruri amili, dəlili və nəticəsidir.Həmçinin bədən ilə edilən söz və əməllərin qəlbdə olana bir-başa təsiri var.Onlardan hər biri digərinə öz təsirini göstərir.Lakin qəlb özəy bədən isə şaxədir.Şübhəsiz ki, şaxə özəydən əsas götürür.Özəy isə şaxə ilə möhkəmlənir və güclənir.”[590]

---

[590] Məcmu`əl-fətava:7/541.

Həmçinin demişdir: "Habelə qəlb, təsdiqə və özündə istəyi cəm edən tam sevgiyə yiyələnəcəyi zaman zahiri əməllərin mövcudluğu labüd olacaq.Habelə qəti istək dolğun qüdrət ilə bir arada gələcəyi zaman məqsədin mövcud olması labüd olacaq.Felin yoxluğu ancaq qüdrətin kamil olmaması yaxud istəyin dolğun olmaması səbəbilə olur. Çünki onun kamil olması ixtiyarı felin varlığını vacib edir."[591]

Həmçinin demişdir: "Artıq biz buna dair iman məsələsində geniş söz açmışıq və bəyan etmişik ki, qəlbdə yer alan təsdiq, Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) sevmək, habelə təzim etmək kimi amillər mütləq bədən əzalarında üzə çıxmalıdır. Əksi həmçinin elədir.Bu səbəbdən, daxili "məlzum"un (daxili əməllərin) yoxluğuna zahiri "ləzim"in (zahiri əməllərin) yoxluğu dəlil olaraq göstərilir.Belə ki, səhih hədisdə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Agah olun ki, bədəndə bir ət parçası var ki, o, düzələcəyi zaman bütün bədən düzələcək.O, fəsada uğrayacağı zaman isə bütün bədən fəsada uğrayacaq.Agah olun ki, o, qəlbdir!".[592] Həmçinin Ömər bin Xəttab (r.a) namazda çoxlu yersiz hərəkətlər edən şəxs haqqında demişdir: Əgər bunun qəlbi müti olsaydı əzaları həmçinin müti olardı."[593]

---

[591] Məcmu`əl-fətava:10/272.

[592] Buxari:52.Muslim:1599.Hədisi Numən bin Bəşir (r.a) rəvayət etmişdir.

[593] Məşhur olan, bu sözün Səid bin Museyyib tərəfindən deyilməsidir."əl-Musannəf, Abdur-Razzəq:2/255_330-cu rəqəm"."əl-Musannəf, ibn Əbu Şeybə: 2/86_6787-ci rəqəm"."əs-Sunənul kubra, əl-Beyhaqi:2/285".əl-İraqi "əl-ihyə:1/151" kitabının təxricində demişdir: Orada adı çəkilməyən bir şəxs vardır.Habelə şeyx Albani "İrvau-l-ğalil:2/93_373-cü rəqəm" kitabında hədisi zəif saymışdır.Əbu

Həmçinin Uca Allah buna dair buyurur: *“Allaha və Axirət gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrəbaları olsalar belə – dostluq etsinlər.”*[594] Həmçinin buyurur: *“Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana iman gətirsəydilər, müşrikləri özlərinə dost tutmazdılar.”*[595]Həmçinin buyurur: *“Əgər onlar (döyüşə) çıxmaq istəsəydilər, mütləq ona hazırlıq görərdilər.”* [596]Belə ki, qəlbdə qüdrət ilə bərabər olan istək məqsədi yerinə etirməyi vacib edir.Uzaq yürüşə səfər yalnız tədarük ilə olur.”[597]

---

Hureyranın(r.a) həmin hədisi Peyğəmbərə (salləllahu aleyhi və səlləm) qaldırması rəvayət edir.Şeyx Albaninin dediyi kimi həmin rəvayət qondarmadır.

[594] əl-Mucədilə:22.

[595] əl-Maidə:81.

[596] ət-Təubə:46.

[597] əl-Cəvab əs-sahih:6/487.

# İkinci araşdırma:

## Murciələrin tələzumu inkar etmələri

Əməli imandan çıxaran murciələrin bir çoxu əməlin daxili imanın səmərəsi olduğuna dair çəkişmə aparmırlar. Onların çəkişməsi yalnız əməlin imanda zəruri amil olmasını şamil edir.Onlardan "tələzum" qaydasını qəbul edənlərlə olan çəkişmə, qeyd edildiyi kimi ləfzi çəkişmədir.

Murciələrin zahir ilə daxil arasında olan tələzumu (bağlılığı) inkar etmələri haqqında Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) demişdir: "Murciələr qəlbdə olan imanın itaətlərin icrasına sövq edən və onu tələb edən amil olmasına dair çəkişmə aparmırlar.Onlara görə itaət onun səmərəsi və bəhrəsidir.Onların çəkişməsi yalnız imanın itaəti gərəkdirib gərəkdirməməsi məsələsidir."[598]

Həmçinin demişdir: "Əgər bir insan: İtaətlər daxili təsdiqin səmərəsidir,- deyərsə, bu sözlərlə iki şey qəsd ediləcək:

Bu sözlə onun zəruri amillər olması qəsd ediləcək və daxili iman olacağı zaman o da, mövcud olacaq.Bu, sələfin və Əhli sunnənin məzhəbidir.

Yaxud daxili imanın bəzən səbəb olması qəsd ediləcək. Bəzən isə daxili iman tam və kamil olduğu halda o, mövcud

[598] Məcmu`əl-fətava:7/50.

olmayacaq.Bu, cəhmilər və digərlərindən olan murciələrin sözüdür."[599]

Bu böyük imamdan gələn həmin açıq-aydın sözlər haqqında düşün ki, Uca Allah sənin bəsirətini nurlu edib səni Əhli sunnə ilə murciələrin sözləri arasındaki fərqi ayırd etməyə müvəffəq etsin.

Həmçinin demişdir: "Üçüncü: (Murciələrin yanlışlıqları sadalanır) Onlar qəlbdə olan imanın heç bir əməlsiz tam olduğunu düşünmüşlər.Bu səbəbdən onlar, səbəb ilə nəticə mislində əməlləri imanın səmərəsi və tələbi edirlər. Lakin onlar əməlləri imanın zəruri amili etmirlər.Əslində isə, qəlbin tam imanı ona uyğun surətdə zahiri əməli vacib edir.Zahiri əməlsiz qəlbdə tam imanın yer alması qeyri-mümkündür.Onlan bədən ilə qəlb arasında olan əlaqəni isbat etmədikləri səbəbilə baş verməsi qeyri-mümkün olan məsələləri fərziyyə şəklində irəli sürməyə girişmişlər.Buna misal olaraq onlar demişlər: "Bir kişi Allaha bir səcdə belə etmədiyi, Ramazan orucunu tutmadığı, anası və bacısı ilə zina etdiyi, Ramazanın günortası şərab içdiyi halda Əbu Bəkrin və Ömərin qəlbində olan imanı tək qəlbində imana sahibdir.Onlar deyirlər: Bu, tam imana sahib olan mömindir. Möminlər isə bunu çox sərt şəkildə inkar edirlər."[600]

Həmçinin demişdir: "Əgər iman və islam bir arada gələrsə, bu halda iman qəlbdə olanı islam isə zahirdə olanı ifadə edəcək.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İslam aşkardır, iman isə qəlbdədir.İman Allaha, Onun

599 Məcmu\` əl-fətava:7/363.

600 Məcmu\` əl-fətava:7/204.

mələklərinə, kitablarına, elçilərinə, ölümdən sonra dirilişə və qədərin xeyiri və şərinə iman etməyindir."[601]

Bu iman, onun (qəlbində) hasil olduğu zaman şəhadət, namaz, zəkat, oruc və həcc kimi ibadətlərdə öz əksini tapan islamın hasil olması zəruri şəkildə vacib olur.Çünki onun Allaha, Onun mələklərinə, kitablarına, elçilərinə imanı, onun Allaha təslim olub Ona boyun əyməsini tələb edir. Çünki imkan olan halda bunun zahirdə hasil olmaması daxili iqrar, sevgi və boyun əymənin hasil olmasını mümkünsüz edir.Məqsəd olmadan qüdrət ilə bərabər qəti iradənin mümkünsüz olması buna misaldır.

Bununla da sənə məlum olur ki, qəlbi ilə qəti şəkildə iman gətirən şəxsin qadir olduğu halda şəhadəti gətirmə-məsi qeyri-mümkündür.İmkan olduğu halda şəhadətin yoxluğu qəlbdə tam imanın yoxluğunu vacib edir.Bununla da, Cəhm və onun ardıcıllarının yanlışlığı üzə çıxır.Onlar iddia etmişlər ki, zahiri iman olmadan adi iman axirətdə fayda verəcək.Bu, qeyri-mümkündür.Çünki qəlbdə tam iman hasil olduğu zaman imkan nisbətilə onun gərəkli amili zahirdə hasil olur. İnsanın başqasını dərin bir sevgilə sevməsi və ona qovuşmaq iqtidarında olması lakin zahirdə ona doğru aparan heç bir zahiri hərəkət etməməsi qeyri-mümkündür."[602]

---

[601] Əhməd:12404.Hədisi Ənəs (r.a) rəvayət etmişdir.Həmin hədisdə "İman, Allaha iman gətirməyindir..." sözləri yoxdur.Şueyb Arnaut "əl-musnəd" kitabının təhqiqi zamanı hədisi zəif saymışdır.Habelə şeyx Albani "daifu-l-cəmi` əs-sağır:2280" kitabında hədisi zəif saymışdır.

[602] Məcmu`əl-fətava:7/553.

Həmçinin demişdir: "Murciələrdən olan kəlam əhli və fəqihlər belə deyirlər: "Əməllər bəzən məcazi surətdə iman adlanır. Çünki əməl imanın səmərəsi və tələbidir.Habelə o, imana dəlalət edir."[603]

Bu, murciələrin qədimdən olan halıdır. Onlar "tələzum" anlamını rədd edir və zahiri əməlin yoxluğu ilə bərabər qəlbdə tam imanın, üstəlik kamil imanın mövcud olduğunu təsəvvür edirlər.

Müasirlərdən irca məzmunlu sözlər deyənlərə yaxud bu şübhəyə düşənlərə gəldikdə isə, qeyd etmək lazımdır ki, onlar bu məsələdə çaşqınlığa düşmüşlər.Onlardan bəziləri zahir ilə daxil arasında olan bağlılığı "tələzumu" dildə isbat edir, gerçəkdə isə onu inkar edirlər və bütün zahiri əməlləri tərk edənlərə müsəlman hökmünü verərək əməlin yoxluğu ilə bərabər qəlbdə həmin şəxsi qurtaracaq imanın olduğunu təsəvvür edir.

Bəziləri isə, iddia edirlər ki, "tələzum" ancaq kamil imana aid bir məsələdir.Qəlbdə olan iman kamilləşəcəyi zaman zahiri əməlin olması vacib olacaq.Ancaq bədəndə heç bir zahiri əməl olmadan imanın özəyinin söz və əməl olaraq qəlbdə hasil olması mümkündür.

Bu şəxsləri zəlalətə sürükləyən həmin şübhənin bəyanı və cavabı veriləcək.

Burada güdülən əsas məqsəd, "tələzum" anlamını inkar etməyin murciə, cəhmiyyə və qeyrilərindən qaynağlanan söz

---

[603] Məcmu`əl-fətava:7/195.

olduğuna əminliyi ifadə etməkdir.Həmçinin murciələr zahiri əməlin daxildə olanın səmərəsi və dəlili olmasında çəkişmirlər. Onların çəkişməsi əməlin imanda zəruri amil olmasına dairdir.

# Üçüncü araşdırma:

## Zahir ilə daxil arasında olan bağlılığa dair dəlillər

Adı çəkilən bağlılığa "tələzum" Qurani Kərim, sunnə və bir çox əsərlər dəlalət edir.Həmin dəlillərdən bir qismi:

1-Uca Allah buyurur:"*Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana iman gətirsəydilər, müşrikləri özlərinə dost tutmazdılar.*"[604]

Daxildə olan iman zahirdə kafirlərlə düşmənçiliyi və onlarla dostluğu tərk etməyi gərəkdirir.

2-Uca Allah buyurur: "*Allaha və Axirət gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrəbaları olsalar belə – dostluq etsinlər. Allah onların qəlbinə iman salmış və onları Öz tərəfindən bir ruhla dəstəkləmişdir. (Allah) onları (ağacları) altından çaylar axan Cənnət bağlarına daxil edəcəkdir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan razıdır, onlar da Allahdan razıdırlar. Onlar Allahın firqəsidirlər. Həqiqətən, məhz Allahın firqəsi nicat tapanlardır.*"[605]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Zahiri söz və əməllər daxili söz və əməllər üçün zəruri və gərəkli olduğu zaman, həmin şeylər bu məsələ üçün dəlil olaraq göstə-rilmişdir.Uca Allah buna dair buyurur: "*Allaha və Axirət*

[604] əl-Maidə:81.
[605]əl-Mucadilə:22.

*gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrəbaları olsalar belə – dostluq etsinlər. Allah onların qəlbinə iman salmış və onları Öz tərəfindən bir ruhla dəstəkləmişdir."* Uca Allah, Allaha və axirət gününə iman gətirənlərin Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) düşmənlərinə rəğbət bəsləmədiyini xəbər vermişdir.Üstəlik iman özlüyündə onlara rəğbət bəsləməyə ziddir.Onlara rəğbətin hasil olması imanda xələlin baş verdiyini göstərir.Həmçinin Uca Allah buyurur: *"Sən onların bir çoxunun kafirlərlə dostluq etdiyini görürsən. Nəfslərinin onlar üçün hazırladığı şey necə də pisdir. (Buna görə də) Allah onlara qəzəblənmişdir və onlar əzab içində əbədi qalacaqlar. Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana iman gətirsəydilər, müşrikləri özlərinə dost tutmazdılar."*[606]

Həmçinin Şeyxul-İslam (rahiməhullah) demişdir: "Uca Allah bir neçə yerdə iman və təsdiqin zahiri və daxili əməllərdən olan amillərlə gerçəkləşdiyini bəyan etmişdir.Uca Allah buyurur: *"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar, yalnız öz Rəbbinə təvəkkül edər, namaz qılar və Bizim onlara verdiyimiz ruzidən (Allah yolunda) xərcləyərlər.Həqiqi möminlər məhz onlardır."*[607] Həmçinin buyurur:*"Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən, sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah*

---

[606] Məcmu`əl-fətava:7/542.

[607] əl-Ənfəl:2-4.

yolunda malları və canları ilə cihad edənlərdir! (İmanlarında) sadiq olanlar da məhz onlardır."[608] Həmçinin buyurur: "Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən kimsələrdir. Onlar ümumi bir işə görə (Peyğəmbərlə) bir yerdə olduqda ondan izn almamış heç yerə getmirlər."[609]Həmçinin buyurur:"Xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca iman gətirmiş olmazlar."[610]

Əgər biri: Bu işlərin yoxluğu imanın olmayacağına dəlalət edir və heç də onların imandan olmasına dəlalət etmir,-deyərsə, ona deyiləcək: Həmin sözlər, bu kimi zahiri işlərin yoxluğu ilə bərabər daxili imanın olmayacağını ifadə edən etirafdır.Buna görə də, söz və əməldən ibarət zahiri işlər olmadan qəlbdə küfrə zidd olan imanın olmasını iddia etmək doğru deyil.Məqsəd məhz budur.Bu, təsdiqdir.Çünki qəlbin təsiri zəruri olaraq zahirdə öz əksini taparsa, onlardan birinin digərindən ayrı düşməsi mümkünsüz olacaq.Felin icrası üçün qəti iradənin tam qüdrətlə bərabər olması qüdrət çərçivəsində olanın baş verməsini vacib edir.Əgər qəlbdə Allaha və Peyğəmbərə sevgi sabit olarsa bu, Onun dostlarını dost, düşmənlərini isə düşmən tutmağı labüd edəcək: "Allaha və Axirət gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-

---

608 əl-Hucurat:15.

609 ən-Nur:62.

610 ən-Nisa:65.

*əqrəbaları olsalar belə – dostluq etsinlər.""Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana iman gətirsəydilər, müşrikləri özlərinə dost tutmazdılar.*" Bu tələzum, zəruri bir məsələdir. Bəziləri əməlsiz qəti iradə ilə bərabər tam qüdrətin olmasını caiz saymaqda yanlışlığa düşdükləri kimi "tələzum"un yoxluğunu zənn edənlər həmçinin yalnışlığa düşmüşlər.İş o yerə çatmışdır ki, onlar: İnsan əməlsiz iradəyə görə cəzalandırıla bilərmi?-deyə bu mövzuda ixtilaf etmişlər. Artıq biz buna dair bir neçə yerdə geniş danışmışıq və bəyan etmişik ki, niyyət, səy göstərənin etməyə qadir olduğu felə bağlı olmayacağı təqdirdə, qəti iradə sayılmayacaq.Çünki qəti iradənin qulun qadir olduğu bir şeylə bir arada gəlməsi labüddür.Burada yalnız pislik etmək əzminə düşüb onu etməyən şəxs hesaba alınmır.Ancaq pisliyi arzulayaraq iqtidarında olduğunu edən və sadəcə istədiyini əldə etməyə aciz qalan şəxsin durumu fərqlidir.Misal olaraq, tərəf müqabilini öldürmək istəyərək onunla savaşan və nəticədə ikisindən birinin ölümü ilə nəticələnən hal.Bu şəxs cəzasını alacaq.Çünki o, istəmiş və məqsədinə çatmaq üçün qadir olduğunu etmişdir.

Daxili və zahiri işlər arasında olan bağlılığı bilən şəxs insanların çoxlu ixtilaf etdiyi bu kimi mövzularda yer alan bir çox şübhələrdən azad olur."[611]

Həmçinin demişdir: "İman fərdi şəkildə geyd ediləcəyi zaman ora zahiri əməllər həmçinin daxil olacaq.Çünki onlar qəlbdə olanın zəruri amilləridir.Belə ki, qəlbdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyinə iman və təsdiq sabit

[611] Məcmu` əl-fətava:7/645.

olduğu zaman zəruri olaraq bunu tələb edən amillərin hasil olması vacib olacaq.Çünki hər hansı bir şeyi gizlədən elə bir kimsə yoxdur ki, Allah onun gizlətdiyini üz çizgilərində və tələffüz etdiyi ifadələrdə aşkara çıxarmasın.Bu səbəbdən qəlbdə olan təsdiq sabit olacağı zaman onun tələbi olaraq əməl heç bir vəchlə ondan kənar qalmayacaq. Zahirdə öz izini buraxmayacağı təqdirdə dolğun biliyin və doğru sevginin bərqərar olması mümkün deyil.Bu səbəbdən Uca Allah, imanın zəruri amilləri olmayacağı təqdirdə imanın varlığını inkar etmişdir.Çünki "ləzim"in (zahiri əməllərin) yoxluğu "məlzum"un (daxili imanın) yoxluğu deməkdir.Uca Allah buyurur: "*Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana iman gətirsəydilər, müşrikləri özlərinə dost tutmazdılar*". Habelə: "*Allaha və Axirət gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrəbaları olsalar belə – dostluq etsinlər.*" Habelə digər ayələr.Zahir ilə daxil bir-birinə sıx bağlıdır.Zahir yalnız daxilin doğru və dürüst olacağı halda doğru və dürüst olacaq. Daxil doğru və dürüst olacağı zaman zahirin doğru və dürüst olması labüd olacaq.Bu səbəbdən Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Agah olun ki, bədəndə bir ət parçası var ki, o, düzələcəyi zaman bütün bədən düzələcək.O, fəsada uğrayacağı zaman isə bütün bədən fəsada uğrayacaq.Agah olun ki, o, qəlbdir!"[612] Həmçinin Ömər bin Xəttab (r.a) namazda çoxlu yersiz hərəkətlər edən şəxs haqqında demişdir: Əgər bunun qəlbi müti olsaydı

[612] Yuxarıda qeyd edilib.

əzaları həmçinin müti olardı."[613] Habelə hədisdə gəlmişdir: "İnsanın dili düzəlməyincə onun imanı düzəlməz.Onun qəlbi düzəlməyincə dili düzəlməz."[614]

Bu səbəbdən zahir bir yöndən daxilin "ləzim"i digər yöndən isə "məlzum"u olmuşdur.Belə ki, zahir ona "ləzim" deyil "məlzum"olması etibarı ilə dəlalət edir.Çünki dəlil dəlalət etdiyi şeyin məlzumdur.Dəlilin varlığı isə dəlalət etdiyi şeyin varlığını gərəkdirir. Lakin bir şeyin mövcud olması, ona dəlalət edən şeyin mövcud olmasını gərəkdirmir. Dəlil isə "ittirad" qəbul edir ( yəni, dəlil olacağı zaman dəlalət etdiyi şey həmçinin olacaq) lakin "in`ikas" qəbul etmir (yəni, dəlilin yoxluğu dəlalət etdiyi şeyin yoxluğunu ifadə etmir). Bir şeyin həddi isə fərqlidir.Çünki həddin hər bir yöndən məhdud olan ilə eyni olması gərəkdir (yəni, hədd olacağı zaman məhdud olacaq, olmayacağı zaman isə olmayacaq)."[615]

3-Uca Allah buyurur: *"Əgər onlar (döyüşə) çıxmaq istəsəydilər, mütləq ona hazırlıq görərdilər. Lakin Allah onların döyüşə getməsini istəmədi və onları saxladı. Onlara: "(Evdə) oturanlarla bərabər, siz də oturun!"– deyildi."*[616]

---

[613] Yuxarıda qeyd edilib.

[614] Əhməd:13071.Hədisi Ənəs (r.a) rəvayət etmişdir.Hədisin ləfzi belədir: "İnsanın qəlbi düzəlməyincə imanı düzəlməz.Onun dili düzəlməyincə isə qəlbi düzəlməz." əl-İraqi "əl-İhyə:3/109" kitabını təxric edərkən bu hədisi zəif saymışdır.Habelə Şueyb Arnaut "əl-musnəd" kitabını təhqiq edərkən hədisi zəif saymışdır.Şeyx Albani bu hədisi "əs-silsilətu əs-sahiha:2841" və "sahihu-t-tərğib və-t-tərhib:2554" kitablarında həsən saymışdır.

[615] Məcmu`əl-fətəva:18/272.

[616] ət-Təubə:46.

Qüdrət ilə birgə qəti iradə olacağı zaman məqsədin olması vacib olacaq.Burada məqsədin yoxluğu, yəni səfərə tədarükün görülməməsi səfərə çıxmaq istəyinin olmadığına dəlalət edir.

Qurtubi (rahiməhullah) demişdir: "Uca Allah buyurur: "*Əgər onlar (döyüşə) çıxmaq istəsəydilər, mütləq ona hazırlıq görərdilər.*"Yəni, əgər onlar cihad istəsəydilər mütləq səfər üçün hazırlıq aparardılar.Onların hazırlığı tərk etməsi həmin cihaddan kənar qalmalarını istədiklərini göstərir."[617]

4-Uca Allah buyurur: "*İçərinizdən kimisi dünyanı, kimisi də axirəti istəyirdi.*"[618]

Onların daxili niyyətləri fərqli olduğu vaxt zahiri əməlləri ayrı məcraya yönəlmişdir.

İbn Kəsir (rahiməhullah) demişdir: "*İçərinizdən kimisi dünyanı*".Onlar müşriklərin məğlub olduğunu gördükləri zaman qənimət əldə etməyi istəyən şəxslərdir."[619]

əl-Bəğavi (rahiməhullah) demişdir: "*İçərinizdən kimisi dünyanı*". Yəni, mövqeyi tərk edib qarətə atılan şəxslərdir. "*Kimisi də axirəti istəyirdi.*" Yəni, Abdullah bin Cubeyr (r.a) ilə birgə ölənə qədər mövqelərində sabit qalan şəxslərdir.İbn Məsud (r.a) demişdir: "Mən Uhud günü olub bu ayə nazil olmayınca Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əshabından kiminsə dünyanı istədiyini duymadım."[620]

---

[617] Təfsirul qurtubi:8/142.
[618] Ali İmran:152.
[619] Rəfsir ibn Kəsir:1/545.
[620] Təfsiru-l-bəğavi:2/118.

**5-Uca Allah buyurur:***"De: Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin".*[621]

Təsdiqlə birgə qəlbdə sevgi yer alacağı vaxt bunun nəticəsi olaraq bədənin zahiri söz və əməllər ilə hərəkətə gəlməsi vacib olacaq. Artıq buna dair Şexyul-İslamdan (rahiməhullah) nəqllər qeyd edilmişdir.

Şeyx Muhammməd Əmin əş-Şinqiti (rahiməhullah) demişdir: "Bu ayədən çıxan faydalar: Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) olan sadiq sevginin əlaməti Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabeçilik göstərməkdir.Buna müxalif olduğu halda Onu sevdiyini iddia edən şəxs isə yalançı və iftiraçının birisidir.Çünki əgər həmin şəxs Onu sevsəydi Ona itaət edərdi.İnsanlara məlum olan bir həqiqət, sevginin itaəti gətirməsidir.Şair buna dair demişdir:

Sevgidə sadiqlik itaətindir

Sevən sevilənə itaətkardır ".[622]

İbn Kəsir (rahiməhullah) demişdir: "Bu ayə Muhammədin yolu üzərində olmadığı halda Allahı sevdiyini iddia edən hər bir şəxsin həmin məsələyə dair iddiasında yalançı olduğuna hökm çıxarır.Həmin şəxs bütün söz və əməllərində Muhammədin (salləllahu aleyhi və səlləm) şəriətinə və nəbəvi dininə tabe olmayınca bu, məhz belə olacaq.Səhih hədisdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə deməsi sabit olmuşdur: Kim bizim işimizdən olmayan bir əməl edərsə

---

[621] Ali İmran:31.

[622] Ədvaul bəyən:1/327.

onun etdiyi əməl rədd edilər."[623] Məhz bu səbəbdən Uca Allah buyurmuşdur: *"De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın."*[624]

İbnul-Qayyim (rahiməhullah) demişdir: "İbadətin özəyi: Allahı sevmək, üstəlik Onu sevgidə təkləşdirməkdir.Onun bütün sevgisi Alaha olmalı və o, Allah ilə bərabər digərini sevməməlidir.İnsan Allahın peyğəmbərlərini, mələklərini, övliyalarını sevdiyi kimi onları yalnız Allahdan ötrü və Allah üçün sevməlidir.Bizim onları sevməyimiz Allahı sevməkdən irəli gəlir və heç də Allahdan qeyri taylar tutub onları Allahı tək sevən şəxslər kimi Onunla bərabər kimisə sevməyi ifadə etmir.

Allaha olan sevgi qulluğun gerçəyi və sirri olduğu zaman bəlli olur ki o, yalnız Peyğəmbərin (salləlahu aleyhi və səlləm) əmrinə tabe olmaq və qadağan etdiyindən kənar durmaqla həyata keçir.Əmrə tabeçilik və qadağandan çəkinmə vaxtı qulluğun və sevginin gerçəyi bəlli olur.Bu səbəbdən, Uca Allah Peyğəmbərə (salləlahu aleyhi və səlləm) tabeçiliyi, sevginin əlaməti və sevgi iddiasının şahidi etmişdir.Uca Allah buyurur: *"De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın."*.Uca Allah onların Ona olan sevgisini və Allahın onları sevməsini Peyğəmbərə (salləlahu aleyhi və səlləm) tabeçilikdə şərtli etmişdir.Şərt olmadan isə şərtə bağlı olanın mövcud olması qeyri-mümkündür. Məlum

[623] Muslim:1718.Hədisi Aişə (r.a) rəvayət etmişdir.
[624] Təfsir ibn Kəsir:1/477.

olur ki, tabeçilik olmadığı bir halda sevgi də olmur. Onların Allahı sevməməsi Peyğəmbərə (salləlahu aleyhi və sələm) tabeçiliyin yoxluğunu zəruri edir. Tabeçiliyin yoxluğu isə Allahın onları sevməyəcəyini qaçılmaz edir. Beləliklə də, Peyğəmbərə (salləlahu aleyhi və sələm) tabeçiliyin olmadığı bir halda onların Allahı, Allahın da onları sevməsi ağılasığmaz olur.

Bu isə, Peyğəmbərə (salləlahu aleyhi və sələm) tabeçiliyin, Allahı və Peyğəmbəri sevmək və onun əmirlərinə itaət etmək olduğunu göstərir."[625]

İmamın bu sözləri haqqında bir düşün: "Məlum olur ki, tabeçilik olmadığı bir halda sevgi həmçinin olmur v.s".Daha sonra bunu, bütün ömrünü yaşayıb güc və imkana sahib olduğu halda Allah üçün bir səcdə belə etməyənin, Allah üçün bir itaəti belə yerinə yetirməyənin qəlbində təsdiq, boyun əymə, qorxu, ümid və sevgiyə sahib olacağını xəyallarına gətirən irca dəvətçilərinin sözləri ilə müqayisə et! Ardından onlar belə deyirlər: "Biz zahirlə daxil arasında olan "tələzum" anlamını isbat etmək məsələsində Əhi sunnə ilə birlikdəyik.

Murciələrin adı çəkilən "tələzum" anlamından bixəbər olmaları səbəbilə onlar baş verməsi mümkün olmayan məsələlərə dair fərziyyələr qurmağa girişmişlər.Misal olaraq onlar demişlər: Bir adam qəlbində təsdiq, boyun əymə və sevgiyə sahib olduğu halda "lə iləhə illəllah" şəhadətini dilə gətirir, lakin bilik, imkan və qüdrəti olduğu halda bədən

[625] Mədəricu-s-səlikin:1/97.

əməllərindən heç vaxtı heç bir şey etmir.Onlar daha da irəli gedərək demişlər: Bu, Əhli sunnənin cumhuruna görə müsəlmandır. Onlardan bəzisi bu sözləri əlavə etmişdir: Onu yalnız xəvariclər təkfir edirlər.Heç şübhəsiz ki, məsələləri bilən möminlər bu kimi sözləri çox sərt şəkildə inkar edirlər.

6-Zahir ilə daxil arasında olan bağlılığın isbat edilməsinə ən açıq-aydın dəlillərdən biri də, Buxari və Muslimin Numən bin Bəşirdən (r.a) rəvayət etdikləri hədisdir.Numən (r.a) demişdir: Mən Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə dediyini eşitdim: Halal da bəllidir, haram da bəllidir.Onların arasında insanlardan bir çoxunun bilmədiyi şübhəli şeylər vardır.Hər kim şübhəli şeylərdən çəkinərsə dinini və namusunu qorumuş olar.Şübhəli şeylərə düşən şəxs isə qoruğun ətrafında sürü otarıb ora girmək ərəfəsində olan çobana bənzəyir.Ağah olun ki, hər bir hökmdarın öz qoruğu vardır.Bilin ki, Allahın yer üzündə olan qoruğu onun haram etdikləridir.Ağah olun ki, bədəndə bir ət parçası var ki, o, düzələcəyi zaman bütün bədən düzələcək. O, pozulacağı zaman isə bütün bədən pozulacaq. Agah olun ki, o, qəlbdir."[626]

Şeyxul-İslam (rahiməhullah) bu hədisi qeyd etdikdən sonra demişdir: "Qəbli düzələn şəxsin mütləq bədəni düzələr.Əksi isə belə deyil."[627]

Habelə demişdir: "Zahir və daxil bir-birinə sıx bağlıdır. Zahir yalnız daxilin doğru dürüst olması ilə düzəlir.Daxil

[626] Buxari:52.Muslim:1599.

[627] Məcmu`əl-fətəva:7/9.

düzələcəyi zaman isə zahirin düzəlməsi labüd olacaq.Bu səbəbdən Peyğəmbər (salləllahu aleyhi və sələm) demişdir: "Ağah olun ki, bədəndə bir ət parçası vardır ki, o, düzələcəyi zaman bütün bədən düzəlir, o, pozulacağı zaman isə bütün bədən pozulur.Agah olun ki o, qəlbdir." Həmçinin Ömər bin Xəttab (r.a) namazda çoxlu yersiz hərəkətlər edən şəxs haqqında demişdir: "Əgər bunun qəlbi müti olsaydı əzaları həmçinin müti olardı."Habelə hədisdə gəlmişdir: "İnsanın dili düzəlməyincə onun imanı düzəlməz. Onun qəlbi düzəlməyincə isə dili düzəlməz."[628]

Həmçinin demişdir: "Habelə qəlb özəydir.Onda bilik və iradə olacağı zaman bu, zəruri olaraq bədənə sirayət edəcək. Çünki bədənin qəlbin istəyindən kənar qalması mümkün deyil.Bu səbəbdən Peyğəmbər (salləllahu aleyhi və səlləm) hədisdə demişdir: "Ağah olun ki, bədəndə bir ət parçası vardır ki, o, düzələcəyi zaman bütün bədən düzəlir, o, pozulacağı zaman isə bütün bədən pozulur.Agah olun ki, o, qəlbdir." Həmçinin Əbu Hureyra (r.a) demişdir: "Qəlb hökmdar digər əzalar isə onun əsgərləridir. Hökmdar rahat olduğu zaman əsgərlər də rahat olurlar.Hökmdar narahat olduğu zaman isə əsgərlər də narahat olurlar."[629] Əbu Hureyranın sözləri yaxın mənanı ifadə etsə belə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözləri bəyan baxımından daha gözəldir.Çünki bəzən hökmdar saleh birisi olduğu halda əsgərlər ona asi çıxırlar. Həmçinin əksi də olur.Belə olan halda onlar saleh olur hökmdar yaramaz yaxud hökmdar saleh onlar isə yaramaz

[628] Məcmu`əl-fətəva:18/272.

[629] "əl-Musannəf, Abdur-Razzəq:11/221_20375-ci rəqəm"."Şuabul imən, əl-Beyhaqi:1/123".

olurlar. Qəlb isə fərqlidir.Çünki bədən ona tabedir və heç vaxtı onun istəyindən kənar çıxmır.Məhz Peyğəmbərin (salləllahu aleyhi və sələm) dediyi kimi "o, düzələcəyi zaman bütün bədən düzəlir, o, pozulacağı zaman isə bütün bədən pozulur."

Qəlb, qəlbi elm və əməl olaraq sahib olduğu iman ilə saleh olacağı zaman bədənin zahiri söz və mütləq imana uyğun əməl ilə düzəlməsi zəruri olaraq vacib olacaq.Hədis əhlinin dediyi kimi: Söz və əməl.Daxili və zahiri söz, habelə daxili və zahiri əməl.Zahir daxilə tabe olub onun zəruri amili olur.Daxil düzələcəyi zaman zahir həmçinin düzəlir. Pozulacağı zaman isə pozulur.Bu səbəbdən səhabələrdən bəzisi namazda yersiz hərəkətlər edən şəxs haqqında belə demişlər: Əgər bunun qəlbi müti olsaydı əzaları da müti olardı."[630]

Habelə demişdir: Artıq Peyğəmbər (salləllahu aleyhi və sələm) demişdir: "Ağah olun ki, bədəndə bir ət parçası vardır ki, o, düzələcəyi zaman bütün bədən düzəlir, o, pozulacağı zaman isə bütün bədən pozulur.Agah olun ki o, qəlbdir." Peyğəmbər (salləllahu aleyhi və sələm) qəlbin düzəlməsini bədənin düzəlməsi üçün gərəkli amil olduğunu bəyan etmişdir.Bədən doğru və dürüst olmayacağı zaman bu, qəlbin doğru və dürüst olmadığına dəlalət edəcək. Çünki imanlı qəlb sağlam olur.Buradan məlum olur ki, iman kəlməsini dilə gətirib ona əməl etməyən şəxsin qəlbi iman

---

[630] Məcmu`əl-fətəva:7/187.Mütləq imanın gərəkli olduğuna dair Şeyxul-İslamın qeyd etdiyi sözlər, müxaliflərin əqli şübhələrinin altıncı şübhəsinə cavab veriləcəyi əsnada bəyan ediləcək.

gətirmiş deyil.Hətta imanın izharı məcburiyyət səbəbilə mümkünsüz olduğu zaman insanın öz daxilində bunu dilə gətirməsi və gizlində etibar etdiyi şəxs ilə bunu paylaşması gərəkdir.Osmanın bu xüsusda dediyi kimi bunun, həmin şəxsin üz cizgilərində və danışdığı ifadələrində üzə çıxması labüddür.Bunun izləri istər söz istərsə də əməl ilə heç vaxt üzə çıxmayacağı zaman bu, qəlbdə imanın olmadığına dəlalət edəcək.Bu isə bədənin qəlbə tabe olduğunu göstərir. Bilmək lazımdır ki, hər hansı bir cəhətdən bir şey qəlbdə qərarlaşdığı zaman mütləq onun nəticəsi və tələbi bədəndə üzə çıxır."[631]

İbn Muflih (rahiməhullah) demişdir: "Şeyx Təqiyyuddin demişdir (ibn Teymiyyə qəsd edilir): Peyğəmbər (salləllahu aleyhi və səlləm) qəlbin düzəlməsini bədənin düzəlməsi üçün gərəkli amil, onun pozulmasını isə bədənin pozulması üçün gərəkli amil olduğunu xəbər vermişdir.Bədənin zahiri sağlam deyil pozğun görünəcəyi zaman qəlbin həmçinin sağlam deyil pozğun olduğu bilinəcək.Pozğun zahirin sağlam daxil ilə birgə olması qeyri-mümkündür.Sağlam zahir ilə pozğun daxilin olması həmçinin qeyri-mümkündür. Çünki zahirin sağlam və pozğun olması daxilin sağlam və pozğun olmasına bağlıdır.

Osman (r.a) demişdir: Elə bir kimsə yoxdur ki, bir şey gizlətdiyi zaman Allah bunu onun üz cizgilərində və dil ifadələrində aşkara çıxartmasın."[632]

---

[631] Məcmu`əl-fətəva:14/131.

[632] əl-Ədəbu-ş-şər`iyyə:1/161.

Şeyx Hafiz əl-Hakəmi (rahiməhullah) demişdir: "Qəlb əməli sabit olduğu halda bədən əzalarının zahiri əməllər ilə boyun əyməməsi ağılasığmazdır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir:"Ağah olun ki, bədəndə bir ət parçası vardır ki, o, düzələcəyi zaman bütün bədən düzəlir, o, pozulacağı zaman isə bütün bədən pozulur.Agah olun ki o, qəlbdir." Buradan sənə aydın olur ki, Əhli sunnədən imana dair, ərəb dilində üstün görüşə əsasən onun təsdiq olduğunu deyən şəxslər heç şübhəsiz ki, bununla adi təsdiqi deyil yalnız zahiri və daxili boyun əyməni gərəkdirən təslimiyyət məzmunlu təsdiqi qəsd etmişlər."[633]

7-İbn Əbu Şeybə Həsənin (rahiməhullah) belə dediyini rəvayət etmişdir: İman boş xülyalar və arzular deyil.Ancaq o, qəlbə yerləşən ve əməllərin təsdiq etdiyi bir şeydir!."[634]

Şeyxul-İslam (rahiməhullah) bu əsəri az öncə nəql edildiyi kimi dəlil olaraq qeyd etmişdir.

Yekun olaraq deyiləcək: Zahir ilə daxil arasında olan bağlılıq iman məsələsinə dair Əhli sunnə ilə murciələr arasında olan ayırıcı bir xüsusiyyətdir.Əgər biri bu bağlılığı bilərsə insanların çoxlu ixtilaf etdkləri bu kimi mövzularda olan bir çox şübhələrdən azad olar."[635]

---

633 Məaricul qabul:2/594.

634 "əl-Musannəf, ibn Əbu Şeybə:30351,35211-ci rəqəm". "əl-İmən, ibn Əbu Şeybə:93"."əl-İbənə, ibn Batta:2/805_1094-cü rəqəm".Hədisin isnadı səhihdir." Əqualu-t-təbiin fi məsəili-t-təuhid val imən:3/1134_1333-cü rəqəm" kitabına bax.

635 Məcmu`əl-fətəva:7/645.

# Dördüncü araşdırma:

## Üz çevirmə küfrü

Elm əhlindən bir qism insan bütövlüklə zahiri əməlin tərkini üz çevirmə küfrünə daxil olan formalardan biri olduğunu və onun boyun əymə və sevgi kimi qəlb əməlinin yoxluğuna dəlalət etdiyini hesab etmişlər.

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhul-lah) İslamı pozan amilləri bəyan edərkən demişdir: "Onuncu: Uca Allahın dinindən üz çevirmə, onu öyrənməmə və ona əməl etməmə. Dəlil olaraq Uca Allah buyurur: *"Rəbbinin ayələri ilə öyüd-nəsihət verildikdən sonra onlardan üz çevirən kəsdən daha zalım kim ola bilər?! Biz, şübhəsiz ki, nadanlardan intiqam alacağıq!"*[636][637]

Şeyx Abdur-Rahmən bin Nasir əl-Bərrak (hafizahullah) demişdir: "Əməlin bu formada olduğunu, əməlin kamillik şərti olduğunu demək doğru deyil.Çünki bunu demək, hər hansı bir insanın: "Allahdan başqa haqq məbud yoxdur və Muhamməd Onun elçisidir",- sözünü deyib heç vaxtı İslam dinindən olan bir şeyi etməyəcəyini ifadə edir.Məhz bu, şeyx Muhamməd bin Abdul-Vahhəbin "İslamı pozan amillər" kitabında ifadə etdiyi və onu onuncu pozan amil etdiyi məsələdir: İslam dinindən üz çevirmək, onu öyrənməmək və ona əməl etməmək."

---

[636] əs-Səcdə:22.

[637] Nəvaqidul isləm, dımnə məcmu`əl-fətəva, şeyx Muhamməd bin Abdul-Vahhəb: 6/259.

Habelə şeyx demişdir: "İnsan adi qəlb təsdiqi ilə yaxud adi dil təsdiqi ilə, buna qəlb əməli əlavə edilməyincə mömin olmur.Bütün bədən əməlləri, namaz, zəkat, oruc, həcc, cihad, halalı halal sayma, haramı isə haram sayma olmayacağı zaman insan sadiq yaxud təsdiq edən hesab olunmayacaq. Artıq vurğulanmışdır ki, İslamı pozan amillərdən biri insanın, özünü müsəlman adlandırıb şəhadəti dilə gətirəcəyi təqdirdə belə islam dinindən bötüvlüklə üz çevirməsidir. Həmin şəxs dindən üz çevirir.Bu səbəbdən həmin şəxsin şəhadəti heç bir şeyə dəlalət etmir və əməli gerçəyə dayanmır."[638]

Şeyx Abdul-Əziz bin Abdullah ər-Racihi (hafizahullah) demişdir: "Şəhadəti dilə gətirənin mömin olacağına dair gələn həmin bu nasslar əməli tərk etməyi mümkünsüz edən həmin qeydlərlə bağlıdır.İnsanın Allahdan başqa ibadət ediləni inkar etməsi labüddür.Heç bir əməl etməyən isə Allahın dinindən üz çevirəndir.Bu isə, mürtədlik növlərindən biridir.Ümumiyyətlə heç bir əməl etməyib dindən üz çevirmək, onu öyrənməmək və Allaha ibadət etməmək İslamı pozan amillərdən biridir."[639]

Şeyx Abdul-Əziz bin Muhamməd Abdul-Lətif (hafizahullah) demişdir: "Zahiri əməlin cinsi imanın özəyindən olduğu zaman bəlli olur ki, onu tərk edib ona riayət etməmək həmin

---

[638] Şeyxin audio dərslərindən alınmışdır (ləvamiul ənvar fi aqaid əhlil əsər, Hafiz Əbul Həsən Əli bin Şukr əş-Şafii). İrəlidə üz çevirmə küfründən çıxmaq üçün tələb olunan əməlin bəyan edilməsinə dair şeyxdən önəmli nəql qeyd ediləcək.

[639] Şərhu-t-tahaviyyə.On yeddinci sual.Bu bölümün üçüncü fəslində şeyxin sözləri dolğun surətdə qeyd ediləcək.

əməldən bütövlüklə üz çevirməyi ifadə edir.Bu üzdən o, islamdan çıxaran küfrdür.

Lakin bilmək lazımdır ki, üz çevirmənin hər bir növü İslamdan çıxarmır.Onun bəzisi, qeyd etdiyimiz kimi İslamdan çıxarandır.Həmin üz çevirmə, imanın səhihliyi üçün şərt hesab edilən əməlin (itaətin) cinsindən üz çevirmədir.Şeyxul-İslam bu xüsusda demişdir: "Artıq bəlli olmuşdur ki, dində söz və əməlin olması labüddür.Habelə bir insanın namaz, zəkat, oruc və digər vaciblər kimi heç bir zahiri vacibi yerinə yetirmədən qəlbi ilə yaxud qəlbi və dili ilə Allaha və Peyğəmbərə (salləllahu aleyhi və sələm) iman gətirməsi qeyri-mümkündür."[640]

Həmçinin insanı İslamdan çıxarmayan üz çevirmə vardır. Məsələn: Bir insanın imanın özəyinə sahib olması, ancaq şəriətin vacib buyurduğu bəzi vacibləri yerinə yetirməkdən üz çevirməsidir.Bununla da, biz zahiri əməlin[641] (itaət yaxud tabeçilik) cinsindən külli üz çevirmə ilə bəzi əməllərdən cuzi üz çevirmə arasında olan fərqi dərk etmiş oluruq.Birinci imanı pozur və tamamilə ona zidd gəlir.Digəri isə imanı nöqsanlı edir lakin bütövlüklə ona zidd gəlmir."[642]

Muhamməd bin Abdullah əl-Vuheybi (hafizahullah) demişdir: "Beləliklə də biz, ayələrin təfsiri və üz çevirmə küfrü

---

640 Məcmu`əl-fətəva:7/261.

641 Müəllifin haşiyəsində gəlmişdir: "Həmin üz çevirməyə, namazın tərk edilməsi kimi tərk etmənin küfr olacağına dəlalət edən digər şeylər əlavə olunur.Buna dair ətraflı söhbət açılacaq.

642 Nəvaqidul imənilqauliyyə val aməliyyə:346-cı səh.Müəllif üz çevirmə küfrü haqqında geniş söhbət açıb onun anlamını, dəlillərini və ona dair gələn əsərləri bəyan etmişdir."344-357-ci səh.bax.

haqqında sözə dair imamların dediklərindən elə bir nəticə çıxarırıq ki, İslamı pozan üz çevirmə, imanın özəyindən üz çevirməklə olur.[643]İnsan bacardığı halda dinin əsaslarını öyərnməkdən və ya onu qəbul edib qəlb ilə ona təslim olmaqdan tamamilə üz çevirir yaxud bədən əzaları ilə əməl etməkdən (əməlin cinsini tərk etməklə) tamamilə üz çevirir yaxud da ki, Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hökmündən üz çevirir. Biz bu araşdırmada, imanın səhihliyi üçün şərt olan bədən əzaları ilə əməlin yaxud əməlin cinsinin mövcud olmasının zəruriliyini və bədən əzaları ilə əməli bütövlüklə tərk edib ondan üz çevirmənin İslamı pozan amillərdən biri olduğunu bəyan edəcəyik.Çünki bunun nəticəsində qəlb əməlinin qəbul etmə, təslimiyyət və boyun əymədən məhrum olması qaçılmaz olur."[644]

## *Əlavə*:

Zahiri əməli bütövlüklə tərk etməyin küfr olmasına dair sözün, boyun əymə, təslimiyyət və sevgi kimi qəlb əməllərinin yoxluğuna dəlalət etməsi heç də gizli olmayan

---

[643] İbnul Qayyim (rahiməhullah) bu xüsusda demişdir: "Üz çevirmə küfrü, bir şəxsin dinləyişi və qəlbi ilə Peyğəmbərdən üz çevirməsi, onu nə təsdiq nə də ki, təkzib etməməsi, onu nə özünə dost tutub nə də ki, düşmən seçməməsi və onun gətirdiyi dini qulaq ardına vurmasıdır.Buna misal olaraq, Bənu Abdu-Yəleyl qəbiləsindən olan bir şəxs Peyğəmbərə(salləllahu aleyhi və səlləm) belə demişdir: "And olsun Allaha ki, sənə bir söz deyəcəm: Əgər sən doğru danışansansa, belə olan halda mənim səni rədd etməyim yaramaz.Əgər sən yalançısansa, belə olan halda səninlə danışmağı özümə sığışdırmaram." (mədəricu-s-səlikin:1/346.miftəhu dəri-s-səadət:1/94). İbnul Qayyimə görə üz çevirmə, İslama girdikdən sonra tabeçilik və əməldən üz çevirmə deyil birbaşa dindən üz çevirmədir.Şeyx Muhamməd bin Abdul-Vahhəbin yuxarıda keçən sözü isə aşkar göstərir ki, şeyx İslama daxil olma hasil olandan sonraki üz çevirməni qəsd edir.Məhz bu səbəbdən onu İslamı pozan amillərdən biri etmişdir.

[644] Nəvaqidul iməni-l-i`tiqadiyyə:2/131.

bəlli görüşdür. Bu, öncə qeyd edilən Əhli sunnəyə görə zahir ilə daxil arasında olan bağlılığın isbat edilməsini tələb edən amildir.Murciələr isə fərqli görüşdədirlər.Növbəti fəsildə əməli tərk edənin küfrünə dair dəlil və sübutlar qeyd ediləcək.

Həmçinin İslamı pozan bu amilin şeyx Muhamməd bin Abdul-Vahhəbin qeyd etdiyi üz çevirmə küfrünə daxil edilməsi açıq-aydın bir məsələdir.Doğrusunu Allah bilir.

# İKİNCİ FƏSİL

## Bütövlüklə zahiri əməli tərk etməyin imanı pozan amil olduğuna dair dəlillər

İki araşdırmadan ibarətdir:

1-Çəkişmə nöqtəsinin təyin edilməsi.

2-Əhli sunnənin dəlilləri.

Üç mətləbdən ibarətdir:

1-Zahir ilə daxil arasında olan bağlılıq.

2-İmanın yalnız əməl ilə doğru olacağına və onun imanın ayrılmaz hissəsi olmasına dair Əhli sunnənin icması.

3-Səhabələrin namazı tərk edənin küfrünə dair icması.

# Birinci araşdırma:

## Çəkişmə nöqtəsinin təyin edilməsi

Burada yer alan çəkişmə, zahiri əməli imandan çıxaran murciə firqələri və özlərini sunnəyə nisbət etdikləri halda bu məsələdə çaşqınlığa düşən bəzi şəxslər ilə cərəyan edir. Onlar iddia etmişlər ki, bədən əzalar ilə olan əməllər sadəcə imanın kamillik şərtidir və onu bütövlüklə tərk edən nicat tapmış və Allahın istəyi altında olan müsəlmandır.Bununla bərabər onlar imanın söz və əməl olduğunu, habelə onun artıb azaldığını deyirlər.Bununla da, onlar sələfdən və imamlardan varid olan sözü əşari və maturudilərdən olan kəlam əhlindən alınmış bidət bir sözlə bir arada cəm etmişlər. Çünki onlardan öncə bu sözü deyən bilinməmişdir.

Burada yer alacaq araşdırma sunnəyə nisbət olunan və onun şənini uca tutan və ona çağıranlar ətrafında gedəcək. Burada güdülən məqsəd, müsəlmanların bir cərgədə olması, habelə onların Əhli sunnə vəl cəmaatın və sələfi salehin mənhəci ətrafında cəmləşməsıarzusudur.

Onlar ilə aparılan çəkişmə nöqtəsini aşağıda göstərilən qısa məqamlarda görmək mümkündür:

1-İxtilaf yoxdur ki, təsdiqin yoxluğu həqiqi surətdə küfrü vacib edir.Bir şəxsin, münafiqlərdə olduğu kimi təsdiqi olmazsa belə islamı pozan zahiri amili olmayacağı təqdirdə zahirinə uyğun olaraq ona müsəlman hökmü çıxarılacaq.

2-İxtilaf yoxdur ki, qəlb əməlinin yoxa çıxması imanın yoxa çıxmasını qaçılmaz edir və tələffüz və təsdiqi faydasız edir.Bu, həmçinin həqiqətə verilən hökm növündəndir. Yəni, Allah qatında olana baxılır.

3-İxtilaf yoxdur ki, dil sözü imanda labüd olan dayağdır və şəhadəti demək iqtidarında olduğu halda onu dilə gətirməyən şəxs həm zahirdə həm də daxildə kafir olur.

4-Çəkişmə yalnız zahiri əmələ dairdir: O, digər dayağlarda olduğu kimi imanın səhihlik varlığına dayanan imanın dayağıdırmı yoxsa o, zahirdə olmayacağı halda belə qəlbdə səhih imanın yer alması mümkün olan imanın səmərəsi yaxud əlavə dayağı yaxud kamillik şərtidir?[645]

5-Çəkişmə bir yaxud iki əməlin yaxud bir neçə əməlin yoxluğuna dair deyil, çəkişmə yalnız bütün zahiri əməlin yoxa çıxmasına dair aparılır.[646]

---

645 Bəzən müxalif, zahiri əməlin əlavə dayaq yaxud səmərə yaxud kamillik şərti olduğunu bildirmir.Önəmli olan isə, onun həmin şeyi digər hissələr və dayaqlar kimi etməməsidir.Müxalif hesab edir ki, onun bütövlüklə tərk edilməsi imanı pozmur.

646 Bəziləri bu məsələni əməlin cinsini tərk etmək olaraq ifadə edirlər.Bu araşdırmada həmin istilahın istifadə edilməməsinə üç səbəb var:

Birinci: Cinsul aməl, şeyx Ğuneymanın qeyd etdiyi kimi əməl adını daşıyan ən kiçik formadır.Onun, əməlin labüdlüyünü ifadə edərkən belə istifadə olunması daha doğrudur: İmanın səhihliyi üçün cinsul aməlin olması labüddür. Onun tərk edilməsi ifadə edilərkən: Cinsul aməli tərk etmək küfrdür,-demək doğru deyil.Əksinə belə deyilməlidir: Bütün zahiri əməlləri tərk etmək yaxud onların bütövlüklə tərki küfrdür.

İkinci:Bəziləri bu istilahı doğru anlamayıblar və düşünüblər ki, burada hər hansı bir əməlin cinsinin tərk edilməsi qəsd edilir.Misal üçün, namazın cinsi və ya zəkatın cinsi və ya orucun cinsi və ya valideynlərə yaxşılığın cinsi və sayirə.Bu tamamılə yanlış fikirdir və həmin ifadə qətiyyən ona dəlalət etmir.

Üçüncü:Onlardan bəziləri "cinsul aməl" kəlməsini zahiri əməl yaxud bədən əzalarının əməli çərçivəsinə salmadan işlədirlər.Beləliklə də, həmin şəxs

Fərz edilən məsələ, dil ilə haqq olan şəhadəti gətirib qəlbi ilə bunu təsdiq edən və sevgi, qorxu, təslimçilik kimi gərəkli qəlb əməllərinə sahib olub ömründə bir dəfə olsun Allaha səcdə etməyən, fərz və nafilə əməllərindən heç bir şey etməyən və Allaha yaxınlaşdıran heç bir əməl etməyən şəxs ətrafında cərəyan edir.Baxmayaraq ki, həmin şəxs bunu etmək iqtidarındadır və şəriətin ona vacib buyurduğu əməllərdən agahdır.Həmin insana bədən əzaları ilə edilən əməllərin yoxluğu ilə bərabər dil sözü, habelə qəlb sözü və əməli fayda verəcəkmi? Belə olan halda imanın səhihliyi üçün qəlbin gərəkli əməllərinin mövcudluğu ümumiyyətlə təsəvvür edilə bilərmi? Habelə həmin adama kafir hökmü çıxarılacaqmı yoxsa ona Allahın istəyi altında olan müsəlman deyiləcək?

6-Buradaki araşdırma, Allah qatında həmin şəxsin halı etibarı ilə onun hökmünə nəzər salır.Yəni, burada onun zahiri etibarı ilə hökm vermək deyil, yalnız həqiqətə hökm vermək məqsədi güdülür.Çünki əksər hallarda, insanın özünün iqrar və etiraf etməsi istisna edilməklə qüdrət və imkan sahibi hər hansı bir şəxsin bədən əməllərindən heç bir əməl etmədiyinə dair hökm çıxartmaq çətin olur.

7-Araşdırma, şəriətin məramlarından agah olub mükəlləfiyyət çərçivəsinə daxil edilən şəxslə bağlıdır.Əhkamların

---

yekdillik olan formanı, qəlb əməlinin tərk edilməsini çəkişmə mövzusuna daxil etmiş olur.Bu səbəbdən,-doğrusunu Allah bilir, şeyx ibn Useymin bu kəlmə haqqında: Bu mənasız bir sözdür,-demişdir.

Bu istilahı bildiyimə görə ilk istifadə edən, məcmu`əl-fətava:7/616 kitabında Şeyxul-İslam ibn Teymiyyə (qaddəsəllahu ruhahu) olmuşdur. Həmçinin o, bu ifadəni digər yerdə“cinsut təsdiq” olaraq ifadə etmişdir:7/377.

çatmadığı səbəbilə onlardan xəbərsiz olan şəxs isə çəkişmə mövzusundan kənardır.Həmçinin bu məsələ güc və imkana malik olduğu halda əməli tərk edənə aid edilir.Lakin kafirin şəhadəti dilə gətirib dərhal ölməsi kimi əməli yerinə yetirməyə imkan tapmadığı üçün onu tərk edən şəxs,əməli etmək imkanı qazanmadığı üçün üzürlüdür.

Çəkişmə nöqtəsi bəlli olduğu zaman bilmək lazımdır ki, açıq-aydın dəlillər və ümmətin sələfinin yekdil görüşü, imanın söz və əməl olduğuna dəlalət edir.Zahiri və daxili söz, habelə zahiri və daxili əməl.Həmçinin iman yalnız bu dayağların bir arada gəlməsilə yetərli və doğru olacaq. Etiqadsız söz və əməl yetərli olmadığı kimi habelə əməlsiz söz və etiqad yetərli deyil.

Ümmətin sələfi bu etiqadda olmuşlar.Onlar bu məsələni müxtəlif təbirlərlə şərh edib bəyan etmiş və doğru yoldan azmış şəxslər istisna olmaqla onlara bu məsələdə kiminsə müxalif olması bilinməmişdir.

Hər kim peyğəmbərlərin təbliğ etdiyi tövhidi bilib “Lə iləhə illəllah” kəlməsinin mənasını və onun haqqlarını anlayar, habelə dəlillərdə gəldiyi kimi zahirlə daxil arasında olan bağlılığa iman gətirər və Əhli sunnənin imanın söz və əməl olmasına icma etmələrini qəbul edərsə, onun fərz edilmiş məsələdə qeyd etdiyimiz şəxsin kafir olmasına hökm verməkdən başqa çıxış yolu qalmaz.Yəni, qüdrət və ikman sahibi olduğu halda ömründə Allaha bir səcdə belə etməyən, Allah üçün fərz və nafilə ibadətlərindən heç bir şeyi yerinə yetirməyən şəxs.Belə şəxsin qəlbində doğru

imana sahib olmasının mümkünlüyünü söyləmək, zahir ilə daxil arasında olan bağlılığı inkar etməyə dayanan batil sözdür.Əksinə belə şəxsin qəlbində zındığlıq və nifaqdan savayı heç bir şey ola bilməz.İrəlidə buna dair Şeyxul-İslam ibn Teymiyyənin sözləri gələcək.

# İkinci araşdırma:

## Əhli sunnənin dəlilləri

Əhli sunnə bədən əməllərinin imandan olmasına dair Quran və sunnədən on dəlil gətirmişlər.Bu dəlillər birinci bölümün birinci fəslində artıq qeyd edildiyi üçün həmin dəlilləri burada yenidən qeyd etməyə heç bir lüzum yoxdur.Çünki müxalif imanın söz və əməl olduğunu qəbul edir.Lakin onun çəkişdiyi mövzu, zahiri əməlin dayaq olub olmaması və əməlləri bütövlüklə tərk edənin kafir olub olmaması məsələsi ətrafındadır.Bu səbəbdən söhbətimiz, mövzunun bu hissəsi ilə əlaqəli olan dəlillərin qeyd edilməsi ilə məhdudlaşacaq.Beləliklə həmin məsələ üç mətləbdən ibarətdir:

*Birinci mətləb*: Zahir ilə daxil arasında olan bağlılıq.

*İkinci mətləb*:İmanın yalnız əməl ilə doğru olacağına və onun imanın ayrılmaz hissəsi olmasına dair Əhli sunnənin icması.

*Üçüncü mətləb*: Səhabələrin namazı tərk edənin küfrünə dair icması.

# Birinci mətləb:

## Zahir ilə daxil arasında olan bağlılıq "tələzum"

Artıq bu məsələyə dair öncəki fəsildə söhbət açıb tələzum anlamının mənası və dəlillərini qeyd etmişəm.Bu səbəbdən həmin məsələyə qayıtmağa lüzum duymuram.

Burada onun dəlil olaraq gətirilməsində məqsəd, zahiri əməlin daxili imanın zəruri amili və ondan ayrılmaz olmasını qeyd etməkdir.Bu üzdən ləzim (zahiri əməllər) olmayacağı zaman məlzum (daxili əməllər) olmayacaq. Qəlbdə təsdiq və sevgi olacağı zaman isə bədənin mümkün olan söz və əməl ilə zəruri surətdə hərəkətə gəlməsi qaçılmaz olacaq.Zahiri əməlin yoxluğu isə qəlb əməlinin yoxluğuna dəlalət edir.Bu isə, Əhli sunnənin icması ilə küfrdür.Qeyd edildiyi kimi müxalif həmçinin bunu qəbul edir.

Lakin əgər biri bütövlüklə zahiri əməli tərk edənə müsəlman hökmü verərsə iki haldan birinə düşmüş olacaq: Həmin şəxs cəhmilərin və onlara müvafiq olanların dediyi kimi qəlb əməlini tərk etməyin küfr olmadığını iddia etmiş olacaq yaxud da ki, murciələrin dediyi kimi zahir ilə daxil arasında olan bağlılığı, "tələzum" anlamını inkar edib bütün bədən əməllərinin yoxluğu ilə bərabər qəlbdə yetərli əməlin olduğunu təsəvvürünə gətirəcək.

Artıq Şeyxul-İslamdan nəql edilmişdir ki, qeyd edilən "tələzum" anlamını bilən şəxs insanların çox ixtilaf etdiyi bu kimi mövzularda yer alan bir çox şübhələrdən azad olacaq."

Şeyxul-İslam, zahir ilə daxil arasında olan bağlılıq dəlilini, namazı tərk edənin daxilən kafir olduğunu isbatlamaq üçün qeyd etmişdir.Bu söz, zahiri əməli tərk edənin küfrünü şamil edir.Şeyxul-İslam (rahiməhullah) həmin məsələyə dair buyurur: "Bu məsələnin iki tərəfi vardır: Birinci: Zahiri küfrün isbatına dair. İkinci: Daxili küfrün isbatına dair.

Məsələnin ikinci tərəfi, qeyd edildiyi kimi imanın söz və əməl olması üzərində qurulur.Bir insanın Allahın ona namazı, zəkatı, orucu və həcci vacib etdiyinə qəlbində sabit imanla inandığı bir halda Allah üçün ömründə bir dəfə olsun səcdə etməməsi və Allahın buyurduğu zəkat və həcc kimi ibadətləri yerinə yetirməməsi qeyri-mümkündür.Bu qeyri-mümkündür.Bunu doğru iman sahibindən yox, yalnız qəlbdə zındığlıq və nifaq olan şəxsdən gözləmək olar."[647]

Həmçinin demişdir: "Kim zahirlə daxil arasında olan bağlılığı bilərsə bu mövzuya dair şübhədən azad olar və fəqihlərdən: Əgər insan onun vacibliyini iqrar edib onu etməkdən imtina edərsə öldürülməz[648] yaxud müsəlman olaraq öldürülər[649],-sözünü deyənlərin, murciələr və cəh-milərin, habelə qəti iradə ilə bərabər dolğun qüdrətin heç bir

---

[647] Əl-İmanul əusat, dımnə məcmu`əl-fətava:7/616.

[648] Namazı tərk edənə dair hənəfi məzhəbinə işarədir.Belə ki, onlar onun kafir olmadığını və cəzasının ölüm olmadığını hesab edirlər.Onların məzhəbinə əsasən həmin şəxs namaz qılanacan həbsdə saxlanılır.

[649] Maliki və Şafii məzhəbinə işarədir.

əməl olmadan mümkün olacağını deyənlərin şübhəsinə düşmüş olduqlarını biləcək.Bu səbəbdən bu kimi şəxslərə ölüm hökmünü verməkdən imtina edən bəzi fəqihlər öz görüşlərini iman məsələsi, əməllərin imandan olmaması üzərində qurmuşlar.

Artıq qeyd edilmişdir ki, əməllərin cinsi "cinsul aməl" qəlb imanının zəruri amillərindəndir.Heç bir zahiri əməl olmadığı halda qəlbdə tam imanın yer alması qeyri-mümkündür.Zahirin, imanın zəruri amillərindən biri edilməsi yaxud imanın bir hissəsi edilməsi isə eynidir.Artıq buna dair açıqlama gəlmişdir."[650]

Həmçinin ibnul-Qayyim (rahiməhullah) bunu həmin məsələyə şamil edərək demişdir: "İman, qəlb əməlinin yoxa çıxması ilə yoxa çıxacağı zaman onun ən böyük bədən əməli ilə yoxa çıxması heç də təəccüb doğurmur.Xüsusən də, qeyd edildiyi kimi bu, qəti təsdiqin yoxluğuna dəlalət edən qəlb sevgisi və tabeçiliyinin yoxluğuna dəlalət edən amil olacağı zaman belə olacaq.Çünki qəlbin itaətsizliyi bədən əzalarının itaətsizliyini zəruri edir.Çünki əgər qəlb itaət edib tabe olsaydı bədən əzaları həmçinin itaət edib tabe olardı.İtaət və tabeçiliyin yolxuğu itaəti tələb edən təsdiqin yoxluğunu zəruri edir.Bu, imanın gerçəyidir.İman, qeyd edildiyi kimi adi təsdiq deyil və yalnız itaəti və tabeçiliyi tələb edən təsdiqdir.Habelə doğru yol.O, sadəcə haqqın bəlli olub aydınlaşması deyil.Əksinə o, tabeçiliyi və onun tələbinə uyğun əməli gərəkdirən bilikdir.Birinci, doğru yol adlanarsa belə o, hidayəti tələb edən dolğun doğru yol deyil.Eləcə də,

[650] əl-İmənul əusat, dımnə məcmu`əl-fətəva:7/616.

**təsdiqin etiqad edilməsi təsdiq adlanarsa belə o, imanı vacib edən təsdiq deyil.Sənin bu əsası gözdən keçirib ona riayət etməyin gərəkdir."[651]**

[651] əs-Salətu və hukmu tərikihə:46 səh.

# İkinci mətləb:

## İmanın yalnız əməl ilə doğru olacağına və onun imanın ayrılmaz hissəsi olmasına dair Əhli sunnənin icması

Belə ki, Əhli sunnə alimlərindən bir çoxu bədən əməlləri olmayacağı təqdirdə imanın yetərli olmayacağını ifadə edən bir-birinə yaxın sözlər icma olaraq nəql etmişlər.

***Bu sözləri nəql edən alimlərdən bəziləri:***

1-İmam əş-Şafii (rahiməhullah, hic. 204 ildə v.e) demişdir: "Səhabələr, tabiinlər, onlardan sonra gələnlər və yetişdiyimiz insanların icması onların belə demələrində olmuşdur: "İman söz, əməl və niyyətdir və üçündən biri digərsiz yetərli deyil".[652]

[652] Şərhu usuli i`tiqadi əhlis sunnə, Lələkai:5/956.Məcmu`əl-fətava:7/209.İmam Şafiinin sözündə iki anlaşılmazlıq üzə çıxır.

Birinci: Deyilənə görə, imam Şafii namazı tərk edəni təkfir etmir.Necə olur ki, o bu məsələyə dair icma nəql edir.Buna iki yöndən cavab veriləcək.Birinci: İmam Şafiinin namazı tərk edəni təkfir etmədiyinə dair qəti əminlik ifadə etmək doğru deyil.Belə ki, Muzəninin bacısı oğlu olan Tahavi ondan yalnız namazı tərk edənin təkfir olunacağına dair söz nəql edir.İbn Kəsir isə ondan iki görüş nəql edir, təkfir və əksini.Bu ayənin təfsirinə bax: "*Onların arxasınca namazı buraxıb şəhvətə uyan bir nəsil gəldi. Onlar ziyana uğrayacaqlar*". Məryəm:59.İkinci: Bu iki məsələ arasında bağlılıq yoxdur.Əməli bütövlüklə tərk edənin təkfir olunması və namazı tərk edənin təkfir olunması fərqli məsələlərdir.Birinci sözü deyənin mütləq ikincini deməsi heç də gərəkli deyil.Çünki Əhli sunnə bütövlüklə zahiri əməlin tərk olunması ilə imanın doğru olmayacağına yekdildirlər. Lakin onlar namaz kimi fərdi əməllərə dair ixtilaf etmişlər.Bu məsələnin daha geniş izahı irəlidə şeyx ibn Bəzın sözündə qeyd ediləcək.

2-İmam əl-Humeydi (rahiməhullah, hic. 219 ildə v.e) demişdir: "Mənə, bəzi insanların belə dediyi xəbər verilmişdir: "Hər kim danmayacağı halda namazı, zəkatı, orucu və həcci iqrar edib ölənəcən onlardan heç bir şeyi etməzsə yaxud ölənəcən arxasını qibləyə tutub namaz qılarsa, habelə fərzləri və qibləyə tərəf yönəlməyi iqrar edəcəyi zaman bunu tərk etməyin onun imanına təsir edəcəyini bilərsə, həmin şəxs mömindir.Mən deyirəm: Bu, Allaha aşkar küfr etmək və Allahın kitabı, Peyğəmbərin sunnəsi və müsəlmanların əməlinə zidd gəlməkdir.İzzət və Cəlal sahibi olan Allah buyurur: *"Allaha -dini yalnız Ona xas edərək, batildən haqqa (islama) dönərək -ibadət etsinlər, namaz qılıb zəkat versinlər.*

---

İkinci: Deyilmişdir ki, imam Şafiinin "söz, əməl və niyyət" sözlərində gələn əməl sözü, qəlb əməli və bədən əməlindən ibarət əməllər toplumunu şamil edir.Buna iki cavab veriləcək: Birincisi: İmam Şafii burada qəlb əməlini niyyət adı ilə ifadə etmişdir.Bu isə onun əməl sözünü deməklə bədən əməllərini qəsd etdiyini göstərir. İkinci: Fərz edək ki, o, hər iki əməli və imanın onların hər ikisi olmayacağı halda yetərsiz olacağını qəsd etmişdir.Bizim dediyimiz də məhz budur.Bu hissələrin bir araya gəlməsi labüddür:Zahiri və daxili söz, zahiri və daxili əməl.

Sonralar mən imam Şafiidən gələn bu xəbəri şübhə altına qoyub əl-Ləlәkəinin həmin rəvayəti isnadsız nəql etdiyini iddia edən bəzi şəxsləri gördüm.Ancaq həmin şəxsin diqqətindən yayınmışdır ki, əl-Ləlәkəi və Şeyxul-İslam həmin rəvayəti imam Şafiinin "əl-Umm" kitabından nəql etmişlər.Belə olan halda hansı isnaddan söhbət gedə bilər axı? əl-Ləlәkəi demişdir: "İmam Şafii "əl-Umm" kitabının "ən-niyyətu fi-s-salət" bölümündə demişdir: "Biz niyyətsiz namazın yetərli olmayacağına Ömər bin Xəttabın (r.a) Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) rəvayət etdiyi hədisi dəlil tuturuq: "Əməllər yalnız niyyətlərə görədir." Daha sonra dedi: "İnsanların icması onların belə demələrində olmuşdur...".Bundan sonra hansı isnaddan söhbət gedə bilər? Şeyxul-İslam isə həmin icmanı qeyd edib bir sıra yerdə onu dəlil olaraq qeyd etmişdir. Həmin yerlərdən biri yuxarıda göstərilmişdir.İbn Teymiyyə orada demişdir: "Şafii "əl-Umm" kitabının "ən-niyyətu fi-s-salət" bölümündə demişdir." Habelə demişdir "7/308":"Bir sıra insanlar buna dair icma hekayət etmişlər.Artıq biz Şafiidən buna dair icma qeyd etdiyini vurğulamışıq.O, "əl-Umm" kitabında demişdir: Səhabə və tabiinlərin icması onların belə demələrində olmuşdur...".(məcmu`əl-fətəva:7/511). Sələfin məzhəbini təsbit edən bu önəmli sözlər çap edilmiş "əl-Umm" kitabında mövcud deyil.Lakin bu heç də, zərər vermir.Çünki artıq bunu iki böyük imam isbat etmişlər.

Doğru-düzgün din budur!" Hənbəl dedi: Əbu Abdullah demişdir yaxud onun belə dediyini eşitdim: Kim bunu deyərsə Allaha küfr etmiş olar və Allahın buyuruğunu və Peyğəmbərin gətirdiyini rədd etmiş olar."[653]

3-İmam əl-Əcurri (rahiməhullah, hic.360 ildə v.e) demişdir: "Lakin biz-Allaha həmd olsun- Qurana, sunnəyə və adları dillər əzbəri olan müsəlman alimlərinin sözünə uyğun söz deyirik.Artıq biz onları qeyd edib demişik ki, iman, yəqin təsdiqi əhatə edən qəlb biliyi, dil sözü və bədən əzalarının əməlidir və insan yalnız bu üçü olacağı zaman mömin olur.Onlardan heç biri digərsiz yetərli deyil.Bundan ötrü Allaha həmd olsun".[654]

Həmçinin demişdir: "Bilin ki,-Allah bizə və sizə rəhm etsin-, müsəlmanların alimləri imanın bütün məxluqata vacib olduğunu etiqad edirlər.O, qəlb ilə təsdiq, dil ilə iqrar və bədən əzaları ilə əməldir.

Sonra bilin ki, qəlbin biliyi və təsdiqi yalnız dil ilə olan tələffüzün olacağı təqdirdə yetərli olacaq.Qəlb ilə bilik və dil ilə tələffuz isə bədən əzaları ilə əməl olmayınca yetərli olmaz.Əgər bu üç xislət bir arada gələrsə insan mömin olar.Buna Quran, sunnə və alimlərin sözü dəlalət edir."[655]

---

[653] Xalləl "əs-Sunnə:3/586,1027." Ləlakəi "Şərhu usuli i`tiqadi əhlis sunnə:5/957, 1594."Şeyxul İslam bu rəvayəti həmin mövzuda sübut gətirərək "əl-İmanul kəbir" kitabında və "əl-Məcmu`əl-fətava:7/209" kitabında nəql etmişdir.

Humeydi və imam Əhmədin sözləri, fərzləri iqrar etdiyi halda onu tərk edənin təkfir ediləcəyinə dair açıq-aydındır.Bu, Ömərin xadimi Nəfiin sözünə bənzəyir.Bu söz irəlidə gələcək.

[654] Əl-Əcurri "əş-Şəria:2/686".

[655] Əl-Əcurri "əş-Şəria:2/611". Bəziləri iddia etmişlər ki, burada qeyd edilən hissələr kamillik mənasını daşıyır.Yəni: Yetərli deyil sözünü: Kamil deyil olaraq

Həmçinin demişdir: "Bilin ki,-Allah bizə və sizə rəhm etsin-, müsəlmanların alimləri imanın bütün məxluqata vacib olduğunu etiqad edirlər.O, qəlb ilə təsdiq, dil ilə iqrar və bədən əzaları ilə əməldir.

Habelə qəlb ilə bilik və dil ilə tələffüz bədən əzaları ilə əməl olmayınca yetərli olmaz.Əgər insanda bu üç xislət yer alarsa o, mömin olar.Buna Quran, sunnə və alimlərin sözləri dəlalət edir.

Qəlb dilin tələffüz etdiyini təsdiqləməyəcəyi zaman söz heç bir fayda verməyəcək.İman, ancaq Allahın qəlbə əmr etdiyini və dilin tələffüz etdiyini təsdiq etmək üçün Allahın bədən əzalarına fərz etdiyidir.Uca Allah buyurur: *"Ey iman gətirənlər! Rüku edin, səcdəyə qapanın, Rəbbinizə ibadət edərək yaxşı işlər görün ki, bəlkə nicat tapasınız."*[656] Həmçinin buyurur: *"Namaz qılıb zəkat verin"*[657] Habelə Quranın başqa yerlərində gələn ayələr. Həcc fərzi və cihad fərzi həmçinin bütün bədən əzaları ilə icra olunan fərzlərdir.

---

ifadə etmişlər.Şübhəsiz ki, bu, inadkarlıq və ədalətsizlikdir.Hətta kiçik elm tələbələri yetərli ilə"muczi" kamil "kəmil" arasında fərqi sezə bilirlər.Fəqihlər günümüzəcən yetərli qüslu və kamil qüslu ayrılıqda qeyd edirlər.Lakin əl-Əcurrinin növbəti təbiri bu batil yozumları alt-üst edir.Dedi: "Qəlbin biliyi və təsdiqi yalnız dil ilə olan nitqin olacağı təqdirdə yetərli olacaq".Əgər yetərlik kamillik mənası ilə yozulsaydı, belə olan təqdirdə dil sözünün tərki ilə bərabər imanın doğru olacağını deməyə əsas yaranardı.Bunu isə Əhli sunnədən ümumiyyətlə deyən olmayıb.

Bunun ardından (fayda verməyəcək) deyir.Bu isə həmçinin tələb olunan amilin isbatı üçün aşkar dəlildir.Müxalifin əqli şübhələrinin ikinci şübhəsinə verilən cavaba bax.

[656] əl-Həcc:77.

[657] əl-Bəqərə:43.

Bədən əzaları ilə edilən əməllər qəlb və dildə olan imanı təsdiq edir.

Əgər biri təharət, namaz, zəkat, oruc, həcc, cihad və sayira bədən əzalarına daxil olan əməllər ilə təsdiq etmədən söz və əməlsiz sadəcə biliklə qane olarsa mömin olmaz.Əgər biri bilik və sözü etiqad edərsə onun əməli tərk etməsi imanını təkzib etmiş olacaq.Onun qeyd edilənlərə əməl etməsi isə onun imanını təsdiq etmiş olur. Bunu bil! Bu, İslam alimlərinin qədimdə və sonraki vaxtlarda olan məzhəbidir.Kim bunun əksini deyərsə o, murdar murciədir. Dinindən ötrü ondan ehtiyatını qoru!".

Buna dəlil olaraq Uca Allah buyurur: *"Halbuki onlara, dini məhz Allaha məxsus edərək, haniflər kimi ibadət etmək, namaz qılmaq və zəkat vermək əmr olunmuşdu. Doğru din də elə budur!"*[658][659]

4-Əbu Talib əl-Məkki[660] (rahiməhullah, hic.386 ildə v.e) demişdir: "Həmçinin: Ümmət icma etmişdir ki, əgər bir şəxs Cəbrail hədisində imanın vəsfinə dair gələnə qeyd etdiyimiz bütün qəlb etiqadları ilə iman gətirib İslamın vəsfinə dair qeyd etdiyimiz bədən əməlləri ilə əməl etməzsə, mömin adlandırılmaz.Habelə əgər o, İslamın vəsf edildiyi bütün əməlləri edib daha sonra imandan olması kimi vəsf edilən

---

658 əl-Bəyyinə:5.

659 əl-Əcurri "əl-Ərbəinə hadisən:422 səh.İmam əl-Əcurridən başqa önəmli bir xəbər nəql olunacaq.

660 Muhamməd bin Əli bin Atiyyə əl-Harisi.Zamanıda sufilərin şeyxi olmuşdur. (siyətu ələmi-n-nubələ:16/536). Onun sözlərini yalnız Şeyxul-İslamın ondan nəql etdiyi və onun sözlərini iqrar etdiyi səbəbilə gətirdim. Kitabın ikinci hissəsində bu, qeyd ediləcək.

şeyləri etiqad etməzsə, müsəlman olmaz.Artıq Peyğəmbər, (salləllahu aleyhi və səlləm) ümmətin zəlalət üzərə birləşməyəcəyini xəbər vermişdir”.[661]

---

[661] Qutul qulub:2/253.Şeyxul İslam bunu məcmu` əl-fətavaya daxil olan iman kitabında nəql etmişdir:7/336.Şeyxul İslam bu rəvayəti nəql edərkən ona əlavə edib demişdir:"Deyirəm: Sanki o, bununla səhabələrin və onlara tabe olanların icmasını yaxud həmin adamın əhkamlarda mömin adlandırılmayacağını və onun bəzi ərkanları inkar edərsə yaxud Peyğəmbərin bunu xəbər verdiyini bildiyi halda bunu təsdiqləməzsə yaxud bidət əhlinin ixtilafını ixtilaf görərsə müsəlman olmayacağını qəsd etmişdir.Üstəlik Əbu Talib onların sözlərini gözəl bilirdi.Bu da,-doğrusunu Alah bilir- onun qəsdi olmuşdur.Belə ki, o, otuz üçüncü fəsili islamı və imanı bəyan etmək üçün təlif etmiş və camaat əhlinin məzhəbində qəlb etiqadlarının müamiləsini şərh etmişdir".Bu o deməkdir ki, səhabələr və onlara tabe olanlar imanda zahiri əməlin labüdlüyünə icma etmişlər.Əbu Talibin qeyd etdiyi kimi islam daxili etiqadsız olmadığı kimi həmçinin zahiri əməlsiz iman olmur.Bu sözlər imam Şafiinin onlardan nəql etdiyi xəbərinə uyğun gəlir.

Dedim: Fəxrur-Razi bu məsələdə imam Şafiinin sözünü qəbul etməyərək onu ziddiyyətli saymışdır.Çünki Şeyxul İslamın qeyd etdiyi kimi Razi Cəhm və Salihinin sözünü müdafiə etmişdir.Həmçinin Ğazali Əbu Talibin sözünü qəbul etməyərək onu ziddiyyətli saymış və bu sözün mötəzilələrin sözü ilə üst-üstə gəldiyini demişdir.

Ğazali demişdir:"İkinci dərəcə: Bədən əməlləri olmadan qəlbdə təsdiqin və dildə şəhadənin olması.Artıq onlar bunun hökmünə dair ixtilaf etmişlər.Əbu Talib əl-Məkki: "Bədən əzaları ilə edilən əməl imandandır və onsuz tamamlanmır,-deyərək bu məsələdə icmanın olduğunu iddia etmişdir.(qavaidul aqaid:245 səh.) Habelə Ğaqali əməlin imanın dayağı olduğunu deyənlərin mötəzilə məzhəbindən olduqlarını demişdir.

Dedim: Əhli sunnənin icma etdiyi bu məsələni mötəzilələrin məzhəbinə nisbət etmək, bu əsrdə irca şübhəsinə düşənlərin dilindən eşitmək olar.Bununla belə, onlar Ğazali ilə iki məsələdə ayrılmışlar:

Birinci: Onlar Şeyxul İslamın nəql edib təsdiqlədiyi Əbu Talib əl-Məkkinin kəlamını anlamaqda mübahisə edirlər. Lakin onun kəlamı açıq-aydındır və onda heç bir ehtimal yoxdur.

İkinci: Onlardan bəziləri əməlin imanın dayağı olduğunu dilə gətirməklə birgə həmin dayaq funksiyasının nəyi tələb etdiyini anlamamışlar.Ğazali bu məsələdə Əbu Talibin məqsədini və əməlin dayaq funksiyasının nəyi tələb etdiyini və onu tərk edənin küfrünü onlardan daha yaxşı bilirdi və bu üzdən onu qəbul etmək istəməmişdir.Ğazali –Allah onu bağışlasın- imanın səhihlik məsələsində Cəhmin məzhəbi üzərində, yəni, dil ilə tələffüz etmək imkanı olduğu halda yalnız təsdiqlə kifayətlənməyin yetərli olduğunu deyən məzhəb üzərində olmuşdur.Bax "qavaidul aqaid: 248 səh".

Həmçinin o, yuxarıda keçən sözlərindən öncə məqsədini açıqlayan çox dəyərli bir söz söyləyərək demişdir: “Əgər birinin zahiri, İslam əməlləri olduğu halda qeybə iman etiqadına qayıtmırsa, o şəxs dindən çıxan münafiqdir.Ancaq əgər biri qeybə iman etiqadında olub imanın əhkamları və İslamın buyuruqlarına əməl etməzsə, o, tövhidi sabit olmayan kafir olar.”[662]

5-İmam ibn Batta əl-Ukbəri (rahiməhullah, hic.387-ci ildə v.e) demişdir: “İmanın bəyan edilməsi və onun fərz olması, habelə onun qəlb ilə təsdiq, dil ilə iqrar, bədən əzaları və hərəkətlər ilə əməl olmasına və insanın yalnız onların hər üçü ilə mömin olacağına dair bölüm”.

Şeyx demişdir: “Bilin ki,-Allah sizə rəhm etsin- şəni Uca olan Allah qəlbə Onu tanımağı və Onu və peyğəmbərləri, kitablarını və sunnədə gələn hər bir şeyi təsdiq etməyi dillərə isə bunu tələffüz etməyi və söz ilə iqrar etməyi, bədənlərə və əzalara isə əmr etdiyi və fərz buyurduğu bütün əməlləri etməyi fərz etmişdir.Bunlardan biri digər birisi olmadan yetərli deyil.

Qul bütün bunları, qəlb ilə imanı, dil ilə iqrarı və bədən əzaları ilə əməl etməyi özündə cəm etmədikcə mömin olmaz.

Daha sonra insan bununla bərabər hər dediyi sözdə və etdiyi əməldə sunnəyə müvafiq gəlməyincə və sözləri və əməllərində kitab və elmə uymayınca mömin olmaz.

---

[662] Qutul qulub:2/250.Şeyxul İslam bunu məcmu`əl-fətavada olan iman kitabında nəql etmişdir:7/333.

Sizə şərh etdiyim hər bir şey, nazil olan Qurana, gəlib keçmiş sunnəyə və ümmət alimlərinin icma etdiklərinə uyğundur”.[663]

[663] əl-İbənə an şəriati-l-firqati-n-nəcia:2/760.Növbəti fəsildə bu imamdan daha bir önəmli nəql qeyd ediləcək.

Müxalif iddia edib demişdir ki, şeyxin: Daha sonra, insan bununla bərabər hər dediyi sözdə və etdiyi əməldə sunnəyə müvafiq gəlməyincə və sözləri və əməllərində kitab və elmə uymayınca mömin olmaz,-sözləri öncə dediyi “əl-iczə:yetərli” kəlməsinin mənasını bəyan edir.Müxalif demişdir: “Son olaraq onun sözlərinə diqqət yetirilməli və onun əməlin sunnəyə müvafiq olması və onun (yalnız onunla yetərli olacağını) hesab etməsi haqqında bəhs edən sözlərinə nəzər salınmalıdır. Çünki burada sual yaranır: Bunu tərk edən şəxs kafirə çevrilir yoxsa burada məqsəd onlar üçün onun lazımlı, vacib və gərəkli olmasıdır? Cümlənin məzmunu bunun ikinci olmasını əvvəldə və axırda aydın göstərir.”

Dedim: Birinci: İbn Batta “iczə” kəlməsini, müxalifin iddia etdiyi kimi, sunnəyə müvafiq gəlməyə dair sözü zamanı qeyd etməmişdir.

İkinci: Şeyxul-İslam burada sunnəyə tabeçiliyin səbəbini qeyd edərək demişdir: 7/505: Sələfin sözü daxili və zahiri söz və əməli cəm edir.Lakin bəzi insanlar niyyətin bura girdiyini anlamadıqları zaman belə demişlər: Həmçinin niyyət.Daha sonra digərləri bəyan etmişlər ki, mütləq şəkildə söz, əməl və niyyət sunnəyə müvafiq gəlməyincə qəbul olunmaz.Bu, həmçinin doğrudur.Belə ki onlar: Söz və əməl, deməklə onun “cins”i şamil etdiyini bəyan etməyi qəsd etmişlər.Onların məqsədi söz və əməlləri vəsf etmək olmamışdır.”

İbn Battanın söz, təsdiq və bədən əməllərinin yalnız sunnəyə müvafiq gələcəyi halda qəbul ediləcəyini qeyd etməyində qəsdi, Allahın Öz Peyğəmbərinə buyurduğu şəriətə uyğun ibadət etməkdir.Bu, İslam dininin özəyidir.Burada olan qeyd, dinlərinin özəyi sunnədən kənar olan müşriklərin və kitab əhlinin ibadətini xaric edir.Şeyxul-İslam demişdir: “Daha sonra demişlər: “Niyyətsiz söz və əməl qəbul edilməz.Bu, aşkardlr.Belə ki, söz və əməl xalis Allah üçün olmazsa Uca Allah onu qəbul etməz.Sonra demişlər: “Söz, əməl və niyyət yalnız Allahın və Peyğəmbərin əmr etdiyi və şəriət olan sunnəyə müvafiq gəldiyi zaman qəbul edilər.Çünki sunnədə varid olmayan, şəriətdə öz təsdiqini tapmayan və Allahın əmr etmədiyi söz, əməl və niyyət bidətdir.Hər bidət isə zəlalətdir və Allahın sevdiyi iş deyil.Bu səbəbdən, Uca Allah onu qəbul etmir və o, müşrik və kitab əhlinin əməlləri kimi yararsız olur.” Əl-İstiqamə:2/310.

Görünür müxalif, bu fəsildə olan sunnəyə müvafiqlik sözünun mənasını anlamadığı halda göstərilən sözləri dilə gətirmişdir.

Şeyxin bu sözlərinə diqqət yetir: “Bunlardan biri digər birisi olmadan yetərli deyil”.Bu sözlər imam Şafiidən nəql edilən sözlərə tamamilə uyğundur.

6- Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah, hic. 728-ci ildə v.e) namazı tərk edənin təkfir ediləcəyini əsaslandırdığı və buna dair müxalif çıxanların dəlillərini müzakirə etdiyi əsnada demişdir: “Habelə Əhli sunnə vəl cəmaata görə iman söz və əməldir.Buna Quran, sunnə və sələfin icması dəlalət edir. Həmçinin bu, yerində öz təsdiqini tapmış məsələdir.Belə ki, söz, Peyğəmbəri təsdiq etmək, əməl isə sözü təsdiq etməkdir.Bu üzdən, insan bütövlüklə əməldən kənar düşəcəyi zaman mömin olmayacaq.

İnsanı möminə çevirən söz xüsusi bir sözdür ki, o da şəhadət kəlməsidir.Əməl isə namazdır.

Həmçinin dinin gerçəyi itaət və boyun əymədir.Bu isə yalnız söz ilə deyil həmçinin əməl ilə tamamlanır.Allah üçün heç bir əməl etməyən şəxs isə Allahın dininə boyun əyməmişdir.Dini olmayan isə kafirdir.”[664]

7-Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah, hic. 1206-cı ildə v.e) demişdir: Ümmət arasında ixtilaf yoxdur ki, tövhidin, qəlbdə olan elm, dildə olan söz, habelə əmrlər və qadağaların icrasını ifadə edən əməl olması labüddür.İnsan bunlardan bir şeyi pozarsa müsəlman olmaz.

Əgər o, tövhidi iqrar edib ona əməl etməzsə, firon və iblis kimi kafir və inadkar olduğunu göstərəcək.Əgər o,

---

[664] Şərhul umdə :2/86.Bu xəbər geniş şəkildə qeyd ediləcək.

üzdə tövhidə əməl edib onu daxildə etiqad etməzsə, kafirdən daha şərli olan xalis münafiq olar."[665]

Həmçinin demişdir: "Bil ki,-Allah sənə rəhm etsin- Allahın dini, qəlbdə olan etiqad, habelə sevgi və nifrət ilə olur.Həmçinin dildə, tələffüz və küfr sözü dilə gətirməmək-lə olur.Həmçinin bədən əzalarında, islamın dayağlarını etmək və küfr olan əməlləri tərk etməklə olur.Əgər bu üçündən biri pozularsa insan mürtəd olub kafirə çevrilər."[666]

Şeyx "kəşfu-ş-şubuhat" risaləsinin sonunda demişdir: "Qeyd edilənlər sənə bəlli olsun deyə, gəlin Allahın izni ilə sözümüzü çox böyük və önəmli bir məsələ ilə bitirək.Biz bu sözün böyük şənini və bu məsələdə çoxlu yanlışlığın olduğunu nəzərə alaraq onu fərdi şəkildə qeyd edib deyirik: Tövhidin qəlb, dil və əməl ilə olmasının labüdlüyünə dair heç bir ixtilaf yoxdur.Bunlardan bir şey pozularsa insan müsəlman olmaz.Əgər o, tövhidi bilib ona əməl etməzsə, firon, iblis və onların mislində inadkar, kafir olar.Bir çox insanlar bu məsələdə yanlışlıq içindədirlər.Onlar deyirlər: Bu, doğrudur və biz bunu anlayır, onun haqq olduğuna şahidlik edir lakin onu etmək gücündə deyilik.Çünki bizim ölkənin camaatına görə yalnız onlara müvafiq gələni etmək olar yaxud gətidikləri digər üzürlər.Bu zavallı, əksər küfr

---

[665] əd-Durar əs-səniyyə fil əcvibəti-n-nəcdiyyə:2/124.Məcmuatu-r-rasəil vəl məsəili-n-nəcdiyyə:4/37.

[666] əd-Durar əs-səniyyə:10/87.Şeyxin sözü ən aydın və aşkar sözlərdən biridir.Bu sözlər, əməlin yalnız İslamı pozan amillərin tərk edilməsi ilə gerçəkləşdiyini iddia edənə tutarlı cavabdır.Şeyx həm bunun həmçinin dayaqların edilməsinin labüdlüyünü bəyan etmişdir.Bu məsələdən ötrü onun əleyhdarları onu xəvariclərin sözünü deməkdə ittiham etmişlər.Bu məsələ irəlidə qeyd ediləcək. Bu, tamamilə günümüzdə irca şübhəsinə düçar olanların sözünə bənzəyir.

öndərlərinin haqqı bildiklərini və onu yalnız hər hansı bir üzrdən ötrü tərk etdiklərini bilmir.Buna dair Uca Allah buyurur: *“Onlar Allahın ayələrini ucuz qiymətə satır”.*[667] Habelə buyurur *“onu öz oğullarını tanıdıqları kimi tanıyırlar.”*[668] Habelə başqa ayələr.Əgər o, tövhidi anlamadığı və onu qəlbində etiqad etmədiyi halda zahiri əməldə tövhidə əməl edərsə, münafiq olar və xalis kafirdən daha şərli birisi olar. *“Həqiqətən, münafiqlər Odun ən aşağı təbəqəsində olacaqlar”.*[669]

Bu, geniş məsələdir.İnsanların arasında yayılan bu məsələyə nəzər yetirəcəyin zaman görəcəksən ki, bəzi şəxslər haqqı bildiyi halda dünyanın yaxud ad-sanın əldən çıxmasından qorxaraq yaxud şəxsi marağları güdərək əməli tərk edirlər.Habelə sən daxildə deyil üzdə əməl edən şəxsləri görəcəksən.Onların birindən qəlbində hansı etiqadda olduğunu soruşduğun zaman bunu bilmədiyini aşkar edəcəksən.”[670]

Dedim: Müxalif şeyxdən, onun “əl-məbəni əl-ərbəa: dörd dayağı” tərk edəni təkfir etmədiyini bir çox yerdə nəql etmiş və bu iddiada şeyxin bu sözlərinə etimad göstərmişdir. Savaşı və insanın təkfir edilməsini vacib edən amillər barədə soruşulduğu zaman şeyx demişdir: “İslamın dayağları beşdir.Onun ilk dayağı isə şəhadət kəlməsidir. Daha sonra digər dörd dayağlar.İnsan dörd dayağı iqrar edib onu səhlənkarlıq səbəbilə tərk edəcəyi zaman biz həmin

---

[667] ət-Təubə:9.
[668] əl-Bəqərə:146.
[669] ən-Nisa:145.
[670] Kəşfu-ş-şubuhat, Məcmu` muəlləfət əş-şeyx:6/131.əl-Camiul fərid:277.

şəxsə qarşı, onu yerinə yetirməsi üçün savaşsaq belə onu tərk etdiyinə görə həmin şəxsi təkfir etməyəcəyik.Alimlər onu danmadan tənbəllik üzündən tərk edənin küfrünə dair ixtilaf etmişlər.Biz isə yalnız bütün alimlərin icma etdiyi şeylərə görə təkfir edirik.Bu isə şəhadət kəlməsidir."[671]

## *Buna iki yöndən cavab veriləcək*:

*Birinci:* Mən şeyxin namazı tərk edənin təkfir edilməsinə dair məzhəbini dərin araşdırmaq imkanı qazanmamışam. Burada qeyd edilənlər isə onun növbəti sözlərinə zidd gəlir: "İlk vacibdə şəhadəti dilə gətirmək şərtdirmi yoxsa insan bilik ilə müsəlmana çevrilir? Qeyd edilmişdir ki, insan qadir olduğu zaman yalnız şəhadəti dilə gətirməklə müsəlmana çevrilir.Bu məsələdə Cəhm və onun ardıcılları müxalif olmuşlar.Artıq imam Əhməd və digər sələf alimləri, insanın bilik ilə müsəlmana çevriləcəyini deyən şəxsin kafir olacağına dair fətva vermişlər.Bundan aşağıdaki məsələlər şaxələnir.Məsələlərdən: Əgər biri namaza çağırıldığı zaman, vacibliyini iqrar etməklə birgə onu yerinə yetirməkdən imtina edərsə, həmin şəxs kafir olaraq yoxsa hədd (müsəlmana kəsilən cəza) olaraq öldürüləcək? Onun hədd olaraq öldürüləcəyini deyənlər bunun məsələnin əsası olduğunu hesab edənlərdir."[672]

Şeyxin bu sözləri, namaza çağırıldıqda onu yerinə yetirməkdən imtina edəcəyi zaman namazı tərk edənin

---

[671] əd-Durəru-s-səniyyə:1/102.
[672] əd-Duraru-s-səniyyə:1/110.

təkfir ediləcəyini göstərir.Habelə bu, hənbəli məzhəbinin məşhur görüşüdür.

Şeyxin burada hasil olan ixtilafın iman məsələsində olan ixtilafdan əsas götürdüyünü qeyd etməsi, Şeyxul-İslamın qeyd etdiyi sözlərinə tamamilə uyğun gəlir:"Məlum olmuşdur ki, fəqihlərdən namazın vacibliyini iqrar edib onu yerinə yetirməkdən imtina edən şəxsin ödürülməyəcəyini yaxud müsəlman olaraq öldürüləcəyini deyənlər murciə və cəhmilərin və  tam qüdrətlə birgə qəti iradənin feldən heç bir şey ilə əlaqəli olmayacağını deyənlərin düşdüyü şübhəyə düşmüşlər.Bu səbəbdən fəqihlərdən belə şəxsi qətlə yetirməkdən imtina edənlər öz görüşlərini iman məsələsi üzərində qurub əməllərin imandan olmadığını demişlər."[673]

*İkinci*: Şeyxin namaz, zəkat, oruc və həccin tərk edilməsi səbəbilə təkfir etmədiyi fərz edilərsə bu, əməlin tərkini namazın tərki məsələsinə qayıtdığını iddia edən müxalifə ən dolğun rəddiyə olacaq. Doğru olan görüş isə, Əhli sunnənin birinci məsələyə icma etməsidir.İkinci isə fərqlidir.Şeyx burada dörd dayağı tərk edənin təkfir edilməyəcəyi ilə bərabər bütövlüklə bədən əməllərini tərk edənin kafir olacağına əminlik ifadə edir və buna dair icmanın olduğunu xəbər verir."[674]

8-Dəvət imamlarında biri "ət-təudıh an təuhidil xalləq" kitabında demişdir: "Əhli sunnə, qəlb əməli gedəcəyi yaxud onunla birgə bədən əməlləri gedəcəyi zaman imanın

---

[673] Məcmu`əl-fətəva:7/616.

[674] Şeyx ibn Bəzdən gələn nəql və əqli şübhələrdən yeddinci şübhəyə cavab zamanı bu məsələyə dair açıqlama gələcək.

bütövlüklə gedəcəyinə icma etmişlər.Adicə təsdiq isə qəlb və bədən əməlləri olmadan yaxud onlardan biri olmadan heç bir fayda verməyəcək.[675] Çünki bu, iblis, firon və onun tayfasına, habelə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sadiqliyini gizlində və aşkarda etiqad edən yahudi və müşriklərə fayda vermədi."[676]

9-Şeyx Abdur-Rahmən bin Həsən (rahiməhullah, hic. 1285-ci ildə v.e) demişdir: "O, demişdir: "Allahdan başqa haqq məbudun olmadığına şahidlik edən". Yəni, onun mənasını bildiyi halda onu tələffüz edən, və onun tələblərinə daxildə və zahirdə əməl edən.Uca Allah buna dair buyurur: *"Bil ki, Allahdan başqa (ibadətə layiq olan) heç bir ilah yoxdur."*[677] Habelə buyurur: *"bilərək haqqa şəhadət verənlər isə istisnadır"*.[678] Həmin kəlmənin mənasını bilməyərək və ona əmin olmayaraq, habelə şirki inkar etmək, söz və əməldə, qəlb və dil sözündə və qəlb və bədən əməllərində ixlaslı

---

[675]İki əməlin, yəni qəlb və bədən əzaları ilə olan əməlin yoxa çıxması ilə birgə təsdiq heç bir fayda verməyəcək. Onlardan birinin olmaması ilə həmçinin fayda verməyəcək.Bu üçünün bir arada gəlməsi labüddür.Onlardan biri digəri olmadan yetərli deyil.

[676] "Ət-Təudıh an təuhidil xalləq:139" Kitab şeyx Süleyman bin Abdullah bin Muhamməd bin Abdul-Vahhəbə nisbət edilərək çap edilmişdir.Şeyx Abdul-Əziz bin Muhamməd Abdul-Lətif həmin kitabı təhqiq etmiş və həmin kitabın dəvət imamlarından üçünə məxsus olduğunu müəyyənləşdirmişdir.Bunlar: Şeyx Muhamməd bin Əli Ureyb (hic.1209-cu ilində v.e) Şeyx Haməd bin Mə`mər (hic.1225-ci ilində v.e) Şeyx Abdullah bin Muhamməd bin Abdul-Vahhəb (hic.1242-ci ildə v.e) (dəavəl munəviin:50-cu səh, habelə şeyx Abdullah bin Muhamməd bin Abdul-Vahhəbin tərcümeyi-halına bax.əd-Duraru-s-səniyyə:16/3766.Orada qeyd edilmişdir: O, "ət-təudıh" kitabında pay sahibi olmuşdur.

[677] Muhamməd:19.

[678] əz-Zuxruf:86.

olmaq kimi tələblərinə əməl etməyərək onu dilə gətirmək icma ilə faydasızdır."[679]

Həmçinin demişdir: "Bu ayədə[680] murciə və kərramilərə rəddiyə vardır. Belə ki, həmin şəxslər: İman gətirdik!,-deyib Allahdan ötrü onlarla düşmənçilik edənlərin işkəncələrinə səbir etmədikləri zaman həmin söz onlara fayda vermədi. Əməlsiz söz və təsdiq insana fayda vermir. İnsan hər üçünü, qəlb ilə təsdiq və əməli, dil ilə sözü və əzalar ilə əməli özündə cəm etməyincə, şəri imana yiyələnmiş sayılmayacaq. Bu, Əhli sunnə vəl cəmaatın, qədimdə və sonralar dediyi sözüdür. Doğrusunu Allah bilir."[681]

10-Şeyx Abdul-Lətif bin Abdur-Rəhman ibn Həsən (rahiməhullah, hic. 1292-ci ildə v.e) Şeyxul İslam Muhamməd bin Abdul-Vahhəbi öncə qeyd edilmiş sözünə görə tənqid atəşinə tutanlara və onu xəvariclərə nisbət edənlərə cavab verdiyi əsnada demişdir: "Artıq dəfələrlə qeyd edilmişdir ki, Uca Allahın bir neçə ayədə vəsf etdiyi yəhudilər kimi irad tutan şəxs sözlərin təhrif edilməsi bacarığında böyük pay sahibi olmuşdur.[682] Allahdan qeyrisinə qurban kəsmək və nəzr vermək qadağandır və bütün bu işlərdə dini xalis Allaha aid etmək gərəkdir. Şeyximizin "Kəşfuş şubuhat" risaləsindəki sözü məhz buna dəlalət edir. Elm əhli buna icma etmişlər. Bu üçündən biri pozulacağı zaman İslam

---

[679] Fəthul məcid:1/119. Təhqiq: Valid bin Abdur-Rahmən Ali Fərbən.

[680] Uca Allah buyurur: "*İnsanların arasında: "Allaha iman gətirdik!"– deyənləri də vardır. Amma Allah yolunda əziyyətə məruz qaldıqda insanların fitnəsini Allahın əzabı ilə eyni tuturlar.*" (Əl-Ənkəbut:10.)

[681] Fəthul məcid:2/579.

[682] Şeyxin sözlərindən anlaşıldığı kimi burada bəzi sözlər düşmüşdür.

pozulub batil olacaq.Buna Cəbrayılın hədisi dələlət edir. Cəbrayıl Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) islam, iman və ihsən haqqında soruşduğu zaman, Peyğəmbər (salləllahu aleyhi və səlləm) islamın tərifini şəhadət ilə başlamışdır. Şübhə yoxdur ki, elm, söz və əməl onun səhih olması üçün şərtdir. Bu, elmin iyini hiss etmiş heç bir şəxsə gizli deyil.Xəvariclər isə yalnız bundan aşağı olan şeylərdə, qulun öz nəfsinə yaxud insanlardan başqasına zülm etməsi məsələsində müxalıf olmuşlar."[683]

11-Muhamməd bin İbrahim Ali Şeyx (rahiməhullah, hic. 1377-ci ildə v.e) demişdir: "Üstəlik elm əhlinin arasında olan icma, tövhidin qəlb, dil və əməl ilə olmasının labüdlüyüdür.Bu üçünün olması labüddür.Bu, onun qəlbindəki etiqadı, dili ilə tələffüz etdiyi sözü və bədən əzaları ilə etdiyi əməli labüd edir.Əgər o, qəlbi ilə deyil sadəcə dili ilə Allahı təkləşdirərsə bu tövhid, ona fayda verməz.Əgər o, dili ilə deyil sadəcə qəlbi və əzaları ilə Allahı təkləşdirərsə bu, həmçinin ona fayda verməz.Əgər digərini buraxıb yalnız əzalar ilə Allahı təkləşdirərsə o, müsəlman olmaz.Bu, insanın etiqad, dil və əməldə tövhid üzərində olmasının labüdlüyünə dair icmadır."[684]

Dedim: Kim peyğəmbərlərin çağırdığı tövhidi bilərsə bu məsələnin qaranlıq tərəfləri ona aydınlaşar.Çünki tövhid, Uca Allahı ibadətdə təkləşdirməkdir."Lə iləhə illəllah" kəlməsi, Allahdan başqa ibadətə haqqı olan ilahın yox-

---

[683] Misbahu-z-zaləm fir raddi alə mən kəzəbə alə-ş-şeyxil imam:387-ci səh.
[684] Şərhu kəşfi-ş-şubuhat:126-ci səh.Toplayan: Muhamməd bin Abdur-Rahmən bin Qasim:126-cı səh.İrəlidə ondan digər bir nəql qeyd ediləcək.

luğunu ifadə edir.Tövhid, bir olan Allaha qəlb, dil və bədən əzaları ilə ibadət etmək üzərində qurulur.Üstəlik, Şeyxul-İslamın qeyd etdiyi kimi dinin həqiqəti itaət və tabeçilikdən ibarətdir.Bu isə yalnız əməl ilə tamamlanır.Bütün ömrünü yaşayıb Allah üçün bir səcdə belə etməyənin, habelə heç bir fərz və nafilə ibadətlərini yerinə yetirməyənin qəlbində tövhidə sahib olması təsəvvür edilə bilərmi?

Artıq yuxarıda nəql edilən sözlərdən aydın olur ki, Əhli sunnə, imanın söz və əməl yaxud dil sözü, qəlb etiqadı, bədən və əzalar əməli olduğuna və bu üçündən heç birinin digəri olmadan yetərli olmayacağına, və biri olmayacağı təqdirdə digərinin fayda verməyəcəyinə və əməlin, dilə gətirilən sözün təsdiqi olduğuna icma etmişlər.Bu səbəbdən, əgər biri sözünü əməli ilə təsdiq etməzsə iddasında yalançı hesab ediləcək.

## Üçüncü mətləb:

## Səhabələrin namazı tərk edənin küfrünə dair icması

Bizim araşdırdığımız məsələdə bu icmanı dəlil olaraq istifadə etməyimizə səbəb, bütövlüklə zahiri əməlləri tərk edənin həmin əməllərdən olan namazı tərk edəni dolayı yol ilə şamil etməsindən ötrüdür.Səhabələrin tək namazı tərk edənin küfrünə icması sabit olduğu zaman bütün zahiri əməlləri tərk edənin küfrünə dair icma daha qabarıq və aydın şəkildə üzə çıxır.

Həmin icma, icma nəql etmədə etinasızlığı ilə tanınmayan səhabə və imamlardan bir toplum insan tərəfindən xəbər verilir.Həmin şəxslər bunlardır:

1-Cabir bin Abdullah (r.a).

Mucahid bin Cəbr ona sual verərək demişdir: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində əməllərdən hansı sizə görə küfr ilə imanı ayırırdı? O, cavabında: Namaz!-deyə söylədi."[685]

2-Əbu Hureyra (r.a).

Abdullah bin Şəqiq Əbu Hureyradan (r.a) rəvayət edib demişdir: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm) səhabələri

---

[685] İbn Batta "əl-İbənə:2/672.Muhamməd ibn Nəsr "tə`zımu qadri-s-saləh:2/877. Ləlàkəi:4/910.Şeyx Albani bu hədisin isnadını həsən saymışdır "sahihut tərğıb vət tərhib:1/227.

namazdan savayı əməllərdən heç bir şeyin tərkini küfr hesab etməzdilər."[686]

3-Həsən əl-Bəsri (rahiməhullah).

Həsən demişdir: "Mənə çatan xəbərə görə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əshabı belə deyərdilər: "Qul ilə onun şirk edib kafir olması arasında heç bir üzr olmadan namazı buraxması durur."[687]

4-Abdullah bin Şəqiq (rahiməhullah).

Abdullah demişdir: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm) səhabələri namazdan savayı əməllərdən heç bir şeyin tərkini küfr hesab etməzdilər".[688]

5-Əyyub əs-Səxtəyani (rahiməhullah).

Əyyub demişdir: "Namazın tərk edilməsi heç bir ixtilaf olmayan küfrdür."[689]

---

686 Hakim "əl-Mustədrək:1/48.Hakim dedi:Buxari və Müslimin şərtlərinə uyğundur. O, Bureydanın hədisini qeyd etmişdir: "Bizimlə onlar arasında olan əhd namazdır. Əgər biri onu tərk edərsə kafir olar." Daha sonra dedi: Bu hədisə, onların hər ikisinin şərtinə uyğun şahidlik edən səhih rəvayət gəlmişdir.Daha sonra onu nəql etdi. Sanki Zəhəbi Hakimin az öncə qeyd etdiyi sözlərə diqqət etməyib belə demişdir: "Onun haqqında bir söz deməmişdir.Onun isnadı isə salamatdır."

687 İbn Batta:2/673.əl-Ləlakai:4/910.

688 Tirmizi:2757.İbn Əbu Şeybə "əl-İmən: 137-ci hədis", "əl-Musannəf:6/172". Muhamməd ibn Nəsr:2/904. Şeyx Albani bu rəvayəti səhih saymışdır: "sahihut tərğıb vət tərhib:564.İmam Şəukani dedi: Bu ifadədən aydın olan, bütün səhabələrin bu söz üzərində cəmləşməsidir.Çünki onun: Peyğəmbərin səhabələri,-deməsi, cəm halında olan izafətdir.Bu isə onun (icmanın) baş verdiyi təəssüratı yaradır.Neyl əl-Əutar: 1/283.Az sonra Şeyxul-İslamın bu rəvayətə əlavəsi qeyd ediləcək.

689 Muhamməd ibn Nəsr:2/925, 978-ci rəvayət.Şeyx Albani bu rəvayəti səhih saymışdır: "sahihut tərğib vət tərhib:1/230".

**6-İshaq ibn Rahuyə (rahiməhullah).**

İmam Muhamməd bin Nəsr (rahiməhullah) demişdir: Mən İshaqın belə dediyini eşitdim: " Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) səhih gələn xəbərə görə namazı tərk edən kafirdir. Habelə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) zamanından günümüzəcən elm əhlinin görüşü, namazı qəsdən və heç bir üzr olmadan vaxtı çıxanacan tərk edənin kafir olmasıdır."[690]

İbn Rəcəb (rahiməhullah) demişdir: "Hədis əhlindən bir çox alim namazı tərk edənin kafir olduğunu hesab edirlər.İshaq bin Rahuyə bunu onlardan icma olaraq nəql etmiş və hətta bu dayağları iqrar etməklə bərabər onları tərk edənin kafir olmayacağını deyənin sözünü murciələrin sözünə aid etmişdir.Eyni cür Sufyən bin Uyeynə demişdir…".[691]

**7-Muhamməd bin Nəsr əl-Mərvəzi (rahiməhullah).**

Muhamməd demişdir: "Artıq biz bu kitabımızda Quranın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsinin, namazın qədrinin təzim edilməsi, onu haqqı ilə yerinə yetirənə savab vədinin vacibliyi, onu zay edənə sərt təhdidin olması, fəzilətdə onunla başqa əməllər arasında olan fərqi və böyük dəyəri kimi amillərə dəlalət etdiyini qeyd etdik.Daha sonra biz onu tərk edənin təkfir ediləcəyinə, İslam dinindən çıxacağına və onu yerinə yetirməkdən imtina edənə qarşı savaşın caiz olacağına dair Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) rəvayət edilən xəbərləri qeyd etdik. Bunun ardından

690 Tə`zımu qadris salət:2/929, 990-cı rəvayət.

691 İbn Rəcəb "fəthul bəri:1/22.

eynilə səhabələrdən buna dair xəbərlər gəlmiş və onlardan heç birinin buna müxalif çıxması bizə gəlib çatmamışdır."[692]

8-İbn Teymiyyə (rahiməhullah).

Şeyxul-İslam Quran və sunnədən dəlillər qeyd etdikdən sonra namazı tərk edənin təkfir ediləcəyinə dair dəlilləri, habelə bunun əksər sələfdən nəql edilən söz olduğunu bəyan edib demişdir: "Çünki bu, səhabələrin icmasıdır. Ömər (r.a) namaza çıxarkən ona namaz haqqında söz deyildiyi zaman o, belə demişdir: "Bəli, namazı tərk edənin İslamda heç bir payı yoxdur."Onun əhvalatı səhih hədis kitabındadır.Başqa rəvayətdə o, demişdir: "Namaz qılmayanın İslamı yoxdur!". Nəccəd rəvayət etmişdir.Ömər bunu səhabələrin hüzurunda söyləmişdir."[693]

---

[692] Tə`zimu qadri-s-saləh:2/935.Bəziləri iddia etmişlər ki, səhabələrin icması, sadəcə namazı tərk edənin kafir olmasını ifadə edən hədislər üzərində qurulmuş rəvayətdir və Mərvəzinin sözü məhz buna dəlalət edir.Qeyd edilməlidir ki, bu yalnış fikirdir və bunu deməyə əsas verən iki səbəb var:

Birinci: İmam Mərvəzi bu sözünü dedikdən sonra buyurmuşdur: "Bundan sonra elm əhli Peyğəmbərdən və sonra səhabələrdən namazı tərk edənin təkfir edilməsinə dair rəvayətlərin açıqlamasında ixtilaf etmişlər".Peyğəmbərdən rəvayət edilən, məşhur hədislərdir.Səhabələrdən rəvayət edilən isə, onların namazı tərk edənin kafir olduğunu deməleridir.Bu, bir sıra səhabədən rəvayət edilən səhih xəbərlərdir.

İkinci: Əgər Mərvəzinin təbirinə ehtimallar girmiş olsa belə, Abdullah bin Şəqiq, İshaq, Şeyxul-İslam kimi şəxslərin sadəcə təkfiri ifadə edən hədislər deyil namazı tərk edənin təkfir edilməsinə səhabələrin icma etmələrinə dair təbirləri açıq-aydındır.

[693] Şərhul umdə:2/75.Səhabələrdən təsəvvür edilə biləcək icma məhz budur.Çünki səhabələrin hamısından fərdi şəkildə bunu nəql etmək qeyri-mümkün bir işdir.Bu üzdən ibn Qudəmə xarrac nəzdində olan yerin alışınının haramlıq məsələsini qeyd edərək demişdir: "Ömərin bu sözləri mühacir və ənsarlardan olan səhabə və imamların hüzurunda olmuş və etirazsız qarşılanmışdır.Bu isə icmanı ifadə edir.Bu və buna bənzər icmadan güclü icmanın olması mümkün deyil.Çünki bütün səhabələrin yaxud müjdələnmiş on

**9-İbnul-Qayyim (rahiməhullah).**

İmam ibnul Qayyim namazı tərk edənin küfrünə Quran, sunnə və səhabələrin icmasını qeyd etdikdən sonra demişdir: "Səhabələrin icmasına gəldikdə isə, ibn Zəncuyə belə demişdir: "Ömər bin Rabi` bizə təhdis edib dedi: Yəhya bin Əyyub Yunusdan o da, ibn Şihabdan bizə təhdis edib dedi: Ubeydullah bin Abdullah bin Utbə mənə təhdis etdi ki, Abdullah bin Abbas ona xəbər vermişdir ki, Ömər bin Xəttab məsciddə xəncər zərbəsi aldığı zaman o, onun yanına gəlmişdir.Dedi: Mən və mənimlə olan bir dəstə adamlar onu alıb evinə götürdük.Ömər Abdur-Rahmən bin Aufə insanlara namaz qıldırmasını əmr etdi.Dedi: Biz Ömərin yanına gəlib evinə girdikdə o, ölüm sancılarından huşunu itirdi və səhərəcən huşsuz qaldı. Ömər özünə gəldikdə isə belə dedi: İnsanlar namazı qıldılarmı? Biz: Bəli!-deyə cavab verdik. Ömər dedi: "Namazı tərk edənin İslamı yoxdur.Başqa rəvayətdə: Namazı tərk edənin İslamda heç bir payı yoxdur,-dedi.Daha sonra dəstəmaz üçün su istəyib onunla dəstəmaz aldı və namaz qıldı.Sonra qalan əhvalatı danışdı.O, bunu səhabələrin hüzurunda dedi onlar isə buna heç bir etiraz bildirmədilər.Artıq buna bənzər rəvayətlər Muaz bin Cəbəldən, Abdur-Rahmən bin Aufdan və Əbu Hureyradan qeyd edilmişdir.Hər hansı səhabənin onlara müxalif olması isə bilinmir."[694]

---

nəfərin bu məsələdə sözlərini nəql etmək mümkün deyil.Yayılmış sözdən savayı isə icma yoxdur."əl-Muğni:2/310.Namazı tərk edənin təkfir edilməsinə dair isə, ibn Hazmın qeyd etdiyi kimi on altı səhabənin rəvayəti mövcuddur.

[694] Əs-Salətu və hukmu tərikihə:42-ci səh.Ömərin: "Namazı tərk edənin İslamda heç bir payı yoxdur"-sözünü imam Malik "əl-Muvatta:51-ci rəvayət, ibn Əbu

Sonra ibnul-Qayyim tərəflər arasında çıxarılan hökmə həsr etdiyi fəsilin sonunda demişdir: "Təəccüb doğuran isə, onu tərk etməkdə israrlı olanın başının üzərində qılınc parıltısını, edama təchiz edilməsini və gözlərinin sarıldığını gördüyü halda bir toplum insanın önündə onu etməyə çağırılıb: Namazı qıl əks halda səni öldürəcəyik,-deyildiyi zaman: Öldürün məni, çünki mən heç vaxtı namaz qılmayacam,-deyən şəxsin küfründə şübhə etməkdir.Namazı tərk edəni təkfir etməyənlər: Bu adam mömin və müsəlmandır, öldükdə ona qüsl alınacaq, cənazə namazı qılınacaq və müsəlmanların qəbirstanlığında dəfn ediləcək,- deyirlər.[695]Bəziləri isə deyirlər: "O, kamil imanlı mömindir və onun imanı Cəbrayılın və Mikayılın imanı səviyyəsindədir.Bu sözü dilə gətirənlər Quranın, sunnənin və səhabələrin icmasının küfrünə dair şahidlik etdiyi şəxslərin təkfir edilməsini inkar etməkdən utanmırlar.Müvəffəq edən Allahdır."[696]

10-Şeyx Həmd bin Nəsir bin Mə`mər (rahiməhullah).

Şeyx demişdir: "Gördüyün kimi, bu hədislər namazı tərk edənin küfrünü açıq-aydın göstərir.Bundan öncə isə İshaq bin Rahuyə, ibn Hazm, Abdullah bin Şəqiqin rəvayət etdiyi

---

Şeybə "əl-İman:103-cü rəvayət, Muhamməd ibn Nəsr: 924-cü rəvayət, Lələkai:1528-ci rəvayət:4/906" rəvayət etmişlər.Şeyx Albani bu əsəri ibn Əbu Şeybənin "əl-İman:40-cı, səh" kitabını təhqiq edərkən səhih saymışdır.Həmçinin Muhamməd bin Nəsr:930, bu rəvayəti ibn Mulihdən rəvayət edib demişdir: "Mən Ömərin belə dediyini eşitdim: Namaz qılmayanın İslamı yoxdur.Şərikə: Bunu minbərdəmi dedi?-sual verildiyi zaman o: Bəli!-dedi.

[695] Bu, Maliki və Şafii məzhəbidir.Bu sözün yönsüz olmasına rəğmən bəzi insanlar hələ də bunu geniş istifadə edərək: Bu cumhur fəqihlərin məzhəbidir,- deyirlər.

[696] əs-Salətu va hukmu tərikihə:53-cü səh.

kimi səhabələrin icması nəql edilmişdir.Bu, tabiinlər və onlardan sonra gələn cumhur alimlərin məzhəbidir."[697]

11-Şeyx Muhamməd bin İbrahim (rahiməhullah).

Şeyx demişdir: "Artıq məscidlərin birində möizə edib namazı etinasızlıq və təmbəllikdən tərk edən şəxsin öldürülməli olduğunu deyən kişi haqqında bəhs edən və alimlərin buna dair dediklərini soruşub fətva istəyən məktubun mənə çatmışdır.

Buna cavab olaraq deyirəm: "Həmd olsun Allaha. İmamımız Əhməd bin Hənbəl, habelə görüşlərin birində Şafii, İshaq bin Rahuyə, Abdullah bin Mubarək, Nəxai, Hakəm, Əyyub əs-Səxtəyani, Əbu Davud Tayalisi və tabiinlərin böyük imamlarından digər insanlar onu tərk edənin kafir olduğunu söyləmişlər.İshaq bin Rahuyə isə buna dair icma nəql etmişdir.Bunu ondan Əhməd bin Həcər əl-Heysəmi qırx hədisin şərhində xəbər vermişdir.Həmçinin o, bunu "əz-zəvəcir an iqtirafil kəbəir" kitabında səhabələrin cumhurundan nəql etmişdir.Habelə Əbu Muhamməd bin Hazm demişdir: "Digər səhabələr və onlardan sonra gələn tabiinlər namazı tərk edəni mütləq şəkildə təkfir etmiş və onun mürtəd olduğuna dair hökm çıxarmışlar.Bunlar: Əbu Bəkr, Ömər və onun oğlu Abdullah, Abdullah bin Məsud, ibn Abbas, Muaz bin Cəbəl, Cabir, Abdur-Rəhman bin Auf, Əbu Dərda, Əbu Hureyra və başqa səhabələrdir. Səhabələrdən hər hansı birinin onlara müxalif olduğunu isə biz bilmirik.Onlar namazı tərk edənin küfrünə Muslimin

[697] əd-Durar əs-səniyyə:10/307.

Cabir bin Abdullahdan rəvayət etdiyi hədisi hüccət gətirmişlər.Hədisdə rəvayət edilir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Kişi ilə şirk və küfr arasında namazın tərki durur."[698]Həmçinin Bureydə bin Huseyb (r.a) Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə dediyini eşitmişdir: "Bizimlə onların arasında olan əhd namazdır.Kim onu tərk edərsə kafir olar."[699]İmam Əhməd və sunən sahibləri rəvayət etmişlər.Habelə Ubadə bin Samit (r.a) rəvayət edib demişdir: Peyğəmbər (salləllahu aleyhi və səlləm) mənə vəsiyyət edib demişdir: "Allaha heç bir şeyi şərik qoşma və namazı qəsdən tərk etmə! Kim namazı qəsdən tərk edərsə İslam dinindən çıxar."Əbu Hatim rəvayət etmişdir.[700]Habelə Muaz (r.a) Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) belə rəvayət etmişdir: "Hər kim fərz namazını qəsdən tərk edərsə Allahın himayəsindən kənar qalar."[701]Habelə Abdullah bin Şəqiq əl-Uqeyli demişdir: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm) səhabələri namazdan savayı əməllərdən heç bir şeyin tərkini küfr hesab etməzdilər".Tirmizi rəvayət edib.Gördüyün kimi bu hədislər və ondan öncə qeyd edilən səhabələrin icması namazı tərk edənin küfrünü açıq-aydın göstərir.Bunu İshaq bin Rahuyə, İbn Hazm, Abdullah bin Şəqiq rəvayət etmişlər.

---

[698] Muslim:82.

[699] Əhməd:22987.Tirmizi:2621.Nəsai:463.İbn Macə:1079.Şeyx Albani və Şueyb Arnaut bu hədisi səhih saymışlar.

[700] Şeyx Albani bu hədisi zəif saymışdır "Daifut tərğib vət tərhib:300".

[701] Əhməd:22128.Tabarani "əl-Əusat".Munziri dedi: Onun isnadı başqa rəvayətlər ilə birlikdə qəbahətsizdir.Albani dedi: Qeyrisinə əsasən həsəndir (həsən liğeyrihi): "sahihut tarğib vəttərhib:569.

Həmçinin bu, tabiinlərin və onlardan sonra gələn cumhur alimlərin məzhəbidir."[702]

12-Şeyx Abdul-Əziz bin Bəz (rahiməhullah).

Şeyx demişdir: "Bu səbəbdən möhtərəm tabiin Abdullah bin Şəqiq əl-Uqeyli Peyğəmbərin (salləllahu aleyhi və səlləm) səhabələrindən nəql etmişdir ki, onlar namazdan savayı əməllərdən heç bir şeyin tərkini küfr hesab etməzdilər.Bu isə onu tərk etməyin səhabələrin icması ilə böyük küfr olduğunu göstərir.Çünki onlar mövcud olan bir sıra şeylərin küfr olduğunu bilirdilər.Lakin o, böyük küfr olmayan küfrdür.Misal üçün soyun rədd edilməsi, möminlərin öz aralarında savaş aparması, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) buyurduğu kimi: Müsəlmanı söyməkfasiqlik, onunla savaşmaq isə küfrdür"[703].Bu, halal sayılmayacağı təqdirdə böyük küfr olmayan küfr olacaq.Həmçinin Peyğəmbər (salləl-lahu aleyhi və səlləm) buyurur: "Həqiqətən, sizin əcdadlarınızdan imtina etməyiniz küfrdür".[704]Həmçinin Peyğəmbər (salləllahu aleyhi və səlləm) buyurur: "İnsanlarda olan iki xislət küfdür: (İnsan öldükdə) ağı çəkmək və mənşəyi yamanlamaq."[705] Bütün bunlar elm əhlinə görə böyük küfr olmayan küfrdür.Çünki bu küfr sözü (ərəb dilində müəyyənliyi bildirən əlif və ləm bağlayıcısı olmadan) qeyri-müəyyən-likdə gəlmişdir.Habelə başqa dəlillər orada gələn küfrün böyük küfr olmadığına dəlalət edir.Namaz məsələsi isə

---

[702] Fətava şeyx Muhamməd ibn İbrahim: 2/107-109.
[703] Yuxarıda qeyd edilib.
[704] Buxari:6830.
[705] Yxarıda qeyd edilib.

fərqlidir və onun şəni böyükdür.Çünki o, şəhadətdən sonra ən əzəmətli şeydir və İslamın dayağıdır."[706]

Ardından deyiləcək: Qeyd edilən icma bu məsələdə ən güclü dəlil və ən aydın sübutdur.Çünki o, heç bir yozum və ehtimal qəbul etmir.Həmin icma burada qeyd edilən küfrün İslamdan çıxaran böyük küfr olduğuna dəlalət edən zahiri nasslara uyğun gəlir və həmin nassları zahirindən çıxarıb qeyd edilən küfr ilə kiçik küfrün qəsd edildiyini isbatlamağa çalışan hər bir şəxsin istəyini qeyri-müvəffəq edir.Üstəlik həmin icma insaf sahibi olan hər bir şəxsə ona zidd gələn bütün sözlərdən dönməyi vacib edir.Belə ki, dörd imamın hamısı və bütün alimlər icmanın qəti hüccət olduğuna və ondan çıxmağın caiz olmadığına yekdildirlər. Alimlərdən həmin icmanın dəlalət etdiyi mənaya müxalif söz deyənlər, güman ki, əcrini alacaq üzr yaxud ictihad sahibləridir.Lakin bu üzr, artıq həmin icma ilə tanış olub ondan agah olan şəxsdən qalxmışdır."[707]

*Bildirişlər:*

***Birinci** bildiriş*: Bəzi elm əhli namazı tərk edənin küfrünə dair varid olan hədisləri kiçik küfrlə əlaqələndirmişlər.Artıq Şeyxul-İslam bu sözü doqquz yöndən rədd etmişdir.Şeyxul-İslam "şərhul umdə" kitabında demişdir: "Bunu (söhbət başqa əməllərdən gedir) böyük küfr olmayan küfrlə əlaqələndirmək, bu cür cümlədə ümumi şəkildə səhih əlaqələndirmə və düzgün dəyərləndirmədir.Bu səbəbdən

---

[706] Məcmu\` əl-fətava və məqalət şeyx ibn Bəz:10/240.

[707] əl-Xiləf fi hukmi təriki-s-salət:58-ci səh, şeyximiz Abdullah bin İbrahim əz-Zəhim.

həmin məsələ Peyğəmbərdən (sallələllahu aleyhi və səlləm), səhabələrdən və tabiinlərdən bir çox yerdə izah edilmiş surətdə gəlmişdir.Lakin namazda varid olan küfr bir neçə səbəbdən böyük küfrdür:

*Birinci*: Mütləq şəkildə gələn küfr insanı İslamdan çıxaran böyük küfrdür.Bu səbəbdən mütləqlik ona yönəldilir.Digər yerlərdə küfr sözünün başqa şeyə aid edilməsi yalnız cümləyə daxil olan əlavə amillər səbəbilədir.Hər bir hədisin ayrılıqda məzmununa diqqət yetirən şəxs ona orada rast gələcək.Burada isə onu zahirindən döndərəcək heç bir şey yoxdur və qeyd edildiyi kimi burada hədis zahirinə uyğundur.

*İkinci:* Digər yerlərdə gələn küfr qeyri-müəyyənlikdə gəlir.Misal üçün “و قتاله كفر : və qitəluhu kufr, savaşmaq isə küfrdür”, habelə “هما بهم كفر : humə bihim kufr, iki xislət küfdür”, habelə “كفر بالله : kufrun billəhi, Allaha küfrdür” və buna bənzər sözlər.Burada isə küfr sözü “əlif və ləm” hərfləri ilə müəyyənliyi ifadə edən surətdə varid olmuşdur “ليس بين العبد و بين الكفر أو قال الشرك : Leysə beynəl abdi və beynə əl-kufri əv qalə əş-şirki, Qul ilə küfr yaxud şirk arasında...”. Burada müəyyənlikdə qeyd edilən “küfr” sözü məlum küfrə, İslamdan çıxaran küfrə yönəlir.

*Üçüncü*: Bəzi hədislərdə bu ləfz varid olmuşdur: “Artıq İslamdan çıxmışdır”.Digər bir rəvayətdə isə “Onunla iman arasında”sözü qeyd olunmuşdur.Bir rəvayətdə də “Onunla küfr arasında” gəlmişdir.Bütün bunlar onu göstərir ki, namaz, insanı onu yerinə yetirəcəyi halda imana salacaq,

onu tərk edəcəyi halda isə, onu oradan çıxaracaq bir çərçivədir.

*Dördüncü:* Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Qul ilə küfr arasında yalnız namazın tərki durur". Həmçinin: "Peyğəmbərin səhabələri namazdan savayı əməllərdən heç bir şeyin tərkini küfr hesab etməzdilər". Həmin sözlərdən onun yalnız böyük küfr[708]olması anlamı çıxır.Çünki onunla başqa şey arasında küfr adlanan bir çox şeylər var.Ancaq: İnsan namazdan başqa şeylər üzündən İslamdan çıxa bilər,-sözləri deyilməz.Çünki biz deyirik: Bu, fərz əməllərdən olan şeylərə dair qeyd edilən məsələdir. Ümumilik baxımından isə onun tərki küfrü vacib edir. Bundan başqa olan etiqadı məsələlər isə ümumiyyətlə zahiri əməllərdən deyil.

*Beşinci*: Bu sözlər ümimilikdə namazın xüsusiliyini və onun qeyrisindən üstün olmasının bəyan edilməsini üzə çıxarır.Çünki əgər bu küfr fasiqlik olsaydı, belə olan halda bütün başqa fərz əməllər ona bu işdə müştərək olardı.

*Altıncı*: Peyğəmbər (salləllahu aleyhi və səlləm) onun dinin axırı olduğunu bəyan etmişdir.Onun axırı gedəcəyi zaman isə onun hamısı gedəcək.

---

[708] Dedim: Bir çox müxaliflərin əsaslandığı kimi səhabələrdən bu məsələyə dair nəql edilən icmanın kiçik küfrə aid edilməsi Şeyxul-İslamın bəyan etdiyi kimi yanlış yanaşmadır.Habelə burada, həmin icmanı nəlq edən İshaq bin Rahuyə, Muhamməd bin Nəsr əl-Mərvəzi kimi ümmətin sələfinin və onlardan sonra gələn Munziri, ibn Hazm, Şeyxul-İslam, İbnul Qayyim, daha sonra Muhamməd bin İbrahim, ibn Bəz, ibn Useymin və az öncə qeyd etdiklərimiz şəxslərin anlamına müxaliflik vardır.

*Yeddinci*: Peyğəmbər (salləllahu aleyhi və səlləm) namazın bizimlə kafirlər arasında olan əhd olduğunu bəyan etmişdir. Onlar isə İslam ümmətindən kənar olub ona daxil deyillər. Bu isə, onu yerinə yetirənin dinə girəcəyi kimi eynilə həmin əhdi tərk edənin kafir olacağını gərəkli edir..Bu, yalnız İslamdan çıxaran böyük küfrün xüsusiyyətidir.

*Səkkizinci*: Ömərin: "Namazı tərk edənin İslamda heç bir payı yoxdur,-deməsi, onun İslamdan çıxdığını ifadə edən ən aydın sözdür. Habelə bu, ibn Məsud və başqalarının sözü. Bununla bərabər o, bəyan etmişdir ki, onu vaxtından geciktirmək deyil, namazı bütövlüklə tərk etmək küfrdür.Bu isə, insanı İslamdan çıxaran əməllərdə olur.

*Doqquzuncu*: Muazın[709]öncə qeyd edilən hədisində, dayaqsız qurulan çadırın ayaq tutmayacağı qeyd edilmişdir. Həmçinin namazsız din ayaq tutmaz".

Bu sözlər, hədislərin namazı danaraq tərk edən insana aid edildiyini iddia edənlərin sözlərini puc edir.

Habelə "namazdan savayı əməllərdən heç bir şeyin tərkini küfr hesab etməzdilər" və "qul ilə küfr arasında" kimi sözlər və digər sözlər namazın bu məsələdə xüsusi vurğulandığını vacib edir.Çünki danaraq tərk edilən əməllərdə namaz ilə başqa fərzlər arasında heç bir fərq yoxdur.Çünki danma tərk olmasa belə özlüyündə küfrdür və əgər insan bir şeyi yerinə yetirdiyi halda onu danarsa etdikləri ona fayda

---

[709] Muaz (r.a) Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə dediyini rəvayət etmişdir: "İşin başlığı İslam, dirəyi namaz ən uca zirvəsi isə cihaddır."

verməz.Belə olan halda, həmin hökmün qeyd edilməyən bir şey ilə əlaqələndirilməsi nə dərəcədə doğrudur?

Həmçinin qeyd edilən tərk etmədir.O isə onu danaraq yaxud tənbəllik edərək tərk edən üçün ümumi gəlmişdir. Həmçinin bu, heç bir əsas olmadan sözün gerçəyindən kənar çıxmaqdır. Buna görə ona heç bir əhəmiyyət verilməmə-lidir."[710]

*İkinci bildiriş*: Bəzi müxalif insanların geniş istifadə etdikləri sözlərdən biri də budur: Namazı tərk edəni təkfir etməyən imamlara adı çəkilən icmanın qaranlıq qalması necə ola bilər?

Onlara cavab olaraq deyiləcək: Səhabələrin icması sabit olduğu zaman bu, onlardan sonra gələnlər üçün hüccət olur.Onlardan sonra gələn alimlərin sözlərini sübut yox onların sözlərinə sübut gətirmək lazımdır.Üzr mövzusu isə geniş bir məsələdir.Güman olunur ki, həmin icmaya müxalif çıxan şəxslərə həmin icma gəlib çatmamış yaxud da onlar onu bir növ başqa cür yozmuşlar.Bu məsələyə bənzər bir neçə məsələ mövcuddur. Həmin məsələlərdən bir qismi:

1-Bir sıra şəxslər övladların anaları (söhbət kənizlərdən gedir) ilə alqı-satqı aparmağın yasaq olduğuna dair səhabələrin icmasını nəql etmişlər.Bu məsələyə isə müxalif olanlar tapılmışdır.[711]

---

[710] Şərhul umdə: 2/81.

[711] San`ani "subul əs-sələm:2/14" kitabında dedi: "Son əsrlərin bir sıra şəxsləri onu satmağın yasaq olduğuna dair icma iddia etmişlər.Hafiz ibn Kəsir bu məsələyə dair müstəqil bir bəhs ayıraraq demişdir: Məndə imam Şafiidən bu məsələyə dair dörd görüş yığılmışdır.Msələnin mahiyyəti etibarı ilə isə o, səkkiz

İbn Qudəmə (rahiməhullah) demişdir: "Çünki buna səhabələrin icması vardır.Buna dəlil Əlinin (r.a) bu sözüdür: "Mən və Ömər, övladların analarının satılmayacağı görüşündə olmuşuq. "Həmçinin demişdir: "Ömrünün sonuna qədər Ömər və Osman (r.a) bu görüşdə olmuşlar." Ubeydə demişdir: "Camaatın içində Əli və Ömərin (r.a) görüşü onların fərdi görüşlərindən bizə daha sevimlidir."İkrimə ibn Abbasdan (r.a) rəvayət edib demişdir: "Ömər (r.a) dedi: "Öz cariyəsi ilə cinsi əlaqədə olduğunu etiraf edən daha sonra ölən kişinin cariyəsini, düşük olarsa belə doğulacağı zaman dünyaya gələn uşaq azad etmiş olacaq.

Əgər: Əli, ibn Abbas və ibn Zubeyrin (r.a) buna müxalif olması ilə bərabər icma iddiası nə dərəcədə doğrudur?-deyilərsə, cavab olaraq deyiləcək ki, artıq onların öz müxalif mövqelərindən qayıtmaları rəvayət edilmişdir.Ubeydə rəvayət edib demişdir: "Əli mənə və Şureyhə xəbər yollayıb: Verdiyiniz hökmü verin, çünki mən ixtilafdan xoşlanmıram, -deyə buyurmuşdur. Həmçinin ibn Abbas (r.a) demişdir: "Qadının övladı onun mislindədir.O isə, Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) və Ömərdən (r.a) onların azad ediləcəyinə dair hədisin ravisidir.Bu, onun onlara müvafiq gəldiyini göstərir. Həmçinin onların fikirayrılğına düşmələrindən öncə, onların yekdilliyi ilə icma sabit olmuşdur.Onların yekdilliyi isə xətanı istisna edir.Çünki ümmət zəlalət üzərə toplanmaz.Habelə hər zaman hüccət sahibi mövcud olacaq.Əgər bu bəzi dövrlərdə caiz olursa

---

görüşdən ibarətdir. Nasir, imamilər və Davud onu satmağın caiz olduğunu demişlər."

onun bütün vaxtlarda həmçinin caiz olması istisna edilmir.Yekdillik zamanına təsadüf edən müvafiq görüş sonraki ixtilafda olan görüşdən daha xeyirlidir.Bununla da, varid olan yekdillik, digərlərinin əleyhinə hüccət olduğu kimi onlardan ona müxalif olanın əleyhinə hüccət olacaq.

Deyilərsə ki: Əgər bəzi dövrlərdə yekdillik, müxalifliyi haram edən icma olsa idi haram işlərə nisbət edilməsi caiz olmayan həmin bu imamların buna müxalif çıxması nə dərəcədə doğru olardı? Buna cavab olaraq deyirik: İcma qəti və zənni icmaya bölünür.Bu isə zənni icmadır.Onun hüccət olması ilə birgə onların ona müxalif çıxmaları baş verə biləcək mümkün bir haldır.Lakin o, onların müxalif çıxması ilə hüccət çərçivəsindən çıxmır.Burada da, məhz bu cür-dür."[712]

Burada həmçinin deyiləcək: Hər hansı bir zamanın hüccət sahibindən məhrum qalması caiz deyil.Belə olan halda, bu icmaya müxalif ola biləcək, heç olmasa bir səhabədən belə nəql edilən rəvayət haradarır?

2-Həmçinin səhabələr icma etmişlər ki, əgər bir "zimmi" (İslam diyarında yaşayan kitab əhli) Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söyərsə onun müsəlmanlarla olan əhdi pozulacaq. Daha sonar isə bəzi fəqihlər bu məsələdə müxalif olmuşlar.[713] Şeyxul-İslam buna dair demişdir: "Zimmi, Allahı yaxud Quranı yaxud dini yaxud Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söyəcəyi yaxud onun və ya müsəlmanın

---

[712] əl-Muğni:10/414.

[713] Hənəfilər kimi.Habelə Şafiilərin bir görüşüdür.(təbyinul haqaiq:3/281.Muğnil muhtəc:6/83.əl-Muğni:9/283.əl-Məusuatul fiqhiyyətul kuveytiyyə:7/138.

öldürülməsini vacib görəcəyi zaman onun əhdinin pozulacağına Quran, sunnə, səhabələrin və tabiinlərin icması və qiyas dəlalət edəcək."[714]

Nəhayət demişdir: "Səhabələrin icmasının olmasına əsas isə bunun onlardan geniş yayılmış və çoxsaylı məsələlərdə nəql edilməsi və onlardan heç birinin bunu inkar etməməsidir. Bununla, həmin məsələ icmaya çevrilmişdir.Bil ki, bu yoldan daha dolğun yol vasitəsilə şaxəli (fər`i) məsələyə dair səhabələrin icmasını iddia etmək mümkün deyil."[715]

3-Həmçinin qadının kişiyə, onunla birgə digər qadın almayacağına, cariyə götürməyəcəyinə və onu evindən yaxud yaşadığı diyardan çıxarmayacağına dair şərt qoyması.Artıq ibnul-Qayyim bu şərtin gərəkli olduğuna dair səhabələrdən icma hekayət etmişdir.Onlardan sonra gələn bəzi imamlar isə onlara müxalif olmuşlar.

İbnul-Qayyim (rahiməhullah) demişdir: "Kişi qadınla onu evindən yaxud diyarından çıxartmamaq yaxud onunla bərabər başqa qadın almamaq və cariyə götürməmək şərti ilə evlənəcəyi zaman nigah səhih, şərt isə gərəkli olacaq.Bu, səhabələrin icmasıdır. Bu, Ömər, Səid və Muaviyədən sabit olmuşdur.Səhabələrdən heç biri isə buna müxalif çıxmamışdır.Bütün tabiinlər bu görüşdə olmuşlar. İmam Əhməd həmçinin bu görüşü seçmişdir. Üç imam isə bu məsələdə

---

[714] əs-Sarimul məslul:2/32.

[715] Öncəki mənbə:2/378.

müxalif çıxıb şərtin batil olduğunu və onu yerinə yetirməyin vacib olmadığını qeyd etmişlər."[716]

4-Yeyilən ətin sidiyi və peyininin pak olmasına dair qədim icmanın olması.Bu məsələdə Əbu Hanifə və Şafii müxalif olmuşlar.[717]Şeyxul-İslam (rahiməhullah) demişdir: "Həmçinin Malikin və Mədinə əhlinin aşkar nəcasətlərə dair ibadətlərdə məzhəbi səhih hədislərdə və səhabələrin görüşlərində gələnə çox bənzəyir.Habelə onlar əti yeyilən heyvanların sidik və peyininin murdar olduğunu demirlər. Bu məsələyə dair nass, qədim icma və qiyas kimi bir neçə dəlil vardır.Biz onları digər yerlərdə qeyd etmişik.Murdar edən maddə, əslində ümumi olmayan ümumilik zənni yaradan sözlə yaxud şaxənin özəy ilə bərabər olması zənni yaradan qiyas ilə gəlmişdir.Əslində isə heç də belə deyil."[718]

Habelə demişdir: "Əti yeyilən heyvanın sidiyi və peyini pakdır.Səhabələrdən heç biri onun murdar olduğunu deməmişdir.Onun murdar olduğunu deyən görüş yenidir və səhabələrdən bunu deyən olmamışdır."[719]

5,6,7-Səhabələrin kitab əhlinin kəsdiyi ətin və onların qadınlarının halal olmasına, habelə onlardan cizyə almağın caiz olmasına dair qədim icması vardır.Onarın valideyin-lərinin yaxud onlardan birinin Quranın nazil olmasından

---

[716] İğasətu-l-ləhfən:2/25.
[717]əl-Məbsut:1/54.əl-Məcmu`:2/567.
[718] Məmu`əl-fətəva:20/239.
[719] əl-Fətəva əl-kubra:5/313.

öncə yaxud sonra dinə daxil olması eynidir.İmam Şafii isə bu məsələdə müxalif olmuşdur."[720]

İmam Muhamməd bin Hüseyn ət-Təmimi əl-Cəuhari (rahiməhullah, hic.350-ci ildə v.e) demişdir: "Valideyinlərindən hər hansı birinin Quranın nazil olmasından öncə yaxud sonra öz dininə mənsub olmasından asılı olmayaraq onlar kitab əhlindən olan şəxsin kəsdiyi ətin müsəlmana halal olduğuna icma etmişlər.İmam Şafii isə bu məsələdə müxalif olmuşdur.

---

[720] Şafii bu məsələni "əl-Umm" kitabının bir neçə yerində qeyd etmişdir.Belə ki, yerlərin birində demişdir: "Uca Allah İsrail oğulların əta etdiyi nemətini və onların dönəmində yaşamış digər şəxslərə vermədiyini onlara verdiyini kitabının bir sıra yerində qeyd etmişdir.İslamdan öncə İsrail oğullarının dinində olub İsrail oğullarından olmayanlar, sözün əsil mənasında İsrail oğullarına daxil olmadığı üçün evlilik üçün yararsız olmuşlar.Çünki həmin şəxslərə kitab əhli adı şamil olunmur. Çünki onların ataları kitab əhli olmamış və nəsəb baxımındab İsraıl oğullarından olmamışlar.Onlar mütləq şəkildə kitab əhli deyil sadəcə məna baxımından kitab əhli olmuşlar.Bu səbəbdən,-Doğrusunu Uca Allah bilir-İsrail oğullarından olmayan yəhudi və nəsranilərin dininə mənsub olan ərəb və əcəmlərin qadınları ilə evlənmək caiz olmamışdır.İsrail oğullarından olub yəhudi və nəsrani dininə mənsub olan şəxslərin qadınları ilə evlənmək və onların kəsdikləri əti yemək isə caiz olmuşdur. Arvad olaraq alınması caiz olanlardan biri əsir alındınqda isə onunla cariyə olaraq yaxınlıq etmək olar.İsrail oğullarının dininə mənsub olan qeyrilərinin qadınlarını isə alınmaz, onların kəsdiyi əti yeyilməz və onlarla cariyə olaraq yaxınlıq edilməz." (əl-Umm:4/193) Habelə demişdir: "Özü və əcdadları yaxud əcdadlarından biri olmasa belə özü kitab əhlinin dininə, Quran nazil olmamışdan öncəki kitaba mənsub olub Quran nazil olmamışdan öncə bütbərəstlərin dininə müxalif olarsa, həmin şəxs bütbərəstlərin sırasından çıxmış olar. İmamın isə öz növbəsində ondan, ərəb olsun yaxud əcəm fərq etməz, cizyəni alçaq olaraq verdiyi halda qəbul etməsi gərəkdir. İslam gəldikdən sonra ərəb yaxud əcəmlərdən hər hansı biri kitab əhlinin dininə mənsub olmadığı halda ondan cizyənin alınmasını və dinində rahat buraxılmasını istəyərsə yaxud kitab əhlinin dininə daxil olarsa imam ondan cizyə almalı deyil. Üstəlik imam, İslama girməyincə bütpərəstlərə qarşı savaşmalı olduğu kimi İslama girməyənə qədər onlara qarşı savaşması gərəkdir." (əl-Umm:4/184) Habelə demişdir: "Əsas olaraq götürdüyüm görüş, cizyənin yalnız Quran nazil olmamışdan öncə əcdadlarının kitab əhlinin dinində olub kitab əhlinin dininə mənsub olan şəxsdən alınmasıdır. (ə-Muzənidən nəql etmişdir. (əl-Umm:8/387.əl-Məcmu`:9/84.Fətəva-r-Ramli:4/63)

İmam həmin şəxslərin yaxud atalarından hər hansı birinin Quranın nazil olmasından öncə həmin dinə mənsub olacağı təqdirdə onların kəsdiyi ətin yeyilməsinə icazə vermişdir. Onlardan yaxud atalarından birinin Quranın nazil edilməsindən sonra həmin dinə girəcəyi təqdirdə isə müsəlmanın onların kəsdiyi əti yeməsi caiz deyil."[721]

Həmçinin demişdir: "Habelə onlar, Quranın nazil olmasından sonra həmin dinə mənsub olacağı halda belə hər kitab əhlindən olan şəxsin üzərində cizyənin olduğuna icma etmişlər. Şafii isə müxalif olub demişdir: "İnsan yaxud onun atalarından biri yalnız Quranın nazil olandan öncə həmin dinə mənsub olacağı təqdirdə cizyə verməlidir."[722]

Əbu Bəkr əl-Cəssas demişdir: "Bir sıra sələf alimlərindən, ərəblərdən olan kitab əhlinə dair söz rəvayət edilmiş və Quranın enməsindən öncə yaxud sonra həmin dinə mənsub olanlar arasında heç bir fərq qoyulmamışdır.Habelə biz sələf və sonrakilərdən hər hansı bir şəxsin, Şafiinin bu məsələyə dair irəli sürdüyü görüşü irəli sürdüyünü bilmirik.O, bu sözdə tək olub bu məsələyə dair elm əhlinin görüşündən kənar çıxmışdır."[723]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Bu, bir əsasın üzərinə qurulan məsələdir.Uca Allah buyurur: *"Kitab verilənlərin yeməkləri sizə halal, sizin yeməkləriniz də onlara halaldır. İsmətli mömin qadınlar da, sizdən əvvəl Kitab verilənlərin ismətli qadınları da, namuslu olub zinakarlıq*

[721] Nəvadirul fuqahə:75-ci səh.
[722] Öncəki mənbə:179.
[723] Əhkəmul Quran:2/457.

*etməmək və aşna saxlamamaq şərti ilə mehrlərini verdiyiniz təqdirdə sizə halaldır."*[724]Burada qəsd edilən, Quran nazil olandan sonra kitab əhlinin dininə mənsub olan şəxsdir yoxsa nəsx və dəyişiklikdən öncə ata-anası kitab əhlinin dinində olan şəxsdir?Alimlərin bu məsələyə dair iki görüşü vardır.Birinci görüş, sələf və sonraki alimlərdən olan cumhur müsəlmanların görüşüdür.Habelə bu, Əbu Hanifə və Malikin məzhəbi və Əhmədin məzhəbində varid olan görüşlərdən biridir.Üstəlik bu məsələ imam Əhməddən açıq qeyd edilir.İkinci görüş: İmam Şafii və Əhmədin əshabından olan bir tayfa insanın görüşüdür."

Nəhayət demişdir: "Əhməd isə yalnız səhabələrin çəkişdiyi Bənu Təğlibə dair ictihadında müxalif olmuşdur. Ancaq Tənux, Bəhra və digət yəhudilər mislində olan yəhudi və nəsranilərdən olan ərəblərə gəldikdə isə, Əhməddən, habelə səhabələrdən, tabiinlərdən və digər sələf alimlərindən onların kəsdikləri ətin halal olmasına dair ixtilafın nəql edildiyini bilmirəm.Onların arasında ixtilaf yalnız xüsusi olaraq Bənu Təğlibə dair olmuşdur."

Daha sonra demişdir: "Qəti bilinən doğru görüş, insanın kitab əhlindən yaxud qeyri kitab əhlindən olması, nəsəb yönündən deyil özlüyündə müstəqil şəkildə çıxarılan hökmdür.Belə ki, kitab əhlinin dinini etiqad edən hər bir şəxs onlardan biridir və onun atasının yaxud babasının onların dininə girib girməməsi, habelə onun nəxs və dəyişdirmədən öncə yaxud sonra həmin dinə girməsi həqiqəti dəyişmir.Bu, Əbu Hanifə və Malik kimi cumhur

---

[724] əl-Maidə:5.

alimlərin məzhəbidir. Əshabı arasında məşhur ixtilafın olmasına rağmən imam Əhməddən gələn açıq-aydın sözlər həmçinin bu görüşü dəstəkləyir.Habelə bu görüş, səhabələrdən sabit olmuşdur. Səhabələrdən buna dair ixtilafın varid olduğunu isə bilmirəm. Tahavi bunun qədim icma olduğunu qeyd etmişdir."[725]

7-Tilavət səcdəsinin vacib olmadığına dair səhabələrin icması.Hənəfilər isə bu məsələdə müxalif olmuşlar.İbn Qudəmə (rahiməhullah) demişdir: "Bir sözlə tilavət səcdəsi bizim imama, habelə Malik, Əuzai, Leys və Şafiiyə görə vacib deyil və sadəcə müəkkəd sunnədir.Həmçinin bu, Ömərin və oğlu Abdullahın görüşüdür.Lakin Əbu Hanifə və onun əshabı bunu vacib etmişlər.Onların dəlili Uca Allahın bu ayəsidir: *"Onlara nə olub ki, iman gətirmirlər və onlara Quran oxunduqda səcdə etmirlər?"*[726]İnsan yalnız vacibi tərk etdiyinə görə pislənir. Habelə o, namazda edilən səcdədir.Bu səbəbdən o, namaz səcdəsi kimi vacib olmuşdur.

Bizim Zeyd bin Sabitdən (r.a) rəvayət edilən dəlilimiz vardır. O, demişdir: "Mən Peyğəmbərə (salləllahu aleyhi və səlləm) "ən-Nəcm" surəsini oxuduğum zaman bizdən heç kim səcdə etmədi." Buxari və Muslim rəvayət etmişlər.[727] Habelə bu, səhabələrin icmasıdır.Buxari və əl-Əsrəm Ömərdən (r.a) rəvayət edirlər ki, o, cümə günü minbərin üzərində "ən-Nəhl" surəsini oxudu.Nəhayət səcdə yerinə çatdıqda minbərdən düşdü və səcdə etdi.İnsanlar onun ardınca səcdə

---

[725] Məcmu`əl-fətəva:35/219-224.Şeyx cumhurun məzhəbini dəstəkləmək üçün burada doqquz amil qeyd etmişdir.
[726] əl-İnşiqaq:20-21.
[727] Buxari:1073.Muslim:577.

etdilər.Növbəti cümə olduqda o, həmin surəni yenidən oxudu. Nəhayət səcdə yerinə çatdıqda belə dedi: Ey insanlar! Biz səcdənin üzərindən keçəcəyik.Kim səcdə edərsə doğru etmiş olar.Kim səcdə etməzsə heç bir günah daşımaz.Ömər özü isə səcdə etmədi.Digər bir ləfzdə: Uca Allah bizə həmin səcdəni fərz etməmiş və onu öz istəyimizə buraxmışdır.əl-Əsrəmin rəvayətində: Dedi: Tələsməyin! Uca Allah bizə bunu fərz etməmiş və onu öz istəyimizə buraxmışdır.Sonra isə onu oxuyub səcdə etmədi və onlara səcdə etməyə mane oldu.Bütün bunlar səhabələrin böyük yığnağı önündə baş verdi. Səhabələrdən heç biri buna irad tutmamış və onlardan hər hansı birinin buna müxalif olması nəql edilməmişdir. Onların qiyasının əsassız olması səhv səcdəsi ilə bilinir. Çünki onlara görə səhv səcdəsi vacib deyil."[728]

9-Səhabələr vəqfi geri qaytarmağın yasaq olmasına dair icma etmişlər.Əbu Hanifə bu məsələdə müxalif olmuşdur. İbn Qudəmə (rahiməhullah) demişdir: "Əbu Hanifə vəqfin özlüyündə gərəkli olmadığı görüşünü irəli sürüb vəqf edənin onu geri qaytarmaq hüququna malik olduğunu demişdir.İstisna hal isə, vəqfin vəqf edənin ölümündən sonra vəsiyyət edilməsidir.Belə olan halda o, gərəkli olur yaxud hakim onun gərəkli olduğuna dair hökm çıxarır. Bəziləri bunu Əli, ibn Məsud və ibn Abbasdan hekayət etmişlər.Onun iki əshabı isə ona müxalif çıxıb digər elm əhlinin sözünü demişlər.Onun sözü, Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) sabit olan sunnəyə, habelə səhabələrin icmasına müxalifdir.Belə ki, Peyğəmbər (salləllahu aleyhi və

[728] əl-Muğni:1/361.

səlləm) Ömərə etdiyi vəqfdə demişdir: "Onun özəyi satılmaz, alınmaz, bağışlanmaz və miras yolu ilə keçməz."[729] Tirmizi demişdir: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əshabı və digərlərindən olan elm əhli bu hədisə əsasən əməl etmişlər.Biz qədim alimlərdən hər hansı birinin buna dair ixtilaf etdiyini bilmirik."[730]

Buna bənzər digər qeyd edilə biləcək misallar çoxdur, lakin mən çox uzatmamaq məqsədilə onu burada qeyd etməyə lüzum görmədim.

## BİRİNCİ HİSSƏ BURADA BİTİR

[729] Buxari:2737.Muslim:1633.
[730] əl-Muğni:5/348.